*Bu əsər "**Nizami Gəncəvi**. Leyli və Məcnun" (Bakı, Yazıçı, 1982) kitabı əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərcümə edəni: **Səməd Vurğun**

İzahların müəllifi: **Mübariz Əlizadə**
*filologiya elmləri doktoru, professor*

Ön sözün müəllifi
Və elmi redaktor: **Xəlil Yusifli**
*filologiya elmləri doktoru, professor*

894.361'1-dc 21
AZE
**Nizami Gəncəvi. Leyli və Məcnun**. Bakı, "Lider nəşriyyat", 2004,
288 səh.

"Leyli və Məcnun" "Xəmsə"nin üçüncü poemasıdır. Nizami Gəncəvi bu qədim məhəbbət əfsanəsinə ustad qələmilə bəzək vurmuş, onu bədii yüksəkliyə qaldırmışdır. Şairin yaratdığı bu məhəbbət dastanı dünya ədəbiyyatı xəzinəsinin ən qiymətli incisinə çevrilmişdir.

**ISBN 9952-417-04-5**

© "LİDER NƏŞRİYYAT", 2004.

Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

# İNSAN DÜHASININ ƏLÇATMAZLIQ NÜMUNƏSİ

Böyük Azərbaycan şairi və mütəfəkkiri Nizami Gəncəvi dünya ədəbiyyatının nadir ədəbi simalarından biridir. Onun poeziyasında hər bir mövzu və hadisə mütəfəkkir şair qəlbindən keçərək, dərin ictimai və fəlsəfi məzmun almışdır. "Sirlər xəzinəsi", "Xosrov və Şirin" poemalarından sonra "Leyli və Məcnun" mövzusunda əsər yazan şair bu mövzudan istifadə edərək, insan və zaman, təbiət və cəmiyyət hadisələri ətrafında rəngarəng düşüncələrini əks etdirmişdir. Belə bir mövzuda əsər yazmağı ondan Şirvan şahı Axsitan xahiş etmişsə də, Nizami heç də ancaq dövrün şahlarını təmin edəcək əsər yaratmamış, daha çox öz narahat düşüncələrini qələmə almışdır.

Nizami Gəncəvi 1188-ci ildə dörd ay müddətinə yazıb başa çatdırdığı "Leyli və Məcnun" poemasını işləyərkən bu mövzu ətrafında ciddi axtarışlar aparmış, mənbələrlə tanış olmuşdur. Axsitan ondan bu "gəlini" fars və ərəb bəzəyi ilə bəzəməyi tələb edərkən də məhz Leyli və Məcnun mövzusu ilə əlaqədar farslar, ərəblər arasında geniş yayılan əfsanə və rəvayətləri nəzərdə tutmuşdur. Əfsanələr, rəvayətlər isə hər hansı bir hadisə, fakt əsasında yaradılmış bədii sözdür.

Nizami Axsitanı düzgün başa düşərək, mənbələri diqqətlə öyrənir. Öyrəndiklərini sədaqətlə ümumi poetik axına yönəldir, yeni qəlibə, yeni formaya salır. Şair "o farsdan doğulan əfsanə yaradan ərəbin halından belə xəbər verir" və başqa bu kimi qeydlərlə Axsitanın "ərəb və fars bəzəyi" tələbinə riayət etdiyini nəzərə çatdırır. Burada ərəblərə və farslara məxsus baxışlar, görüşlər, poetik zövq, şairanə deyimlər də nəzərə alına bilərdi. Nizaminin "fars və ərəb bəzəyi" anlayışını məhz göstərilən mənada anladığını onun poeması və ərəb mənbələrinin bu əfsanə ilə əlaqədar qeydlərinin müqayisəsi də təsdiq edir.

İbn Küteybə, Əbülfərəc İsfahani, Əl-Valibi kimi müəlliflərin əsərləri ilə Nizami poemasını müqayisə edən alimlər bu qənaətdədirlər ki, Nizami bu ölməz əsərini yazarkən həmin müəlliflərin əsərlərindən faydalanmışdır. Şair İran və Azərbaycanda da geniş yayılan əfsanələrdən bəhrələnməmiş deyildir. XI əsr Azərbaycan şairi Qətran Təbrizinin tez-tez sadiq, nakam sevgililər kimi Leyli və Məcnunu xatırlaması göstərir ki, Leyli və Məcnun haqqındakı əfsanə ədəbi dairələrdə

Nizami əsəri yazılandan çox-çox əvvəl məlum və məşhur imiş. Qətranın özünün də Məcnun haqqında ərəb mənbələrindən məlumat alması mümkündür. Onun bu məsələdə sərbəst hərəkət etməsi, oxucuya məlum, məşhur hadisə kimi Leyli və Məcnunu xatırlaması isə əfsanənin ərəb mənbələrindən əlavə ədəbi ictimaiyyət arasında da geniş yayıldığını təsdiq edir. XI əsr İran şair və nasiri Nasir Xosrov da bu əfsanənin maraqlı olduğunu qeyd edir, lakin onu daha çox bədəvi ərəblərin mühiti ilə əlaqələndirir, Taifdə Leylinin yaşadığı qəsrin xərabələrini göstərdiklərini, maraqlı hekayələr danışdıqlarını yazır.

Nizaminin poemasında mövzunun bəlli, məşhur olması dəqiq göstərilir. Onu Axsitan da, Nizaminin oğlu Məhəmməd də yaxşı bilir, anlayırlar. Axsitan Məcnunun böyük eşqini, bu mövzunun bütün sözlərin şahı olduğunu yazır. Şairin oğlu 14 yaşlı Məhəmmədin qeydi daha maraqlıdır. Onun fikrincə, "bu gözəl mövzuda böyük sənət var". Nizami özü isə onu "aləmə bəlli bir ayə" sayır, başqa sözlə, əfsanənin yazılı və şifahi şəkildə çox geniş yayıldığını etiraf edir. Nizami gah oğlu Məhəmmədin dililə, gah öz sözləri ilə bu məşhur əfsanənin bədii əsər kimi işlənmədiyini, çılpaq qaldığını da yazır:

Harda ki eşq əli bir süfrə açar,
Bu gözəl hekayə ona duz saçar.
Bu qədər nazəndə, incə bir dilbər,
Nədən çılpaq qalsın bu vaxta qədər?
Onu bəzəməmiş arif əlləri,
Odur ki, çılpaqdır o gözəl pəri.

Maraqlıdır ki, həm Axsitan, həm də şairin oğlu Məhəmməd bu mövzunu Nizaminin hünərinə layiq, ona məhrəm hesab edirlər. Belə çıxır ki, Axsitanın bu mövzuda Nizamidən əsər xahiş etməsi özü də Nizami yaradıcılığına bələd olmağından, dahi şairin ruhən bu mövzuya yaxınlığından irəli gəlir. Sözün sərrafı olan Axsitan Nizami irsi ilə "Leyli və Məcnun" mövzusu arasında yaxınlıq, doğmalıq hiss etdiyindən ondan məhz bu mövzuda əsər yazmağı istəyir. Anlaşılır ki, poema sifarişlə yazılsa da, onun məşhurluğu və məhz Nizami dühasına yaxınlığı belə bir əsərin meydana çıxmasına səbəb olmuşdur.

Nizaminin bu mövzunu işlərkən yerli folklor mənbələrdən başqa, yazılı qaynaqlardan da geniş istifadə etməsi əsər boyu özünü aydın hiss etdirir. Poemanı ərəb mənbələri ilə müqayisə etdikdə görürük ki,

Nizami Leyli və Məcnun haqqındakı xırda və pərakəndə, quru və bədii cəhətdən sönük olan müxtəlif rəvayətləri böyük ustalıqla birləşdirmiş, demək olar ki, heç nəyi atmamış, lakin sənətin sərt qanunu əsasında onu sistemə salıb, kədərli və əzəmətli bir söz abidəsi yaratmışdır. Böyük söz ustası mövzunun imkanlarından istifadə edərək həyat, insanlar, onların əxlaqı, rəftarı, əməlləri barədə narahat düşüncələrini qələmə almışdır.

Nizami insan və zaman probleminə, bu problemin ayrı-ayrı cəhətlərinə poemada dönə-dönə toxunur. Dahi şair doğru qeyd edir ki, insanda hələ nöqsanlar vardır. Bununla bərabər, o, insanı yaxşılığa, gözəlliyə səsləyir. Yaxşı sözü yaman sözdən üstün tutan şair zamanın eyiblərini də çəkinmədən romantik bir pafosla dilə gətirir.

Bir çox sifətlər var insanda hələ,
Almasan yaxşıdır onları dilə.
Pis sözü ağzına alınca insan,
Qarnında öldürsə yaxşıdır, inan.
Bu dünya dolanıb döndükcə ruzgar,
Qoy səndən yaxşı söz qalsın yadigar.

Nizaminin poeması bu həqiqəti sübut edir ki, zaman insana ziddir. Lakin insan zamana qalib gələcək. Qurbanlar, faciələr hesabına olsa da, insan dünyanı insaniləşdirəcək, zamanı dəyişdirəcək, zaman özü də dəyişəcəkdir. Həyatın və təbiətin öz dialektikası var; xərabə olan abad olacaq, pis olan yaxşılaşacaq.

Daim xaraba da olsa bir diyar,
Bil ki, abadlıqdan onda nişan var.
İstər xarab olsun, istərsə abad,
Daimi bünövrə qoymamış həyat.

Bu dialektik düşüncələr göstərir ki, Nizami insanın zaman üzərində qələbəsinə, indi ağa olanın sabah məhv olacağına, bu gün faciə qurbanı olanın sabah vüsala və sevincə yetişəcəyinə inanmışdır.

"Leyli və Məcnun" poeması insan və zaman mövzusu ətrafında şairin düşüncələrindən ibarət möhtəşəm bir poeziya ümmanıdır. Nizaminin "Leyli və Məcnun" poeması ancaq nakam bir eşq macərasının nəzmə çəkilməsi deyil, bəlkə daha çox bu mövzudan istifadə edərək

dünya və insan haqqında yaradılmış bədii- fəlsəfi bir əsərdir. İnsan düşünə bilər ki, bütün bu söhbətlərin "Leyli və Məcnun" mövzusu ilə nə əlaqəsi var. Ancaq şairin əsərini diqqətlə oxusaq, anlayarıq ki, bu rəngarəng düşüncələr birbaşa "Leyli və Məcnun" mövzusu ilə bağlıdır. Şair əsərin həm əvvəlində, həm də əsər boyu müxtəlif yerlərdə müxtəlif üsullarla həyat, dünya, dövrün insanları, onların amalları, səviyyələri, əməlləri haqqında söhbət açır, bu söhbətləri də mövzuya yad, kənar bilmir.

Ey varlıq nəqşinin naziri olan,
Qaldır əngəlləri idrak yolundan.
Boş təbli döyərək hay-haray salma,
Heç kəsin səsinə biganə qalma.
Bir toz görünsə də hər zərrə əgər,
Dünya pərdəsində o da iş görər.

İdrak yolundakı əngəllər deyilmi Leylinin, Məcnunun faciəsinin səbəbi? Dünya pərdəsində hər zərrənin bir iş gördüyünə biganəlik deyilmi bu faciəni törədən? Şair bu fikirdədir ki, qəflət, nadanlıq, biganəlik, insanın öz vəzifəsini bilməməsi onun həyatını zəhərləyir, onu düzgün hərəkət etməyə qoymur. Nizamiyə görə, insan dünyaya dünyanın mahiyyətini anlamaq, öyrənmək üçün gəlmişdir.

Qısa söz; dünyada nə sən, nə də mən
Oyuncaq deyilik xilqətimizdən.
Nə şəhvət, nə yuxu, nə də ki yemek
Həyatın mənası olmasın gərək.
Yatmağı, yeməyi bu aləmdə sən
Eşşək, öküzdə də görə bilərsən.
Təbiət quranda xilqətimizi,
Başqa səhifədə yazmışdır bizi.

Nizami insandan ayıq olmağı, öz insanlıq vəzifəsini yaxşı başa düşməyi, yerlərin, göylərin sirlərini öyrənməyi tələb edir; İnsan dünyaya nə üçün gəlmişdir? Onun burada vəzifəsi nədən ibarətdir? Peyğəmbərə müraciətlə deyilən aşağıdakı iki misra bəlkə də poemada qaldırılan mətləblərin ana xəttini təşkil edir:

Biz kimik, neçiyik, aç göstər artıq,
Büt qayıranmıyıq, büt qıranmıyıq.

Allaha yalvarışlarında da şair dünya və insan haqqındakı düşüncələrindən ayrıla bilmir. Dövründən, bü dövrün mətləblərindən danışan zaman alov püskürür.

İlahi, dar gündə sən ol həmdəmim,
İstədiyin yerə çatsın qədəmim,
Söylə nə vaxtadək bir tikə üçün
Şaha və gədaya yalvarım hər gün...
Vəfasız yaranmış bütün qapılar,
Bir sənin qapında vəfa tapılar.

Bu sətirlər təkcə Allaha məhəbbətin ifadəsi deyil, həmçinin də şairin dövrü, onu əhatə edən mühit, insanlar haqqında narazılıq dolu narahat düşüncələridir.. Məcnunu, Leylini, onları əhatə edən adamları da bədbəxt edən, kədər və göz yaşları ilə üzləşdirən məhz həmin mühit və insanlardır. Həyat elə qurulmuşdur ki, insanların içi dərdlə, kədərlə doludur. Burda isə həm də bir ixtiyarsızlıq vardır. Məcnunun atasına verdiyi cavablardan aşağıdakı misralara diqqət edək:

Daşları əridər çəkdiyim kədər,
Kim öz ürəyinə sıxıntı istər?!.
Məni pis taleyim təqib edir, bil,
Heç kəs bədbəxtlikdən qurtaran deyil.

Yaxud:

Məzlum mən deyiləm yalnız bu yerdə,
Yüzləri düşmüşdür mən düşən dərdə.
Filin vücudundan milçəyə qədər,
Bu zülmü çəkməyən varmıdır məgər?

"Leyli və Məcnun" poemasında Nizami əsərdəki hadisələrlə bağlı iki müstəqil hekayə də vermişdir ki, bu hekayələr poemanın əsas ideyası ilə birbaşa bağlıdır. Bunlardan ən məşhuru "İt saxlayan padşah" hekayəsidir. Çox vaxt bu hekayə əsərin əsas mövzusu ilə o qədər də bağlı olmayan bir əlavə kimi şərh olunur. Əslində isə həmin hekayə əsərin ideyası ilə birbaşa əlaqəlidir və ancaq dövrün şahlarının zülmkarlığını tənqid etmək üçün qələmə alınmış bir hekayə deyil; on il şaha sədaqətlə xidmət eləyən, ancaq sonra şah tərəfindən quduz və yırtıcı itlərə atdırı

lan gənc əslində Məcnundur. Çöldə Məcnunla dost olan, ona toxunmayan, əksinə, onu qoruyan vəhşilər isə həmin quduz itlərdir.

Nizami bu fikirdədir ki, mövcud cəmiyyət, onun insanları həmin yırtıcı itlər saxlayan və xoşu gəlməyən adamları o itlərə atıb parçaladan padşaha bənzəyir, nəinki bənzəyir, elə onun özüdür. Bu baxımdan hekayənin sonunda Nizaminin dediyi aşağıdakı sözlər təsadüfi deyildir:

Bunu söyləməkdə bir məqsədim var,
Səxavət qələdir, o, can qoruyar.
Məcnun bəslədikcə o heyvanları,
Çəkdi dövrəsinə bir can hasarı.
Hasar ətrafında gəzən hər heyvan
Məcnunun işinə yaradı hər an.
Məcnuna bənzəsən insanlıqda sən,
Dünyada nə qüssə, nə qəm çəkərsən.

Nizaminin təsvirində zülmkar şahın yırtıcı itlərə atdığı gəncə nisbətən Məcnun daha yüksək insani sifətlərə malik olduğu kimi onu dəli, Məcnun adlandırıb çöllərə salan, məhvinə səbəb olan cəmiyyət də həmin zalım padşahdan daha zalım, daha eybəcərdir. Quduz itlər saxlayan padşah tərəfindən itlərə atılan gənc şahın xasiyyətini bildiyinə görə itlərə baxanla dost olur, çünki şahın bir gün onu da itlərə atacağına şübhə eləmir.

Ancaq Məcnunun heyvanlara qayğı göstərməsində, onlara yem verməsində, ya da ahu və maralı ovçuların torundan xilas etməsində heç bir təmənna və məqsəd yoxdur. Onun bu hərəkətləri böyük sevginin, insanlığın təzahürüdür. Nofəlin Leylini almaq üçün apardığı müharibə uğursuzluqla qurtarandan sonra yenə çöllərə üz tutan Məcnun ovçuların toruna düşən ahu və maralı azad eləyir, onlarla dərdləşir:

Ata öz oğlunu əzizləyən tək
Məcnun da maralı əzizləyərək,
Tutub sığalladı o dildarını,
Bağladı heyvanın yaralarını...
Dedi: "Həsrət çəkən dağlar maralı,
Sən də mi yarından düşdün aralı?
Ey çöl qoşununun gözəl sarbanı,
Dağlar döşündəki çadırın hanı?
Xoş ətrin canandan gətirir xəbər,
Gözün sevgilimin gözünə bənzər.

Nizami Məcnundakı insanlığın, idrakın, sevginin nə qədər güclü, fədakar, təmənnasız olduğunu, onun "idrak yolundakı əngəlləri" necə qətiyyət və cəsarətlə qaldırıb kənara atdığını öz ecazkar sənətinin əlvan boyalarıyla açıb göstərir.

Orta əsrlər şəraitində qadınların oyanması, insanlığını dərk etməsi və faciəsi Leyli surətində əks etdirilmişdir. Məcnun kimi sevən, yanan, duyan, onun kimi şəhid olan Leyli Məcnunun qadın tayıdır. Leylinin də faciəsi köhnəliyin öz yerini yeniliyə könüllü vermək istəməməsi üzündən, onun yeniliyə qarşı qəddar və amansız olmasından yaranır. Orta əsr feodalının mütləq hakimiyyətinin hələ güclü olduğu, lakin sarsılmağa başladığı bir dövrdə Leylinin faciəsi təbii idi. Zaman onun insanlığını, hisslərini, mənəvi sərbəstliyini hələ qəbul etmir, bu barədə eşitmək belə istəmirdi: hələ ona əşya kimi baxır, onu bazara çıxarır, kim çox qızıl versə, ona da satırdı. Zaman belə qanun qoymuşdu ki, qadının düşünməyə, duymağa, sevməyə, seçməyə ixtiyarı yoxdur, əgər o, müstəqil düşüncəyə malik olsa, namussuz hesab edilər, başı kəsilib itə atılardı, ancaq qanundan kənar istəyinə çatmağa imkan verilməzdi. O, əbədi dustaq - əbədi zindanda kədər və göz yaşları içində boğulan, dərdlərindən danışmağa, hisslərini söyləməyə ixtiyarı olmayan bir kölə idi. Leyli zahirən zəmanəsinin tələblərinə baş əyən, əslində isə ona məğrur bir sükutla meydan oxuyan, onun istədiyi, dediyi kimi olmayan, şərrin zülmət gecəsində günəş kimi parlayan, içində insanlığın əbədi məşəlini gəzdirən bir insan kimi yaşayır. Hamıdan, hər kəsdən eşqini gizlətməyə çalışan Leyli hisslərin güclü tufanını özündən gizlətməyə, onu tamam susdurmağa, öldürməyə qadir deyildi və bunu Leyli özü də istəmirdi. Leyli istəmirdi ki, kölə vəziyyəti ilə barışan başqa qadınlar kimi olsun, düşmən dünyanın oyuncağına çevrilsin. O, zahirən belə yolla getsə də, həqiqətdə əsrinin qadınlarından seçilir.

Əgər Məcnun mühitlə barışmadığını bildirərək çöllərə düşür, heyvanlar arasında yaşayırsa, düşməndən Məcnun, divanə adı almaqdan çəkinmirsə, Leyli də İbn Səlama həqiqi arvad olmamaqla, öz eşqinə sədaqətini qorumaqla özünü təsdiq edir. Poemanın ilk səhifələrindən başlamış ölümünə qədər Leyli sonsuz bir həsrətlə Məcnunu axtarır, onu görmək, onun şeirlərini eşitmək istəyir. Dərya-dərya qəmli göz yaşları tökən Leylinin daim gözü yollarda, qulağı səsdədir. Dam üstə çıxıb oğrun-oğrun yollara baxması, düşmən tənəsindən qorxub gecələr odlu ahlar çəkməsi, şam kimi yanması, acı-acı ağlaması,

tüstüsüz ocaq kimi alovlanması onun məhəbbətinin güclü olmasından xəbər verir. Məcnunla bərabər Leylinin də adı dillərə düşür, bazardan gələn uşaqlar belə Leyli ilə Məcnunun məhəbbət qəzəllərini oxuyur, onların şeirlərini bir-birinə çatdırırlar.

Leyli şeir yazmaqda, odlu, səmimi duyğularını sənətkarlıqla ifadə etməkdə də Məcnundan geri qalmır. Leyli Məcnunu ölənə qədər bir an belə unutmur. Yaz vaxtı qızlarla gəzməyə çıxan Leyli bir küncə çəkilib Məcnun üçün göz yaşı tökür. Leyli Məcnuna nisbətən eşqini dəlicəsinə, coşğun büruzə vermir, o bəzən özünü Məcnundan daha artıq Məcnun adlandırsa, qadın olduğunu da etiraf edir. O, dərdlərini ürəkdə çəkməyi, zahirdə isə özünü başqa qadınlar kimi aparmağı bacarır.

Məcnun başqa qızla evlənmək təklifini qəbul eləmir, bu təklifi edənlərə acığı, qəzəbi tutur. Lakin Leyli belə deyil. O özünü o dərəcədə toxtaq, təmkinli aparır ki, başqasını sevdiyini ata-anasına demir, onu İbn Səlama ərə verəndə etiraz etmir. Leylinin arxasınca bir çox adamlar düşüb var-dövlət hesabına onu satın almağa can atırdılar. Nizami Leylini bu şəkildə almağa çalışanları dəllal adlandırır. Belə dəllallardan biri də qızılı qum kimi səpən İbn Səlam idi. Leyli İbn Səlama getməyə ona görə etiraz etmir ki, qadın ismətini, adını qoruya bilsin. Qadına münasibət orta əsrlərdə o qədər ciddi, sərt, o qədər ağır idi ki, Məcnuna layiq bir qız olmaq üçün də Leylinin əsas çıxış yolu bu idi. Leyli özünü Məcnundan artıq divanə saysa da, zaman onun qanadlarını daha qısa kəsmişdir:

Bəxtinin ulduzu batan aşiqdən
Min dəfə şiddətli divanəyəm mən.
O hədəf oldusa bu dərdə, yasa,
Bir qadın deyildir o heç olmasa.
Sevda yollarında göstərir hünər,
Kimsədən nə qorxar, nə də çəkinər.
Zavallı mənəm ki, ürəyimdə qəm,
Dərdimi heç kəsə aça bilmirəm.
Qorxuram əhvalım pərişan ola,
Yaxşı adım belə çox yaman ola.

Bu parçada Leylinin eşqi də, faciəsi də çox dəqiq şərh edilmişdir. Qadın olmaq, qorxub çəkinmək, yaman ad qeydinə qalmaq, dərdi heç kəsə aça bilməmək onu Məcnunla ayaqlaşmağa qoymur.

Bəzən Leyli qadını min illərdir köləyə, hüquqsuz əşyaya çevirən qanunlar zəncirini qırıb parçalamaq, daha azad nəfəs almaq haqqında düşünürsə, bunlar ilk düşüncələr olaraq qalır. Ata və ər qorxusu onu qanad açmağa qoymur.

Eşq ürək verir ki, sən də qanad aç,
Bu qarğa-quzğundan kəklik kimi qaç.
Ad ilə namussa: "tərpənmə"- deyər,
Tək uçan kəkliyi qızılquş yeyər.
Bir qadın nə qədər cəsur olsa da,
Yenə də qadındır adı dünyada.

Leyli üçün bu ilk düşüncələrin özü də böyük nailiyyətdir. Leyli düşdüyü vəziyyətlə barışıb qəmlərə boyun əysə belə, düşmənə təslim olmur.

Nizami bu poemada yaratdığı surətlər, təsvir və təhlil etdiyi hadisələr, mətləblər vasitəsilə dövrünün zəngin mənəviyyatlı insan obrazını, fikir, düşüncə və əxlaq mənzərəsini yaratmışdır. Hətta hər bir zərrənin müəyyən bir iş gördüyünü söyləyən ölməz sənətkarın bu əsərində də ən epizodik surət belə mühüm ideya yükü daşıyır, dövrün insan xarakterlərini daha dolğun göstərməyə xidmət edir. Şairin əvvəlki əsərləri kimi bu poema da həyatın özündən gələn zəngin fikir xəzinəsidir.

Dahi şairin "Leyli və Məcnun" poemasını böyük sənətkarımız Səməd Vurğun tərcümə etmişdir. Bu tərcümə haqlı olaraq Nizami əsərlərinin tərcümələri arasında ən yaxşılarından biri, bəlkə də birincisi sayılır. Tərcümənin dilindəki təbiilik, yüksək bədiilik və axıcılıq onu oxuculara sevdirən əsas keyfiyyətlərdir. Nizami əsərindəki ən rənga-rəng poetik fikirlər Vurğun tərəfindən o qədər məharətlə tərcümə olunmuşdur ki, oxucu bir tərcümə əsəri oxuduğunu əsla hiss etmir.

***Xəlil Yusifli***

Ey adı ən gözəl başlanğıc olan,
Adınla başlanır yazdığım dastan.
Sən, ey xatirəsi könlümə həmdəm,
Adın düşməmişdir dilimdən bir dəm.
Bütün varlıqları özün yaratdın,
Bağlı qapılara açardır adın.
Adının qərarı olmadan əvvəl
Qələm tutmamışdır dünyada bir əl.
Ey bütün varlığın həyat təməli,
Yetməz dərgahına bir insan əli.
Sənin tərifindir "təbarəkallah"[1]
Alqış cəlalına, feyzinə, allah!
Yeddi qız, doqquz taxt qapında sənin
Olmuşdur daima pərdə çəkənin[2].
Ey öz varlığı da bilinməz hekmət,
Zahirə, batinə bir sənsən bələd.
Bütün bu canlılar, cansızlar ki, var,
"Yaran" deməyinlə yarandı onlar.
Hökmünlə ruh alır, əql alır bədən,
Yaradan da sənsən, öldürən də sən.
Ey sirr aləminin ulu məhrəmi,
Dolduran, boşaldan sənsən aləmi.
Sənin sifətində öz tərifin var,
Yox sözün yox olur, var sözün də var.
Əmri mütləq olan, ey böyük hünər,
Kainat əmrinlə iki bölünər.
Sən, ey möhtacların ürək dirəyi,
Böyük vicdanların sənsən diləyi.
Ən iti gözlərə sən sürmə çəkdin,
Bağlı qapılara özün baş çəkdin.
Ey ustad, göstərir yazdığın əsər,
Zamanı əvvəldən axıra qədər.
Ağasan, qulundur hər şey dünyada,
Sultan sən özünsən, başqası gəda.

Yolun, işığıdır əbədiyyətin,
Şəriksiz yaranmış bütün niyyətin.
Saysız yaratdığın nemətlər durur,
Bu sirri tapmağa acizdir şüur.
Lütfünlə hər şeyin qeydinə qaldın,
Dünyanı ən yarar bir şəklə saldın.
Axşamın qapqara, səhərin ala,
Atına göyləri yaratdın tovla[3].
Yeddi düyüm vurdun göylərə, birdən
Yetmişi açıldı, bu qüdrətindən[4].
Bir kül qaldıraraq torpaqdan həmən,
Onunla yüz ayna təmizlədin sən.
Hansı bir varağı yazdınsa əgər,
Ikicə hərf ilə dedin müxtəsər.
Bir dağ çapmadısa bu kaf ilə nun,
Göy adlı bir böyük Bisütun qurdun[5].
Hardasa dünyanın dövləti, varı,
Bu iki hərfdir onun açarı.
Yanlış bir hərf də yazmadın yenə,
Qoydun hər nöqtəni sən öz yerinə.
Sənin sənətinlə yarandı aləm,
Yoxdur bu sənətdə başqa bir qələm.
Lütf etmən yazığa, sığındım sənə,
Bir söz xəzinəsi bağışla mənə.
Xəzinən bu payla heç də azalmaz,
Başqa xəzinədə bu kərəm olmaz.
Şahlığın, qulluğun öz qismətindən
Hər kəsə bir dövlət, nemət verirsən.
Hər zülmün alovu, məzlumun ahi.
Bir sənə məlumdur, böyük ilahi!
Hələ yazılmamış kitabları sən
Oxuyub aləmə xəbər verirsən.
Əql büdrəmədə, kuyinsə-zülmat,
Yol da ki, tük kimi nazikdir, heyhat!
Köməyim olmasan, ya pərvərdigar,
Bu düyüm əql ilə necə açılar?
Əql işıq alır sənin qapından,

Yanar dərgahına girdiyi zaman...
Ey mənim əqlimə mənalar verən,
Mən axtarışçıyam, sən yol göstərən.
Yollarım qorxulu olsa da bu dəm,
Sən ki, rəhbərimsən qorxan deyiləm.
Yüküm çox ağırdır düşmüşəm gücdən,
Tükənmiş taqətim, de, neyləyim mən,
Nə qorxu, yoxsa da canımda qüdrət,
Sənin köməyinlə işlərəm, əlbət.
Lütfün ki, qəhrindən ayrı deyildir,
Yanında şərbət də, zəhər də birdir.
Əsirəm, şübhəsiz, hüzurunda mən,
Lütfünlə yaşaram, ölləm qəhrindən.
Qoy, içim mərhəmət şərbətlərindən,
Qəzəb badəsini mənə vermə sən.
Qəzəbin layiqsə əzəldən bizə,
Rəhmin də düşmüşdür qismətimizə.
Nə qədər nəfəsim çıxmamış candan,
Əlim ətəyində gəzirəm hər an.
Bir gün can evimdən çıxsa nəfəsim,
Dualar deyəcək adına səsim.
Ölüm səfərinə qoyarsam ayaq,
Adın vücuduma hünut olacaq[6].
Tozlara dönsə də bu aciz bədən,
Hər yerdə, hər zaman məbədim sənsən.
Ilahi, nə qədər dünyada sağam,
Sənin xatirənlə yaşayacağam.
Böyük dərgahına girdiyim zaman,
Neylər bu dərgahdan qovulmuş şeytan.
Boynuma asdımsa tilsimini mən,
Qorxmuram divlərin böyüklüyündən.
Mənəm dərgahında bir dilsiz ehram,
Sənin sorağında ləbbeyk vuraram[7].
Ehram sındıranlar çoxdur dünyada,
Bu şərdən məni gəl saxla, ey xuda!
Bəlalar gizlidir, bikəsəm, allah!
Varmı səndən özgə mənə bir pənah?!

Bir sənsən dünyada əlimdən tutan,
Nə versən qailəm, böyük yaradan.
O saf cövhərindən alsa bədənim,
Misim qızıl olar dünyada mənim.
Lütfündən bir işıq göstərsən, əgər,
Torpaq qızıl olar, su dürrə dönər.
Bir gövhər də olsam, bir saxsı da mən,
Hüsnüm bəzənmişdir sənin hüsnündən.
Libasım ətrinlə qoquyar müdam,
Buyam ya "dirəmnə" ya da "ud" olsam[8].
Qarşında nə dinim, nə taətim var,
Qapında boş əlim şəfaət umar.
Gəmim qərq olmamış qanlı sularda,
Rəhm et, əlimdən tut, qalmayım darda.
Qaldır yıxılmışı bu qara yerdən,
Məni cəhl atından özün düşür sən,
Ilahi, dar gündə sən ol həmdəmim,
Istədiyin yerə çatsın qədəmim.
Aç mənim üzümə nur xəzinəni,
Zülmətlər içindən xilas et məni.
Qorxuyla, umudla baxıb dünyaya,
Bir pərvanə olum günəşə, aya.
Söylə, nə vaxtadək bir tikə üçün
Şaha və gədaya yalvarım hər gün.
Süfrəndən nemətli bir şey olarmı?
Səndən səxavətli dünyada varmı?
Öz xırmanından ver zəkatımı sən,
Qəbzinlə gəzməyim qapı-qapı mən.
Bir əkin yeriyəm hər yanı bərbad,
Bu, suyla, torpaqla olacaq abad.
Mənə öz qapından ver torpaqla su,
Axıtsın yolumda olan kol-kosu.
Məni mənliyimdən ayıran zaman
Sən öz cövhərini alma canımdan.
Məni qaytaranda özümə, dərhal,
Mərhəmət kölgəni gəl, üstümə sal.
Bu sayən olmasın çıraqdan uzaq,

Gün kimi parlasın işığ saçaraq.
Taki işığınla həmdəm olum mən,
Nur kimi kənarda durum kölgədən.
Başqa həmdəmləri almayım dilə,
Unudum nə varsa bu gündən belə,
Vəfasız yaranmış bütün qapılar,
Bir sənin qapında vəfa tapılar.
Ancaq həyatdadır vəfa, etibar,
Ölümlə dağılıb məhv olur onlar.
Yalnız sənin əhdin əbədi qalır,
Ölüm də, dirim də səndən əhd alır.
Qiyamət gününü görmədikcə mən
Ayrılan deyiləm sənin əhdindən.
Bir səni çağırır cahanda səsim,
Xatirən olmasa batar nəfəsim.
Əzəl yer üzünə mən gəlməmişdən,
Qurduğun nizamı görməmişdim mən.
Torpaqdan yaratdın mayəmi mənim,
Torpaqdan yem aldı bütün bədənim.
Tanrı! Varlığıyın gözəlliyindən
Bütün kainata zinət vermisən.
Lütfün ki, olmuşdur mənə müyəssər,
Varlığım çürüyüb gedənə, qədər -
Harda otur desən, oturacağam,
Qarşında qul kimi lal duracağam.
Gördüyün bu yoldan çox keçmişəm mən,
Gah quyu dibindən, gah taxt üstündən.
Istər qoca olum, istərsə cavan,
Yollar müxtəlifdir, mən isə haman.
Bir haldan bir hala keçsəm də dəm-dəm,
Yenə ilk şəklimlə hərəkətdəyəm.
Möhtac yaratmadın sən məni əzəl,
Dünyada heç məni mətəl qoyma gəl.
Zərrəcə qorxmuram gələn əcəldən,
Bu yol dərgahına gedir əzəldən.
Bağ, bostan yoludur ölümün izi,
Dostlar sarayına aparır bizi.

Ölüm ki, səndəndir nə qüssə, nə qəm,
Qoy ölüm, ölümdən mən dad çəkmərəm.
Hərçəndi dünyada ölüm gerçəkdir,
Ölüm, ölmək deyil, yer dəyişməkdir.
O, yemək yerindən yataq yerinə,
Ordan şah yanına bir yoldur yenə.
Sənin məclisinə gedən bu yoldan,
Əbədi yuxudan qaçmaram, inan.
Sənin şövqin ki, var, mən bəxtiyaram,
Şad yatıb, hər zaman şad da qalxaram.
Əgər dərd üzündən qulun Nizami
Sənə yalvardısa, tut ilticami.
Dəryandan yüksələn bulut bil məni,
Yağsam da, boşaltma bu xəzinəni.
Yüz lüğət yaradıb, yazsa yüz əsər,
Hər sözün başında səni təriflər.
O, yüz min üzr ilə qapında durar,
Bilir ki, boynunda min günahı var.
O, bütün dərdini danışmaz ki, sən
Lalların dilini yaxşı bilənsən.
Xəmirəm qarasa, sən yoğurmusan,
Xəttim qarışıqsa, özün qurmusan.
Sən öz xətlərinin hamsını yusan,
Ömürlük bağlaram ağzımı, inan.
Bir daha versən də mənə ixtiyar,
Hakimlər hakimi, ixtiyarın var.
Ölüm pəncəsiylə döyüşməmiş mən,
Ruzgarın cilovu çıxmamış əldən,
Sən mənə rəhm edib, yol göstər yenə,
Peyğəmbər qəbrinin ziyarətinə.

## SONUNCU PEYĞƏMBƏRİN TƏRİFİ

Ey varlıq mülkünə böyük şahsüvar,
Əqlin sultanısan, zəkavətin var.
Sonusan o mürsəl peyğəmbərlərin
Sonun halvasısan, duzu əvvəlin.
Varlıq bağçasının ilk gülü sənsən,
Zamanın sonuncu sərkərdəsisən.
Kifayət mülkünə sənsən hökmüdar,
Vilayət hökmüdür verdiyin qərar.
Hər kəs lovğalıqla çıxsa qarşına,
Bir ədəb qılıncı enər başına.
Gözlər işıq alır ayaq tozundan,
Aləm işıqlanır daima ondan.
Səndən işığını almayan bir şam
Sönər öz yeliylə, qaralar müdam.
Ey qəbilələrlə aydın dil tapan
Vazeh dəlillərlə zərbə vuransan
Allahın höccəti bütün səndədir,
Səhərin sirri də o sinəndədir.
Ey iki dünyanın saray ağası,
O qabe-qövseynin mahir ustası[9],
Ey sonsuz göyləri gəzib bac alan,
Yetmiş min pərdənin üstə ucalan,
Ey əqlin və canın fövqində duran,
Sənə səcdə qılır yerlə asiman.
Yer göyə dönmüşdür dininlə, gerçək,
Yox-yox, döşəməndir bu sonsuz fələk.
Ey altı cəhəti heyrətləndirən,
Atını çapırsan yeddi göyə sən.
Altı-yeddi min il keçir o andan
Ki, bu dəbdəbəni eşitmiş cahan[10].
Hər əqlə süfrəndə bir nemətin var
Qapında qul kimi dayanar ruhlar.
Ağıl sənsiz olsa, nə çıxar ondan?
Sənsiz yaşayarsa ölüdür hər can.

Öz adın oğluyun adıylə birdir.
Aləm "Əbülqasım Məhəmməd" deyir.
Ağıl ki, görünməz bir xəlifədir,
Qüvvəti, qüdrəti sözlərindədir.
Məhəmməd eşqiylə yanmasa ürək,
Eşqin çəmənində açılmaz çiçək.
Tanrı dostlarına sənsən şahsüvar,
Yeddi göy üstündə bir məclisin var.
Səxavət mülkünün sənsən ağası,
Dünya məqsədisən, məqsəd dünyası.
Mənalar mülkünün ilk qaynağısan,
Dirilik suyunun baş bulağısan.
Sənin torpağınla bəzəndi Adəm,
Nurinlə parladı hər iki aləm.
Sən ki, öz "atını" sürdün dövrana,
O, yeddi atıyla çatmadı sana.
Günəş can atırdı səcdənə, gerçək,
Ona bəhanəydi məğribə getmək.
Ulduzlar başına dolanır dəm-dəm,
Yalnız bu arzuyla fırlanır aləm.
Varlıq büsatında varmı bir insan,
Qarşında olmasın yer ilə yeksan?
Sənin iksirinlə rəngləndi torpaq,
Bu dünya səninçin yaranmış ancaq.
Böyüksən, qarşında kiçikdir hamı,
Bütün möhtacların sənsən ilhamı.
Kainat taxtının padişahısan,
Həyat ölkəsinin şahlar şahısan.
Yaşıl göy səninçin bir ordugahdır,
Qəmzən bir fərmandır, hörüyün çadır.
Bu beş vaxt namazdır əsli tövbənin,
Beş növbə təblidir qapında sənin[11].
Quruldu diniyin beş binövrəsi,
Yüz min zülm evinin kəsildi səsi.
Bu evə yeddi səqf yaratdın yenə,
Tapşırdın onu da dörd xəlifənə[12].
Siddiq sədaqətə olmuşdur rəhbər,

Faruqi fərq-dən uzaq bildilər[13].
O, allahdan qorxan həyalı qoca[14],
Tanrının şiriylə həmdərs olunca,
Dördü də bir yolun sarbanı oldu,
Dördü də bir ləkin reyhanı oldu.
Bu dörd xəlifəylə güldü məmləkət,
Hər ev dörd divarla qurular, əlbət.
Bu dördlük birləşdi qoca dünyada,
Bu dördbucaq evi gətirdi dada.
Sən, dinin evinə dörd dirək vurdun,
Ona bu qaydayla dörd çatma qurdun.
Sənin qaşın kimi haman dörd nəfər
Gah ayrı düşdülər, gah birləşdilər.
Yerin əl bağlayan bu halqasından
Bircə sıçrayışla ərşə qalxırsan.

**PEYĞƏMBƏRİN MERACI**

Sən, ey mənaların meracı olan,
Sənin meracındır sonsuz asiman.
Yeddi xəzinəni açaraq bir dəm,
Dörd gövhər üstünə basmısan qədəm[15].
Sığmadın zamanın dar sinəsinə,
Ucaldın göylərin son zirvəsinə.
Gecə qara bayraq tutduğu zaman
Oldu qara atın mənzilə rəvan.
O vaxt qanad açdı sənin ayağın,
Göyün xəlvət yeri oldu dayağın.
Bu fani dünyadan sən yüksələndə,
Sən, Ümmi-Haniyə qonaq gələndə[16],
Cəbrayıl gətirdi sənə şad xəbər,
Dedi: - Qulluğuna hazırdır göylər,
Göylərdə mələklər səf-səf düzəlmiş,
Bütün göy aləmi seyrinə gəlmiş.
Oyan, yuxu vaxtı deyildir, haray,

Sənin tək günəşə müntəzirdir ay.
Yerini Ütarid bilməyəcəkdir[17],
Sənin düşərgahın daha yüksəkdir.
Şabaş sinisini qaldırmış Zöhrə[18],
Deyir: "Şərq batacaq al şəfəqlərə".
Günəş də incəlib olmuşdur hilal.
Yolundan çəkilmiş sanki bir xəyal.
Mərrix qulluqçudur yataq evinə[19],
Üzəngidən tutan uşaqdır sənə.
Müştəri yoluna doğandan bəri[20]
Yanıb qamaşdırır yaman gözləri.
Keyvan qulağına halqa taxaraq[21],
Qul kimi qaldırmış bir qara bayraq.
Bu cürə qulların köməyilə sən
Getdiyin yolları xoş keçəcəksən.
Qədr gecəsidir bu gecə, tələs[22]
Onun qədrini bil, gecikmə əbəs.
Bu gecə hüsnüdür əbədiyyətin,
Merac gecəsidir bu Məhəmmədin.
O gecə nə qədər xoşbəxtdi, bilsən,
Gündüz tək parladı ilk qədəmindən.
Bu qara torpağa qoyub da pərgar,
Gəzdin göy üzünü sən diyar-diyar.
Ildırım "Buraq"ı, mindin dünyada[23],
Sənin gedişindən yumşaldı o da.
O bakir yaranan taxt üstündə sən
Bir səadət kimi açmışdın yelkən.
Minib bu tək ata göylərdə çaxdın,
Cüt atlı ruzgarı dalda buraxdın.
Fələklər bağına girən zaman sən,
Ağlı, qırmızılı xoş meyvələrdən
Qapına minlərcə salxım yollandı,
Sənin gözündəydi eşqin son andı.
Qalxanda göylərin yeddi qatına,
Nə pərçəm, nə də bir tac qurdun ona[24],
Yırtıldı göylərin bulut qabağı,
Sınıb parçalandı ayın tabağı.

Tovus qanadlılar çıxıb göylərdən,
Qarşında qol-qanad tökdülər birdən.
Cəbrayıl səninlə gedə bilmədi[25].
Allaha tapşırıb, yaxşı yol, dedi.
Mikayıl yer verdi sənə başında[26],
Israfil qul kimi durub qarşında[27],
Özünü kölgə tək ayağa saldı,
O da yarı yolda yorulub qaldı.
Bir "Rəfrəf" səninlə mənzilə vardı[28],
O, "Sidrə" taxtına səni apardı[29].
"Sidrə"nin üstündən keçən zaman sən
Hədis dəftərini yazdın əlinlən.
Yeddi qat göylərdən keçib yüksəldin,
Yüksəlib ən uca zirvəyə gəldin.
"Sübbuh" söyləyərək göy sakinləri[30],
Kölgəyin nurində çimdi min pəri.
Ərşin çadırından uçdun yenə sən,
Üzünü göstərdin yetmiş pərdədən.
Çıxdın tərəflərin zülmətlərindən,
Yüksəyin, alçağın zəhmətlərindən.
Qurtardın paltarın ağırlığından,
Tacı da, taxtı da atdın o zaman;
Xeyməni götürüb iki aləmdən,
Tanrı gərdəyini eylədin vətən.
Həm böyük allahı ziyarət etdin,
Həm də haqq sözünün sirrinə yetdin.
Sənin eşitməyin, bir də görməyin
Ağıldan, idrakdan uzaqdır, yəqin.
Açdın ürəyini sən sərin-sərin,
Adına layiqdir istədiklərin.
Verdi istəyini böyük yaradan,
Sən razı qayıtdın tanrı yanından.
Alnın nar gülü tək açıldı yenə,
Kərəm fərmanını aldın əlinə.
Sənin xatirinə o böyük tanrı
Əfv etdi biz kimi günahkarları.
Şahımız, kölgəndə tutmuşuq qərar,

Bizim bu dünyada nə dərdimiz var!
Sən bizə ruh verən günəşsən artıq.
Daima parlasan, biz də solmarıq.
Vicdanın mürüvvət dənizidir, bil,
Nübüvvət göyləri sənin yerindir[31].
Sənsiz mürüvvət də, göylər hakimi,
Xalqa görünməzdi nübüvvət kimi.
Səndən uzaq düşən hər kəs, hər nəfər
Səadət üstündən bir qələm çəkər.
Vəfa kəmərini belə bağlayan
Düşməz əbədiyyət taxtından bir an.
Baxıb Irəm bağı bu vüqarına,
Ətir xərac verir ruzigarına.
Göylər baratını yazıb göylərə,
Bir xəzinə kimi qayıtdın yerə.
Göyləri keçdiyin o sürətlə sən,
Nolar, Nizamiyə bir söz söyləsən.
Çoxmu qalacaqsan sən bu niqabda?
Çoxmu yatacaqsan o rəxti-xabda?
Bir oyan, üzündən bu örtünü at,
Şahını şahmatın taxtında oynat.
O yük dalındakı süfrəni göstər,
Xəyalım aləmi pərdəsiz istər.
Iki ağ-qaranın rəngini sil sən,
Qaldır ziddiyyəti dörd təbiətdən.
Iki vəfasızın əhdini bir et,
Bu dörd ayaqlını özün əlbir et[32].
Həyatı kəmalə verəndən bəri
Həll etdin aləmdə çətinlikləri.
Nafəndən küləyə bir ətir versən[33],
Bizə də pay düşər bu nemətindən.
Əzəl lövhəsini bilirsən əzbər,
Ondan bir ayə də bizimçin göndər.
Zəhmətsiz tapdığın elmdən bir az
Bizim də dəftərə öz əlinlə yaz.
Biz kimik, nəçiyik, aç göstər artıq,
Büt qayıranmıyıq, büt qıranmıyıq[34].

Ey mənim işimi düzəldən qüdrət,
Sənsən Nizaminin qəlbinə qüvvət.
Könül, gəl bununla qənaət elə!
O böyük tanrıdan şəfaət dilə!
Taki bu pərdəni almasın bizdən,
Bu pərdə qalxmasın heç üzümüzdən.

## HİKMƏT VƏ MOİZƏ HAQQINDA

Ellik məclisinə verəndə ehsan,
Şəhərdə badəsiz qalmasın insan.
Səxavət buludu yağsın aləmə,
Bütün vücudları gətirsin dəmə.
Mey kimi tökülsün müzayiqəsiz.
Gül kimi açılıb gülsün pərdəsiz.
Parlasın aləmdə bir günəş qədər.
Ondan işıq alsın sonsuz üfüqlər.
Hər şeyi elliyə bağışla, gerçək,
El borclu qalsa da, bu borcdan əl çək.
Bütün insanlara sual ver bu dəm:
Nə yolla yarandı boşluqdan aləm?
Bir söz lazımdır ki, bağlı sirrlər
Açılsın qönçə tək, şadlansın səhər.
Baxın əlimdəki şirin şəkərə,
Onu paylayıram nazəninlərə.
Dünyaya səpirəm bu şirnini mən,
Oğlum qulaq assın buna ürəkdən.
Mən bütün bədənə yem verən zaman
Öz ciyər param da pay alar ondan[35].
Ey varlıq nəqşinin naziri olan,
Qaldır əngəlləri idrak yolundan.
Yolunda nə qədər canlılar vardır,
Sənin varlığına pərəstişkardır.
Boş təbli döyərək, hay-haray salma,
Heç kəsin səsinə biganə qalma.
Bir toz görünsə də hər zərrə əgər,

Dünya pərdəsində o da iş görər.
Göylərə yüksələn bu yeddi hasar
Zarafat deyildir, öz mənası var.
Pərdə altındakı bu yeddi rəvaq
Lovğalıq deyildir, hekmətə bir bax.
Qısa söz, dünyada nə sən, nə də mən
Oyuncaq deyilik xilqətimizdən.
Nə şəhvət, nə yuxu, nə də ki, yemək
Həyatın mənası olmasın gərək.
Yatmağı, yeməyi bu aləmdə sən,
Eşşək, öküzdə də görə bilərsən.
Təbiət quranda xilqətimizi,
Başqa səhifədə yazmışdır bizi.
Anlayıb, düşünək hər şeyi gərək,
Hər sirri açmaqla hünər göstərək.
Yerləri, göyləri öyrənək bir-bir,
Qalmasın bizimçin açılmamış sirr.
Görək, kim yaratmış bu təbiəti,
O kimdir, işinin nədir hikməti?
Bu varaq üstündə çəkilən hər xətt
Sənətkar əliylə yaranmış, əlbət.
Qurğusu düz olan bu şeylər bir-bir
Mahir bir ustada canlı şahiddir.
Səni, öz adıyla düz yol göstərən
O böyük allaha and verirəm mən,
De, görüm, dünyada bir aynamı var
Ki, seyqəl verməsin ona sənətkar?
Seyqəlsiz bir ayna olmaz dünyada,
Hər sənət bir ustad gətirir yada.
Həqiqət gözüylə xəyala varsan,
Hər şeydə qüdrətdən nişan taparsan.
Baxma ki, nə yolla yaranmış onlar,
Sənin gözlərində bu qüdrətmi var?!
Hər şey öz-özünə necə düzəldi,
Bax, nə cür kainat əmələ gəldi?
Qoy, sənə şübhəsiz olsun aşikar,
Onun başqasına ehtiyacı var.

Rəsm işi rəssama düşdüyü zaman
Mən qaxıncdan çıxdım, sən avamlıqdan.
Dünyada gördüyün hər incə sənət
Allah əsəridir, ondadır qüdrət.
Bax, bu ipək rəngli yeddi pərdədən
Üzsən ayağını, daş yeyəcəksən.
Bu pərdə dalında o sirrlər ki, var,
Zənn etmə, çalışsan məlumun olar.
Xilqətin sirrini az ara, az gəz,
O, adi gözlərlə görünə bilməz.
Elə toxunmamış bu ip əzəldən
Ki, onun ucunu tapa biləsən.
Tanrı qüdrətiylə düyüm bağlayan
Bu ipi açmamış, açammaz insan.
Bu tanrı dastanı necə dastandır?
Ağıl sahibləri ona heyrandır.
Xilqətin sirrini bilsə bir nəfər,
Bu qoca dünyanı o da xəlq edər.
Acizik aləmi yaratmağa biz,
Onun əslini də tapmaz əqlimiz.
Göyün sirr pərdəsi ki, bərqərardır,
Gözə görünməyən bir sirri vardır.
Nə qədər oraya at çapsam da mən,
Bir xəbər öyrənmək gəlmir əlimdən.
Göyün lövhəsində yanır rəqəmlər,
O saf ulduzları mən birər-birər
Nə qədər oxuyub öyrəndim, heyhat,
Yenə də qəlbimi görmədim rahat.
Bilirəm, yaranmış hər böyük əsər
Onun qüdrətiylə açıla bilər.
O şey ki, bizlərə lap aşikardır,
Orda da gizli bir xəzinə vardır.
Çalış, xəzinənin böyük açarı
Şüşə yox, poladdan qayrılsın barı,
Taki xəzinəyə çatdığın zaman
Sən orda zəhər yox, şərbət tapasan.
Bilirsən, harda ki, bir xəzinə var,

Qoynunda zəhər də, dərman da saxlar.
Musa gövhər tapdı xəzinələrdə,
Qarun da boğuldu ləli-gövhərdə[36].
Arada ixtilaf, dava oldusa,
Yenə Qarun öldü, qazandı Musa.
Varlıq cədvəlini quran sənətkar
Bilinməz şeylərə çəkmişdir hasar.
Ən uca nöqtəni aşarsa bir xətt,
Öz əski halına meyl edər fəqət.
Fikir nə zaman ki, son xəttə çatar,
Dayana bilməyib geri qayıdar.
Pərgar dolansa da öz dövrəsinə,
Birinci nöqtəyə qayıdar yenə.
Dünya dövrəsində bu həlqə ki var,
Onu bu məqsədlə bağlamışdırlar.
Ki, hər kəs başını çıxartsa ondan,
Qapı həlqəsi tək qala sərgərdan,
Əl vurma fələyin bu zəncirinə,
Bil ki, bu zəncirin sonu var yenə.
Baxma ki, nə höküm vermiş təbiət,
Onun da bir sonu olacaq, əlbət.
Bundan xaricdə də bir dərgah durur,
Ağlayıb sızlamaq onun yoludur.
Elə bir pərdədən nəfəs al ki, sən,
Hər şey düz qurulmuş haman pərdədən.
Bu yeddi fələyə nəzər yetir bir,
Xəyalın rəqsinə pərdə düzəldir.
Olmaz o pərdəylə səsləşmək bir az,
Onu öz-özünə tanımaq olmaz.
Sən haman pərdəni axtarsan əgər,
Bil ki, öz pərdən də yadından gedər.
Çalıb oxumaqda Barbüd olsan da[37],
Pərdəsiz bu saza toxunma əsla
Pərdəsi yırtılmış xudbinlə yəqin,
Dalında durma sən heç bir pərdənin.
Sən də Nizami tək bir pərdə axtar,
O vaxt yaxşılıqla şöhrətin artar.

* * *

Yenəmi alçalaq biz torpaq kimi,
Ruzgara baş əyək bir yarpaq kimi?
Yenəmi yel olub torpaq sovuraq,
Xəzəllə, tikanla oynayıb duraq?
Torpaqdan nə qədər xərc alsa ruzgar,
Aldığı torpaqla çuxur doldurar.
Bundan aldığını ona verərək,
Aldığı mayanı qaytarır külək.
Bu qat-qat yerlərə diqqətlə bir bax,
Torpaqdan qurulmuş bu yerlər ancaq,
Gah zəlzələ qopar, gah sellər axar,
Torpaq tuta bilməz bir yerdə qərar.
Zəlzələ batırar, su yuyar onu,
Sonra düzəngaha çevrilər sonu.
O vadi, zamanın hökümləriylə
Dönüb qışlaq olur obaya, elə.
Bu fani torpaqdan hər arxı bir su,
Bir də külək qazmış, sözün doğrusu.
Yerin hüdudundan o tərəfdə də
Bulutlar, fələklər qaçışır yenə.
Onlar bir-birinə sarılmış bərk-bərk,
Hamsı top kimidir, gəzir kürə tək.
Bu kürə şəklində yalnız yer deyil,
Hər xətt ki, hərlənir yuvarlaqdır, bil.
Tüstü bu dərədən qalxar yuxarı,
Iki-üç cidalıq gəzər ruzgarı,
Sonra əyilərək, geriyə dönər,
Bu yer kürəsinin başına enər.
Pərgar xətti kimi dolanan fələk
Yalnız bu qaydayla dövr edir, gerçək.
Səhradan bir bulut qalxarsa əgər,
Ucalar müəyyən nöqtəyə qədər.
Uçar ucalığın son zirvəsinə,
Lakin o sərhəddi aşammaz yenə.
O da dairədə dolanıb qalar,
O da bir dairə şəklini alar.
Çadır tək çataraq bulut qaşını,

Yerin üfüqünə qoymuş başını.
Onun qoşununa yetirsən nəzər,
Dairə olmağa o da meyl edər.
Hər sadə damcının əsil cövhəri
Dəryaya meyl edir əzəldən bəri[38].
Bax, yeddi dalğalı bu çərxi-fələk
Getdikcə yüksəlir, hey yüksələrək.
Üfüqdə də olsa, göydə də olsa,
Həmişə yüksəlmək adətdir ona.
Onun bu uçuşu bənzər xəyala,
O da ucaldıqca yetər kamala.
Fələkdən yuxarı dolaşma artıq,
Ondan da yuxarı yoxdur ucalıq.
Hələ açılmamış elm ilə göylər,
Lakin hər elm də gülür bir səhər.
Bir qara pul olsun, bir arpa əgər,
Onda dörd gövhərdən tapılar əsər[39].
Toxum göyərsə də torpaqdan, sudan,
Bu sirri axtarıb tapmamış insan.
Toxumu bəsləyən torpaqdır ancaq.
Ona şəkil də mi verir bu torpaq?
Nizamsız olsaydı yeraltı bir an,
Salxım olardımı, deyin, toxumdan?
Tutaq, salxım olur bir dənin sonu,
Şəkil qalıbına kim salır onu?
Fikri dolaşdıran bu pərdə də bir,
Halları dəyişən səbəb gizlənir.
O səbəb nədirsə sənin yanında,
Aç, söylə, gizləmə onu canında.
Bir səbəb gördükdə arif olanlar
Anlar ki, yaratmış onu səbəbkar.
Nizami, uzaqlaş bu fikirlərdən,
Düşmə bu dünyanın tələsinə sən.

## KİTABIN YAZILMASININ SƏBƏBİ

Bir gün nəşəliydim, aləm şad kimi,
Dəmlər içindəydim Keyqubad kimi[40].
Qaşlarım açıqdı, sanki bir kaman,
Qarşımda dururdu yazdığım divan.
Üzümə tutmuşdu güzgüsünü baxt,
Səadət saçımı darardı, o vaxt,
Dəstə bağlamışdı güllərdən səhər,
Səhəri oxşardı yaqut şəfəqlər.
Könül pərvanəsi əlində çıraq,
Mən bülbül olmuşdum, məst olmuşdu bağ.
Bayraq qaldırmışdım söz zirvəsinə,
Hünər lövhəsini yazırdım yenə.
Qələm dimdik olub deşirdi ləli,
Turaca dönmüşdü təbimin dili.
Qəlbim deyirdi ki, söz əməyimdir,
Səadət yoldaşım, bəxtköməyimdir.
Yenəmi dünyada boş nəfəs alım?
Yenəmi aləmdən kənarda qalım?
Dövran şadlıq bəzmi qurandan bəri
Qovdu məclisindən boş gəzənləri.
Mədəsi ac olan işsiz bir köpək
Boş-boş oturmaqla taparmı çörək?
Bu dünya səsiylə səsləşənindir,
Dövranla düz gəlsən, dövran sənindir.
Başını yuxarı tutmaq istəsən,
Hava tək hamıyla sazişə gir sən.
Güzgü tək hər yerə qoyulsa əgər,
Yalandan özündə bir şey göstərər.
Sənətin ziddinə söz danışanlar
Əyri pərdə kimi yanlış çalarlar[41]
Sən ey padşahım, böyüksən əgər,
Iltimas edərsən məndən bir hünər.
Bu fala mən qürrə atdığım anda
Ulduzlar keçirmiş eyni zamanda[42].

Hər zəhmət sonunda bir səadət var,
Bəxti olanlar da xəzinə tapar.
Bu zaman bir elçi gəldi eyvana,
Şahın məktubunu gətirdi mana
On-on beş sətirdi şahın bu sözü
Gözəl xətti ilə yazmışdı özü.
Hər hərfi bağ kimi güllər açmışdı,
Bir şəbçıraq kimi şəfəq saçmışdı:
"Ey söz dünyasına hakim Nizami,
Qulluğa məhrəmsən tut ilticamı.
Səhər yuxusunun pərdəsini at,
Yenə söz oynadıb bir sehir yarat.
Əqli heyran qoyan söz meydanında
Min şirinlik göstər hər dastanında.
Istərəm Məcnunun böyük eşqinə
Bir söz xəzinəsi açasan yenə.
Bakirə Leyli tək, ey böyük ustad!
Şerdə iki-üç bakir söz yarat.
Deyim, bu şəkərdir, deyildir acı,
Deyim ki, bu sözdür başımın tacı.
Min eşq kitabından yüksək və təzə,
Sən öz qələminlə bir dastan bəzə.
Bu mövzu şahıdır bütün sözlərin,
Layiqdir bu sözə sənin hünərin.
Bu təzə gəlinə, çəkəndə zəhmət,
Fars, ərəb diliylə vur ona zinət.
Sözün sərrafıyam, sən ki, bilirsən,
Təzəni köhnədən tez seçərəm mən.
Qüdrətin böyükdür ona-on yarat,
Onda beş verməyi bir dəfəlik at!
Kamal cövhərinin xəzinəsindən
Gör, kimin sapına inci düzürsən.
Türk dili yaramaz şah nəslimizə,
Əskiklik gətirər türk dili bizə.
Yüksək olmalıdır bizim dilimiz,
Yüksək yaranmışdır bizim nəslimiz".
Qulluq halqasına düşdü qulağım,

Qan vurdu beynimə, əsdi dodağım.
Nə cürətim vardı ki, evdən qaçam.
Nə də gözüm vardı, xəzinə açam.
Ömrüm viran oldu, solub saraldım,
Bu əmrin önündə cavabsız qaldım.
Sirrimi deməyə bir məhrəm hanı?
Ona söyləyəydim bu macəranı.
Qəlbimdə can kimi əzizim olan
Məhəmməd Nizami oğlum bu zaman
Bu gözəl mövzuya könül verərək,
Oturdu yanımda o bir kölgə tək.
Öpdü ayağımı xeyli mehriban.
Dedi: "Ey göylərə meydan oxuyan,
"Xosrovi-Şirini" yazıb yaratdın,
Hər duyan könüldə bir zövq oyatdın.
Leyli-Məcnundan da yarat bir əsər,
Cüt olsun yazdığın qiymətli gövhər.
Bu gözəl mövzuda böyük sənət var,
Xoşdur qoşa gəzsə cavan tovuzlar.
Bir də ki, Şirvanşah, o baş hökmüdar
Şirvana, Irana olmuş şəhriyar.
O rütbə verəndir, nemət verəndir,
Şerə, sənətə də qiymət verəndir.
O səndən bir əsər edir iltimas,
Sən də hünər göstər o əsəri yaz".
Dedim: "Aynaüzlüm, sözündə möhkəm,
Sözün yerindədir, haqlısan bu dəm.
Lakin, iki səmtə əsir bu ruzgar,
Fikir çox genişdir, könül mülkü dar.
Əfsanə dəhlizi dar olsa əgər,
Sənətin sözü də yolda ləngiyər.
Gərək söz meydanı gen olsun müdam,
Atını dörd nala səyirtsin ilham.
Bu ayə olsa da aləmə bəlli,
Qəlbə gətirməyir şadlıq, təsəlli.
Şadlıqdır, eyhamdır sözün arğacı,
Bunlarla düzəlir söz ehtiyacı.

Kədərlə, zəncirlə bağlansa dastan,
Sözlər çılpaq olar, can sıxar, inan.
Onu həddən artıq bəzəsən əgər,
Dastanın üzünə ləkələr düşər.
Yoxsa çıxış yolu bu vəziyyətdən,
Mütləq bir neçə söz deməliyəm mən.
Bu dastanda nə bağ, nə ucalıq var,
Nə çalğı, nə şərab, nə xoşbaxtlıq var.
Qumsala, daşlığa ilham gedərmi?
Getsə də, torpağa təsir edərmi?
Hər şer şadlıqla gəlsə nəfəsə,
Beyit hadisəylə başlayar rəqsə,
Odur ki, dünyada əzəl zamandan
Kədərdən, qüssədən qaçmışdır insan.
Dərd yazan şairlər qanad salmışdır,
"Leyli və Məcnun"sa sözsüz qalmışdır...
Indi şah dil tökür bu təmtəraqla,
Deyir: "Bu kitabı adıma bağla".
Mənzil dar olsa da, bu gündən belə
Mən Leyli-Məcnunu incəliyilə
Bəzəyib bir zinət vurum ki, ona,
Gövhərlər səpilsin şahın yoluna.
Oxucu pərişan olsa da bundan,
Qoy eşqə can versin onda varsa can.
Yenə də öz oğlum dinlədi məni,
O açdı üzümə bu xəzinəni,
Ömrümün ilk gülü o təkcə balam,
O ağız ləzzətim, o son piyalam
Dedi: "Ey kəlamı ekizim ata[44],
Əsəri qardaşım, əzizim ata,
Yarat bu dastanı rəngli, boyalı,
Qoyma ki, süstləşə nəzmin xəyalı.
Harda ki, eşq əli bir süfrə açar,
Bu gözəl hekayə ona duz saçar.
Bütövsə, parçasa hələ bu duzlar,
Süfrədə bişməmiş çiy kabab da var.
Sənin qüdrətinlə duz əziləcək,

Kabab da səyinlə bişə biləcək.
Bu qədər nazəndə, incə bir dilbər
Nədən çılpaq qalsın bu vaxta qədər.
Onu bəzəməmiş arif əlləri,
Odur ki, çılpaqdır o gözəl pəri.
O, candır, can üçün çalışmayanlar
Həmişə borc geyər əyninə paltar.
Can bəzənməlidir can bəzəyilə,
Canından keçməmiş bir insan hələ.
Nəfəsin can verir xalqa cahanda,
Sənin məhrəmindir bu gözəl can da.
Səndən söz yaratmaq gözlənsin gərək,
Məndən dua etmək, bəxtdən də kömək",
Danışıb qurtardı o ciyərparam,
Onun xatirinə söz aldı ilham.
Gövhər axtarmağa başladım yenə,
Kimyalar açaraq girdim mədənə.
Təbim də ən qısa bir yol axtardı,
Yol uzunluğundan qorxum da vardı.
Nə bundan qısaca yol var hələlik,
Nə də bundan qıvraq, iti bir minik.
Bəhrin suyu yüngül, özü axardır,
Canlı, nəfəs alan balığı vardır[45].
Çox bu şirinlikdə söz deyən olar,
Sanma ki, onlarda bu təzəlik var.
Hələ üzücülər qəlb dənizindən
Belə saf bir inci tapmamış, bilsən.
Hər beyti, sapdakı incilər kimi,
Parlayır eybsiz bir hünər kimi.
Mən bu inciləri gəzəndə bir-bir,
Ayağım tük qədər sürüşməmişdir.
Qəlb cavab- verirdi mənə ürəkdən,
Bulaq su verirdi yer qazdıqca mən.
Əqildən aldığım bu gəlir, dövlət
Yalnız əsərimə vururdu zinət.
Dörd min beytdən də çoxdur bu dastan,
Dörd aydan az vaxta yazmışam, inan!

Əgər başqa işlər olsaydı haram,
Bu, on dörd gecəyə olardı tamam.
Bu azad gəlini görən şad olsun,
Ona abad deyən, qoy abad olsun.
S. F. D. ili idi rəcəbin sonu[46],
Çox gözəl şəkildə bəzədim onu.
Əgər tarixini söyləsəm əyan,
Dörd il keçmiş idi beş yüz həştaddan.
Sənətin əlilə tutdum bəzəyə,
Gətirib oturtdum bu kəcavəyə.
Şahımın mübarək gözündən başqa,
Kimsənin nəzəri dəyməsin ona.

**AXSİTANIN TƏRİFİ**

Sən şahlıq taxtının şahsüvarısan,
Qaranın və ağın hökmdarısan.
Tac sahiblərinin başçısısan sən,
Şahlar ordusunun sərkərdəsisən.
Ey şahlar içində mütləq olan şah!
Ey dünya xaqanı, böyük padişah!
Şöhrətin tutmuşdur bütün mahalı,
Dinin və dövlətin sənsən calalı.
Şahlığın taxtını sənsən saxlayan,
Hökmünə baş əyir bu yer, bu ümman.
Şahların tacısan, Əbülmüzəffər,
Yeddi məmləkətə sən oldun zivər.
Kölgən bir günəşdir, sən alov kimi,
Keyqubad rütbəli Keyxosrov kimi.
Adın Axsitandır, özün söz bilən,
Göydəki günəşin ağasısan sən.
Sən ki, padişahsan, açıq, aşikar,
Gizli xəlifəsən, böyük hökmüdar.
Bu Bəhram nəsəbli, ülkər üzlü sən[47],
Məlik Mənuçehrin sədəf dürrüsən.
Bu tayfa şahlığı nəsildən-nəslə,

Gəlib keçə-keçə oldu silsilə.
Onun şah əcdadı aransa əgər,
Şahdan-şaha gedir Adəmə qədər,
Istərəm, bu böyük şahda daima,
Qılınc uzun olsun, qələmsə qısa.
Daimi bir taxtda o bərqərardır.
Ağıl tək nöqsansız bir hökmüdardır.
O, yeddi göylərə boyun əyməyən
Yeddi ərənlərə qiblədir, bilsən.
Ruzi verən deyil, ruzi göyüdür,
Dünyanın sərdarı, həm böyüyüdür,
Mənalar çeşməsi gözündə qaynar,
Qəlbində göylərin gizli sirri var.
On iki elmin də sirrləri bütün
Əlində mum kimi yumşalır hər gün.
Bu yeddi örtüklü, altı barmaqlı,
Bir gözlü, dörd əlli, doqquz ayaqlı[48],
Onun çəmbərindən çıxmasın deyə,
Qalıb çəmbərində dönmüş həlqəyə.
Adı şirin sulu bir kainatdır,
Varlığı aləmə abi-həyatdır.
Dağılmış mədənlər onun əliylə,
Artmış kərəmindən dənizlər belə.
Bir yandan dünyanı tutur zəfəri,
Bir yandan əfv edir kərəm əlləri.
Cövhərli qılıncdan tutaraq çapar,
Yaxından ötəni vurar, qamçılar.
Bəxtinin burnunda kövsər suyu var,
Onun toppuzundan alovlar qalxar.
O, dünya mülkünə böyük işıqdır,
Məclisə, meydana bir yaraşıqdır.
Mərrixdə bir qılınc, Zöhrədə bir cam,
Sağında, solunda durmuşlar müdam.
Zöhrə şərab verir cam ilə ona,
Mərrix silah alıb düşür ardına.
Qılıncı qaldırır bir ləl dağı,
Camından tökülür ləl bulağı.

Bu iki qan rəngli lələ baxanda,
Ləlin rəngindədir şərab da, qan da.
Sübhün saqisidir onun kərəmi,
Lütfü çox yaşasın, tutsun aləmi.
Düşməni qəhr edən zərbələri var,
Ondan uzaq olsun yaman baxışlar.
Lütfü-səhər yeli, əsər hər yerə,
Əsər, nəfəs verər ağciyərlərə.
Elə bil zərbəsi odlu şimşəkdir,
Toxunsa hər kəsə qəhr edəcəkdir.
Sabah yeli kimi lütfü can verər,
Hicran axşamı tək zərbi öldürər.
Gəlsə hərəkətə şahlıq sancağı,
Deşər polad kimi döşündən dağı.
Bayraq qotazları titrəsə əgər,
Zəlzələ görünər bir arpa qədər.
Belə bir qanun da vardır dünyada:
Od yüksəkdə durur, su aşağıda.
Atı oda bənzər, özü suya, bax,
Bulut od üstündə qərar tutaraq.
Onun qapısında mehtərdir Qeysər,
Fəğfur o qapıda gəlib dilənər[49].
Nə qədər parlasa günəşin üzü,
Şahın məclisində sönükdür, düzü.
Ay ki, bədirlənib, nura bürünər,
O da qapısında solğun görünər.
Uçarmış Arəşin oxu deyirlər,
Ad qəbiləsinin nizəsi qədər[50]
O, ox şahımızla yarışsa əgər,
Kamandan çıxmamış torpağa düşər
Deyirlər, Pərvizin hüsnü, cəmalı
Baxdıqca oxşarmış qəlbi, xəyalı,
Atının tozuyla tutuşsa Pərviz.
Qalmaz camalından zərrə qədər iz.
Kimə şah qılıncı dəydisə bir əl,
Qurtuluş yolunu bağladı əcəl.
Hansı bir zirehə dəydi nizəsi,

Parça-parça oldu bütün həlqəsi.
Atdığı zubinin hər nişanından[51]
Ikiyə bölündü bu iki cahan.
Lütfü parlaq olan bir günəş kimi,
Qəhr edər tufan tək qəzəbi, kini.
Qılığı bir səhər yelidir, gerçək,
Qəzəbi şir tutur göydə günəş tək.
Altı hərfi olan adıyla bilsən,
Dünyanı bağlamış altı tərəfdən[52].
Bu altı hərf ki, şeş atdı yenə,
Düşdü nərd oyunu şahın xeyrinə.
Düşməni milçək tək qaynasa belə,
Tab etməz qəhrindən əsən bir yelə.
Günəşin ordusu boy versə əgər,
Xəlvətə çəkilər qaçar kölgələr.
Atının dırnağı dəyən yerlərdə
Pələnglər, aslanlar görünməz bir də.
Ölümün baratı yağsa oxundan,
Həyat naməsini olmaz oxuyan.
Qınından qılıncı çıxarsa bir əl,
Daşların bağrında qana dönər ləl.
Ağzını açarsa qılıncı bir an,
On-on baş itirər önündə düşman.
Düşmən qarşısında Əfrasiyabdır,
Təkbətək döyüşdə günəşə babdır,
Qoşun kəmərini bağlamamışdan,
Düşməni məhv edər bu mərd Axsitan.
Qoşunu arxadan gələnə qədər
Düşmən ordusundan qoymaz bir nəfər.
Onun rikabında yüz Rüstəm durar,
Yenər qarşısında böyük ordular.
Şahlıq məclisini açıb quranda,
Ilk bahar bulutu görünər onda.
Nə qədər çox olsa orda simü-zər,
Bağışlar hamsını sonuna qədər.
Bir günlük xərcinə qoyduğu maya
Uzun illər boyu alınmaz saya.

Bu şah çanaq-çanaq pullar bağışlar,
Bir də dəstə-dəstə qullar bağışlar.
O camdan ki, Cəmşid qıymaz özünə,
Bəxş edər qullardan hər gün yüzünə.
Hələ yer üzündə yoxdur bir insan
Onun xələtindən geyməsin nişan.
O, müşgü qır kimi paylar hər yana,
Çini bir hədiyyə verər mərdana.
O, bircə fərmanla bir qala alar,
Bircə qəsidəyə ölkə bağışlar.
Hesabsız, ölçüsüz nemətləri var,
Dərya qucağına sığışmaz onlar.
Qəlbi çox genişdir, ora nəzər qıl,
Çınqıllar kimidir əlində qızıl.
Kimin xəzinəsi artsa dünyada,
Şirvanşah puluyla çoxalır o da.
Milçəyi doydursa bizim hökmüdar,
Mahmudun filindən qüvvətli olar[53].
Fil boyda təxtinin sayəsində, bil,
Içilən qədəhi götürməz bir fil.
Şahımız dənizdir, Fəratdır, lakin,
Dəryası axandır, Fəratı sakin.
O gün ki, bar verər böyük hökmüdar.
Ən böyük bir novruz bayramı olar.
Səyindən, bəxtindən yazdım görmədən,
Nə yazım təxtdəki əzəmətindən?
O, dağ arxasından çıxan bir aydır,
Yanında ulduzlar alay-alaydır.
Günəş çeşməsidir böyük hökmüdar,
Onunla canlanır bizim çəmənzar.
Göyün yerə enmiş bir səhəridir,
Allahın mərhəmət şəfəqləridir.
Hər göz ki, o nuru görər cahanda,
O yaman gözlərdən olar amanda.
Yarəb mən ki, Üveys adını aldım,
Məhəmməd eşqinə mən sadiq qaldım[54].
Məhəmməd sifətli o şah həzrəti
Versin xəyalımda olan neməti.

## PADŞAHA XİTAB

Sən, ey can aləmi, ey aləmə can!
Ey insan qəlbini güldürən insan!
Günəşin taxtından tacın ucadır,
Cəmşidin taxtından taxtın qocadır.
Sənin idrakınla dünya abaddır,
Sənə qul olmaqla insan azaddır.
Sənin fərmanınla bütün ölkələr
Azad nəfəs alır, düzdür bu xəbər.
Bir sən əzizlədin bütün dünyanı,
Sənindir dünyanın hökmü, fərmanı,
Islamın bəzəyi olmuşdur xütbən,
Xəlifə puludur sənin bu sikkən.
Biz sənin duanla öpsək torpağı.
Qızıl güllər açar qanqal yarpağı.
Bir sənin sikkəni vursalar daşa,
Qızıl-gümüş olar yer başdan-başa.
Nədir o səndəki şanlı əzəmət?
Keşikçin olmuşdur sənin səadət.
Mehtərin olmuşdur fələk, hər zaman,
Arpa-saman alır o anbarından.
Nədir, mən dediyim bu arpa-saman?
Bu arpa-sünbüldür, saman-kəhkəşan.
Sən səhər yelinin ətrini çaldın,
Bu xoş təbiəti havadan aldın.
Həyat çeşməsidir bu səxavətin,
Dünyanı doydurur sənin dövlətin.
Bu əlvan çiçəkli nazənin bahar
Sənin ayağını öpmək arzular.
Məşriqi, məğribi alan könüllər
Sənin hüzurunda qul olmaq dilər.
Zəfər əli kimi tac bağışlarsan,
Günahı, tanrı tək, sən bağışlarsan
Bu dünya səninlə olmuş bərqərar,
Sənə bütün aləm keşikçi durar.

Sən qabaqda getsən, yol çırağısan,
Arxada qalanda el dayağısan.
İşıqsan yollara məşəllər kimi,
Şəfəqin aydındır son səhər kimi.
Səndədir işlərin hökmü, divanı,
Hökmün dolandırır bütün dünyanı.
Kimsə bu dünyada ən baş hökmüran
Özünü qul sayır qarşında, inan.
Ağlın, iradənin gücü var səndə,
Onlar iş aparır sənin ölkəndə.
Məqsəd nişanəsi yaranmışsa vaxt,
Bir sənə inanıb, sığınır hər vaxt,
Qələbəm düşməni qaçıra bilir,
Bu, sənin sayəndə əldə edilir.
Səndəki göz nuru sayılan sancaq
Dövlətdən, nüsrətdən yaranmış ancaq
Hər kimlə döyüşsən, onu dağlarsan,
Min igid belinə qurşaq bağlarsan.
Onun vücudundan tökülməmiş qan,
Başını qarşında yerə salarsan.
Cahanda hər kimə yetirsən nəzər,
Səadət taxtında gəlib, əyləşər.
Onun taleini sən şad edərsən,
Xarab ölkəsini abad edərsən.
Böyüklük, ucalıq səndədir deyə,
Xoşbəxtlik gətirdin bu Nizamiyə.
O da sarayının keşikçisidir,
Sayəndə özünü bəxtiyar bilir.
Gör, hüma quşunun gülür varlığı,
Sonsuzdur bu quşun bəxtiyarlığı.
Bu quş ki, eşqinlə qidalanır, bil,
Sənin kölgəndədir, pərişan deyil.
Səba quşları ki, ötür hər səhər,
Şahın duasıdır dilində əzbər.
Böyükdür cahanda şöhrətin, namın,
Zəfərdir, fəthdir yalnız məqamın.
Ucalsın calalın, ağ olsun baxtın,

Zəfərlə bəzənsin sarayın, taxtın.
Il boyu şadlanır sayəndə aləm,
Aləm ayrılmasın sayəndən bir dəm.
Səadət daima sənə yar olsun,
Səninlə bir yerdə o da var olsun.
Verirəm dostlara şad xəbəri mən,
Şahın, şahzadənin mərhəmətindən.

## ŞAHZADƏNİN TƏRİFİ VƏ OĞLUMUN ONA TAPŞIRILMASI

Səhərin qırmızı gövhəri erkən
Zülmətdən bir işıq zahir edərkən,
Mənim xəzinəmin gövhəri olan,
O belimdən gələn, qəlbimə sultan
Öz ata tacına gövhərlər saçdı,
Şirvanşah oğlundan mənə söz açdı,
Dedi: - Adamsızam, qırılmaz bağla
Məni şah oğlunun lütfünə bağla.
Qoy onun əhdinə bağlanım bu dəm,
O gənc bir ustaddır, mən öyrənənəm.
Kərəmi kamala yetişən zaman
Dərs alsın o sənin kəlamlarından.
O az yaşlıdırsa, bir hökmüdardır,
Onda yenilməyən iradə vardır.
Vətən göylərinin ulduzudur bu,
Şahın vücududur-ölkənin ruhu.
Yerlərin, göylərin Yusifidir tək,
Zaman vəliəhdi bir odur, gerçək.
Məclisi, büsatı, sevdası yeni,
Padşah Mənuçehrin, bəlkə də, eyni.
Bu iki dünyanın o can sirdaşı,
Ağılda, idrakda şahların başı.
Bu yeddi ölkəyə varis qəhrəman,
Bu dörd gövhərin də sirrini açan.
Böyük insanların gözlərinə nur,

Şahlar namazının qibləsi odur.
O, taca fəxrdir, taxta da zinət,
Üzünə möhtacdır onun səadət.
Şahzadə, güldükcə şərəfin, şanın,
Açıldı gövhəri şah Axsitanın.
Sübhün iki çalan rəngidir rəngin,
Səndə şah qanı var iki ölkənin.
Şahlığın bağında əkilən budur,
Keyqubad nəslinin bir toxumudur.
Şirvan bəzənmişdir əzəmətinlə,
Xozan abadlaşmış ədalətinlə.
Yeddi dairənin mərkəzində tək,
Durub əyləşirsən, sən bir nöqtə tək
Tanrı sayəsində yaşayırsan sən.
O səni saxlasın yaman gözlərdən.
Mənim ümidim var böyük allaha,
Öz zehnin, ağlınla səni bir daha
Göylərə qaldırsın o gülə-gülə,
Çatasan dünyada hər təkamülə.
Şah kitablarını öyrən dərindən,
Dərs al aqillərin dediklərindən.
Sandıqda gizlənmiş xəzinəni sən
Göydə on dörd günlük ay tək görəsən
Bil ki, bu gəlinə yoxdur bir əvəz,
Bu canı heç bir əhd yarada bilməz.
Onun atasını görə bilməsən,
Barı qardaşına hörmət saxla sən[55].
Min bir nəvazişlə gətir yadına,
Əbədi bir hörmət bəslə adına.
Qoy oğlum heç kəsə möhtac olmasın,
Heç kəsin əlində gözü qalmasın.
Bununla qurtardım bu hekayəti,
Olsun səadətin şahın dövləti.
O göz, bu işıqla parlasın ancaq,
Bu sərv o çəməndən düşməsin uzaq.
Şaha arxalanmış sənin surətin,
Düşmənin belini qırmış qüvvətin.

Həyat bulağıyla Xızır yaşadı,
Səninlə yaşasın şahlığın adı.
Göydə nə qədər ki, səyyarələr var,
Bu iki vücuddan işıq alsınlar.

**MƏNİ İNKAR EDƏNLƏRDƏN ŞİKAYƏT**

Coşmaq zamanıdır, coş, ey könül, sən,
Dünyaya dil verən dinməyir nədən?
Gəldi söz meydanı, mənəm sənətkar,
Bu gün məndən gözəl söz deyənmi var?
Əlimin muzduyla dolanıram mən,
Calalım yaranır söz xəzinəmdən.
Bu səhər sehrini yaradan zaman,
Bütün yeddi fəsli dedim qurandan.
Bu halal, bu açıq sehrə baxın siz,
Günahdır bu sehri danmaq, şübhəsiz.
Bu söz sənətində elə kamiləm
Ki, qeyb ayinəsi adımdır bu dəm.
Mənim dil qılıncım iti füsunkar,
Isa möcüzündən onda nişan var.
Nəzmimdə nə qədər mənim əsər var
Lal gər eşidərsə onu, dil açar.
Alışar göz kimi sözüm qızanda,
Barmaq toxundurma, alov var onda.
Arxımdan su içdi şerlə sənət,
Mənlə şöhrət tapdı sözdəki qüvvət.
Bu qarın otaran duzsuz şairlər
Sayəmdə dünyanı basıb yedilər.
Şikarı tutmağa aslan gərəkdir,
Tülkünün işi də müftə yeməkdir.
Mənim öz nəfsimə yeməyimdənsə,
Qoy məndən yesinlər, verib səs-səsə.
Paxıl! Göz yumaraq açıq nemətə,
Saqqız çeynəyirsən, girib xəlvətə.
Ey mənim yazımın oğrusu insan,

Qarşımda kölgə tək çox alçalırsan.
Mən qəzəl deməyi edəndə peşə,
O da zurnasını çalar həmişə.
Mən hər gün düzəndə xoş qəsidələr,
O da quraşdırır boş qəlidələr.
Hədərən-pədərən dilinə bax bir,
Yenə də nəzm ilə hekayə deyir.
Mən yaxşı qalıbda sikkə vururam,
O da, döyəşdəyir, qəlp çıxır müdam.
Meymun da yamsılar, bu deyil hünər,
Bulanlıq suda da ulduz görünər.
Gözlər işıqlanır hər əsərimdən,
Lakin o incikdir kölgələrimdən.
Bəllidir, insanı kölgə yamsılar,
Kölgədən də betər kölgələrim var.
Yamsılar, yamsılar utanmaz bir az,
Çünki gözü görməz, üzü utanmaz.
Kölgəsi olmayan peyğəmbər belə
Təqib edilmişdir bu kölgələrlə.
Mühit dənizində pakdırsa sular,
Itin seliyindən nə qorxusu var.
Sarı qulaqları düşündükcə mən
Coşub qızıramsa bəzən hirsimdən,
Sahili yusam da, sanki bir dəniz,
Bunu acığımdan zənn etməyiniz.
Çıraq tək aldığım sərt bir zərbədən
Şam tək gülümsəyib sönürəm bəzən,
Mən ki, ayna kimi dəmir deyiləm[56],
Ürəyi daşlara olmaram həmdəm.
Xəzinə qazsam da, bir kişiyəm mən,
Düşmən can çəkişir mənim dərdimdən.
Sənətimi danan bir də sağalmaz,
Çarşənbə cinlisi ağıllı olmaz[57].
Qapımın oğrusu haqq əvəzinə
Mənim qeybətimi danışır yenə.
Evin sahibini görən oğrular
Haray qopardaraq deyir: "Oğru var".

Malım doyursa da ac oğruları,
Pis söz deməsinlər haqqımda barı.
Hünəri görsə də etiraf etməz,
Pis yolu buraxıb yaxşıya getməz.
O, gözsüz yaşasın gözsüzsə əgər,
Korsa açılmasın bir də o gözlər.
Oğurlayan odur, utanansa mən,
Oğurluq şöhrətdir ona əzəldən.
Yox, yox, alçaqlığa qurşandı murdar,
Qapını aç ona de ki: "Gəl, apar".
Onun ki, qazancı oğurluqdur tək,
Neylərdim, olsaydım mən də onun tək.
Bu iki aləmin xəznəsi məndə,
Nolar bir müflisə bir pay verəndə;
Borcumdur gədaya sadağa vermək,
Açıq almayanda, o çalsın gərək.
Xəzinəm yer altı, dürrümsə ümman,
Nə üçün inciyim lağım atandan?
Xəzinə sandıqda saxlana bilər,
Gözəl üzərliklə bəslənib gülər[58].
Mənə anam verdi bu xəzinəni,
Üzərlik üstündə mərd doğdu məni.
Baxsan Nizaminin çizgisinə sən,
Min bir ad sayını orda görərsən.
Ilyasın "əlf"ini, "lam"ından kəssən.
Yenə doxsan doqquz tamı görərsən[59].
Dayanmış dövrəmdə bu minbir hasar,
Yüzdən də bir əskik qaravulçum var.
Zəhmətə düşməkdən azadam hər an,
Qorxmayır xəzinəm heç bir oğrudan.
Bir xəzinənin ki, bu hasarı var,
Ona neyləyəcək lağım atanlar?
Lakin, xəzinələr olmaz ilansız,
Yoxdur bu dünyada bir gül tikansız.
Kim ki, ad qoymuşdur qoca dünyada,
Onu öz dostları vermişdir bada.
Ay üzlü Yusifi yad edin barı,

Ona quyu qazdı öz qardaşları.
İsa ki, insanlıq elmində təkdi,
Hər bir yəhudidən cəfalar çəkdi.
Əhməd ki, rəhbəri oldu ərəbin
Gördü cəfasını Əbüləhəbin[60]
Əzəldən dünyanın bir qaydası var:
Bal tutan barmağı arılar sancar.

**ŞİKAYƏTİN ÜZRÜ**

Mən, mən olan gündən, şahiddir aləm,
Bir qarışqanı da incitməmişəm.
Dürrümü çəkmədim özgə suyuna[61],
Pislik yaratmadım, düşmənəm buna.
Təmizdir vicdanım, ucadır adım,
Itin də haqqında pis danışmadım.
Şir kimi qızdırsa məni köpəklər,
"Eyb etməz" deyərəm, basılmaz hünər.
Yaxşıydı hirsimi gizləsəydim mən,
Bu dediklərimi deməsəydim mən.
Lakin, ariflərin zəndinə bax bir,
Dilsizlik, dünyada qeyrətsizlikdir.
Bir insan şəhərdən olsa xəbərdar,
Bilər ki, hardandır bizim mətahlar.
Kim ki, mənə qarşı bir əl qaldırar,
Onun məndən başqa düşməni də var.
Ey könül! Bu kəskin sözlərdən əl çək,
Qəm piyaləsini öz başına çək!
Gül kimi, köçməyin təblini vur sən,
Kim qoparsa səni, öp əllərindən.
Qanını çörəynə yavanlıq elə,
Papağı dik saxla, baş getsə belə.
Zülmə döz, incitmə heç də özgəni,
Ellər qəm çəkincə, dərd alsın səni.

## OĞLUM MƏHƏMMƏDƏ NƏSİHƏT

Sən, ey on dörd yaşlım, hər elmə yetkin!
Gözündə əksi var iki aləmin!
Yeddi yaşar oldun o zaman ki, sən,
Açıldın gül kimi, güləndə çəmən.
Indi ki, çatmışdır yaşın on dördə,
Başın sərv kimi durur göylərdə.
Qəflətdə oynama, qeyrət vaxtıdır,
Indi hünər vaxtı, şöhrət vaxtıdır.
Ucalmaq istəsən, bir kamala çat,
Kamala ehtiram göstərər həyat.
Uşaqkən əslini sorsalar bir az,
Ağac bar verəndə cinsi sorulmaz!
Elə ki, böyüdün, belədir qayda,
Atanın adından sənə nə fayda?
Sən, aslanlar kimi, keç cəbhələrdən
Yalnız hünərinin balası ol sən!
Səadət kamalla yetişir başa,
Xalqa hörmət elə, ədəblə yaşa.
Başına əfsanə düşdüyü zaman
Allah qorxusunu unutma bir an.
Öz adına layiq işlər gör ki, sən
Axırda utanma xəcalətindən.
Oğul, sözlərimə yaxşı qulaq as!
Ata nəsihəti faydasız olmaz.
Görürəm, şöhrətdə ləyaqətin var,
Şerdə, sənətdə məharətin var.
Şairlik eləmə! Dövrə bax ki, bir,
Tərif əvəzinə pislənir şer.
Şerdən ucalıq umma dünyada,
Çünki Nizamiylə qurtardı o da.
Hərçəndi sənətin çox rütbəsi var,
Həyata faydalı bir elim axtar.
Bu əyri çizgilər cədvəlində sən
Özünü şərh edib, özünü öyrən!

Ol öz vicdanının sirrinə açar,
Çünki bu mərifət qəlbə nur saçar.
Elmlər elmidir demiş peyğəmbər
Din elmi, təbabət elmi müxtəsər.
Göbəkdəki ətri bu iki elmin
Fəqihlə təbibdir bunu bil yəqin.
Fəqih olsan əgər itaətkar ol,
Hiylədən, riyadan daim kənar ol.
İsa mərifətli həkim ol, amma,
İnsanı öldürən bir həkim olma.
Həm həkim, həm fəqih olsan sən, əgər,
Hamının yanında adın yüksələr.
Həyat da, ölüm də qul olar sana,
Səadət və şöhrət düşər payına.
Bir elim öyrənmək istədikdə sən
Çalış ki, hər şeyi kamil biləsən.
Kamil bir palançı olsa da insan,
Yaxşıdır yarımçıq papaqçılıqdan.
Məndən söyləməkdir, səndən eşitmək,
Bir insan əliboş gəzməsin gərək.

## AZ DANIŞMAĞIN GÖZƏLLİYİ

Sözün də su kimi lətafəti var,
Hər sözü az demək daha xoş olar.
Bir inci saflığı varsa da suda,
Artıq içiləndə dərd verir su da.
Inci tək sözlər seç, az danış, az din,
Qoy az sözlərinlə dünya bəzənsin.
Az sözün inci tək mənası solmaz,
Çox sözün kərpic tək qiyməti olmaz.
Əsli təmiz olan saf mirvarılar
Suya və torpağa min bəzək vurar.
Mədənlə dolsa da hər bir xəzinə,
Hər kiçik zərrəsi dərmandır yenə.
Ürəyi oxşayan bir dəstə çiçək

Yüz xırman otundan yaxşıdır gerçək!
Yüz ulduz yansa da göylərdə, inan,
Bir günə baş əymək xoşdur onlardan.
Göydə parlasa da nə qədər ıldız,
Günəşdir nur verən aləmə yalnız.

**ÖLƏN QOHUMLARIMDAN XATİRƏLƏR**

Saqi, harda qaldın? Mən meypərəstəm!
Doldur piyaləni, onsuz da məstəm!
O, göz yaşım kimi saf olan şərab
Aşiq məzhəbində sayılır səvab!
Onu bu umudla içirəm ki, mən,
Qurtara könlümü dərddən, ələmdən.
Yolumun üstündə duran şirə bax,
O şir-qəm şiridir, onu azdıraq.
Əzəllər həmdəmim olardı şadlıq,
O adam deyiləm, deyiləm artıq.
Bu gün də əlimdən çıxsa o dildar,
Daha da pis günlər qismətim olar.
Saqi, ver şərabı, dərdimə bir qal!
Söz mənim oduma nal atmışdır, nal[62]!
Ver o şərabı ki, açardır, işə,
Ruh ilə ruh kimi girir sazişə!

**ATAMIN XATİRƏSİ**

Atam Yusif ibni Zəki Müəyyid
Babam tək dünyanı tərk edib getdi.
Dövranın işidir nə etməliyəm
Nə üçün ağlayım, deyildir sitəm.
Atalar yolunu çox gördüyümdən,
Öz ata qəlbimi qopardım ki, mən,
Ölüm tikanından süzülən zəhər
Canıma yerisin, ərisin qəmlər.

Saqi! Şərab ver ki, şirindir candan,
Xıltı təmizləsin, çıxarsın qandan.
Bir şərab gətir ki, onu içsə lal,
O da nitqə gəlsin, dil açsın dərhal.

**ANAM RƏİSƏNİN XATİRƏSİ**

Kürd qızı anam da bizi tərk etdi,
Bir ana qəlbiylə dünyadan getdi.
Nə qədər ağlayıb, yansa da ürək,
Anama dil verən varmıdır, görək?
Çəkməklə qurtarmaz bu dərdi insan,
Bu girdab dərindir insan boyundan.
Daşmışdır ələmin, qəmin kasası,
Bu qəm min nəfəsə içilər, azı.
Bu ucsuz, bucaqsız dərd ölkəsinə
Dərdi unutmaqdır bir əlac yenə.
Saqi! Şərab ver ki, mənzil uzaqdır,
Xəyalım bu yolda yorulacaqdır.
Bir şərab gətir ki, başa şur gəlsin,
Hər addım başında min baş yüksəlsin.

**DAYIM XACƏ ÖMƏRİN XATİRƏSİ**

Xacə Ömər dayım ölüb gedəndə,
Düşdüm müsibətə, bəlaya mən də.
Bu acı tikənin acılığından
Ahım boğazımda qurudu, inan.
Ağlamam, fələkdən qorxum var, deyə,
Qorxuram, dayımın ruhu inciyə.
Saqi! Meyxananın şərab küpündən
Nargilə rəngində şərab ver ki, sən,
Onda dəniz boyda səxavət olsun,
Behişt şərbəti tək bir şərbət olsun.

## KEÇMİŞ MÜSAHİBLƏRİN XATİRƏSİ VƏ BAŞQALARI İLƏ MÜSAHİBLİK

Yetməzmi dostlardan vurduğum dəmlər?
Hanı o mən deyən dostlar, həmdəmlər?
Xurmanın şirəylə şadlanmağı var,
Xurma yoldaşlıqla şirə yaradar[63].
Bir də ipək taclı barama qurdu
Tacını yoldaşlıq əliylə qurdu.
Qarışqa birliklə göstərər hünər,
Özündən çox böyük şeylər sürüyər.
Dostluqda hər kimlə səsləşə bilsən,
Onun pərdəsində nəğməni çal sən.
Bu dar nəğməciyin öz pərdəsi var,
Ahəngi bilməsən, dolaşıq çalar.
Yalnız ipək deyil Çində toxunan,
Gah qumaş, gah həsir toxuyur insan.
Işə kömək etsə təmkinlik, əgər,
Sonunda daima işlər düzələr.
Bir çalğı tutmasa nəğməyə ahəng,
Nəğmə çalınsa da tez kəsiləcək.
Saqi! Ətir iyli şərab gətir sən,
Gəl aç bu zənciri mən çarəsizdən.
Bir şərab gətir ki, can şirəsidir,
Gənclik küzəsinin yetirməsidir.

## VÜCUDU UNUTMAQ

Torpaqla örtülən bir ev üçün sən
Çoxmu qan udaraq, ah çəkəcəksən?
Hörümçək torudur o açıq-aşkar,
Gah yara bağlayar, gah da qanadar[64].
Bəzən bir milçəyin yolunu kəsər,
Bəzən də bir əlin qanını kəsər.
Bağlasan bu evi baramalar tək,

Rahatca yatarsan yatağında tək.
Günahla doludur bu can evi, bil,
Onun da dövranı çox sürən deyil...
Saqi! Nə şərabdan, nə kefdən əl çək!
Bu acı şərabla şirin kef çəkək!
Bir şərab gətir ki, içəndə dərhal
Bilinsin kimdədir idrakla kamal!

## ŞÖHRƏTİ UNUTMAQ

İlan tək dikbaşlı gəzmə, ey insan!
Aşacaq dünyanın seli başından.
Yeddi başın olsa, əъdəhalar tək,
Onun yeddisi də yerə düşəcək.
Çox da yüksəkliyə ucalma ki, sən
Torpağa düşəndə inciməyəsən.
Nə qədər alçaqdan yıxılsa adam,
O qədər ağrısı az olur müdam.
Dünyada yer kimi ağır dolansan,
Üç gövhər arxanda qalacaq, inan!
Bütün gövhərlərin rəngi parlaqdır,
Hamsından xoş gələn yenə torpaqdır,
Torpaqda gizlidir o üç yoldaş da,
Yenə də torpaq var o üç yoldaşda.
Saqi, lalə rəngli bir şərab yetir!
Qarşıma çəng ilə bir badə gətir!
Onunla sabahın üzü şad olur,
Onunla ruh evi tez abad olur.

## KEÇƏN ÖMRÜ UNUTMAQ

Yenəmi dərd çəkim sabahki qəmdən?
Görüb bildiyimi danışmayım mən?
Keçən günlərin də adını az tut,
Yaxşısı budur ki, bir dəfə unut!

Bir qəlyanaltıydı keçən ömürlər.
Indi o keçmişdən qalmamış əsər.
Onları köhnə bir səhifə düşün,
Dünən yazılmışlar yazılmaz bu gün.
Tutaq ki, yeddi göy, yeddi yeri sən
Yeddi min il qalıb, bildin əzbərdən;
Axıra çatsa da bu yeddi min il,
Dünyanın axırı görünən deyil.
Uzun da, qısa da olsa qəddimiz,
Yenə də ölməyə yaranmışıq biz.
Saqi, piyaləni ver səhər-səhər!
İçməmiş məst olum, mən üzügülər.
O şərab gün kimi şölələr salsın,
Qurumuş çeşmələr ondan su alsın.

**ALÇAQLIĞI VƏ YALTAQLIĞI RƏDD ETMƏK**

Buz kimi donmaqdan gəl götür sən əl,
Ölü siçan kimi suda axma gəl.
Gül kimi yumşaqlıq göstərmə, gerçək,
Olma ikiüzlü, bənəfşələr tək.
Tikan olmağın da öz məqamı var,
Yerli dəlilik də işə yarayar.
Bir kürdün eşşəyi Kəbədə itdi,
Kürd haray qoparıb bir sual etdi:
"Bura ki, insansız boş səhralardır,
Eşşək yoxa çıxdı, nə hekmət vardır?"
Deyib, arxasına baxdığı zaman
Gördü eşşəyini, güldü şadlıqdan.
Dedi: "Ortalıqda itmişdi eşşək,
Mənim hay-küyümdən tapıldı bişək!"
Kürd qoparmasaydı hay-haray, əgər,
Nə eşşək qalardı, nə yükdən əsər.
Huşsuzlar qalası dünyaya bax bir,
Daima zalıma mükafat verir.

Ömrü başa vurar şir ürəklilər,
Öküz ürəklidə olmaz bir hünər.
Saqi, şərabı ver, sən ol köməyim!
Bir su tök, od tutub yansın ürəyim!
Ver o şərabı ki, yuduqca daşı
Parladıb eyləsin bir yaqut qaşı.

**ZÜLMƏ QATLAŞMAMAQ**

Neçin alçaqlara boyun əyirsən?
Oyuncaq olursan namərdlərə sən?
Nə üçün boynuna min yük alırsan?
Zalımın zülmündən razı qalırsan?
Qəlbi yumşaqlığı bir dəfə unut,
Çiynini dağ kimi ucalıqda tut!
Sən də süsən kimi ipəkdən olsan,
Səni saf torpaq da yaralar, inan!
Zəlillik ürəyə ağrılar salar,
Zülmə dözənlərin sonu olar xar.
Tikan tək çiynində tut yarağını,
O vaxt qucaqlarsan gül budağını.
İnsanı sarsıdar göz yaşı, nalə,
Ah çəkib, of deyən yetməz kəmalə!
Saqi, zaman keçir, durma, qardaşım!
Şərab ver, doludur fikirlə başım!
O, bir çıraq olsun yolçu keçəndə,
Gəncləşsin qocalar onu içəndə.

**PAHŞAHLARIN QULLUĞUNU TƏRK ETMƏK**

Bir-iki rind ilə get müsahib ol,
Axtar bu dünyada qürursuz bir yol.
Zərrəylə dur otur, gün işığı tək,
Cəmşid sarayının fikrindən əl çək!
Padişah puluna tikmə gözünü,

Qanun kəməndinə salma özünü!
Şahlar məclisindən kənar ol, kənar!
Pambıq od görəndə alışıb yanar.
O od doludursa işıqla əgər,
Ondan uzaq olan asudə gəzər.
Işıq alırdısa pərvanə şamdan,
Yandı məclisinə düşdüyü zaman.
Saqi! Şərab gətir, könüldə qəm var,
Şərabla qəmləri dağıtmaq olar.
Ver o şərabı ki, safdır gümüş tək,
Onunla qəmlərdən qurtarır ürək.

## İNSANLARIN İŞİNƏ VƏ RUZİSİNƏ ƏL UZATMAMAQ

Razı qal cahanda öz qismətindən,
Özgənin haqqını çeynəmə gəl sən.
Bir də ayağını öz yorğanından
Artıq uzadanlar bədbəxtdir, inan.
Bir quş ki, həddindən artıq ucalar,
Özünü fəlakət yoluna salar.
Ilan düz getməsə yoluyla əgər,
Özünə sarılıb, dolaşıq düşər.
Silaha sarılsa bir zahid axmaq.
Onun qazandığı sillə olacaq.
Aslanla döyüşə çıxsa tülkülər,
Bilinər kimdədir qılıncla hünər.
Saqi! Baş qızdıran şərab ver görək.
Piyalən hər zövqü oxşasın gərək!
Bir şərab gətir ki, qəlb açsın yenə,
Can versin Keyqubad xəzinəsinə.

## ŞADLIQ VƏ QƏNAƏT

Şadlığı bir yaşat təbiətinlə,
Şad ol öz qismətin, öz nemətinlə.
Insanlardan başqa bütün canlılar
Qənaət evində tutmuşdur qərar.
Ruzi arxasınca onlar da qoşar,
Nə tapsa, onunla keçinib yaşar.
Ruzi olmasa da kifayət qədər,
Nə küsər, nə də ki, şikayət edər.
Yalnız insan oğlu doymayan zaman
Şikayət sədası ucalar ondan.
Əlindən tikəsi itsə bir kərə,
Naləsi, fəryadı çıxar göylərə.
Düşəndə damına bir damcı yağış,
Buludu töhmətlər, dilində qarğış.
Insan daşa tutar günəşi yerdən,
Ona arpa boyda daş dəysə birdən.
Çalış, işıq kimi ap-ağ olasan!
Pisdən və yaxşıdan uzaq olasan!
Su kimi aləmə həyat ver, can ver,
Hər rəngə uyğunlaş, dərdə dərman ver!
Saqi! Bəhanəni ortadan götür,
Zərdüştü, şərabı məclisə gətir.
O mey ki, məclisə işrət bəxş edər,
Döyüşdə silaha qüvvət bəxş edər.

## ŞADLIQLA XALQA XİDMƏT ETMƏK

Bir daş deyilsənsə, donub qalma sən,
Çolaq deyilsənsə, diribaş tərpən!
Keçənin üstünə vur ayağını,
Təmizlə keçənin toz-torpağını.
Daş-kəsək olsa da, keçdiyin bu yol,
Rəqsində oynağan fələk kimi ol!

Bağışla atını, sən get piyada,
Sillələr yesən də, mərd ol dünyada.
Bacarsan hamının yükünü sən çək,
İnsana ən böyük şərəfdir kömək.
Sən də əldən düşüb yorulsan əgər,
Sənin də yükünü bütün el çəkər.
Saqi, tünd qırmızı şərabdan gətir!
Mənə həyat verib, murada yetir!
Bir şərab gətir ki, canıma sinsin,
Ömür təzələnsin, könül bəzənsin!

## TƏVAZÖKAR OL!

Şikayət torundan çıx bundan belə,
Öz acizliyini etiraf elə!
Çıxılmaz bir dağdır-yoldaki əngəl,
Çox da öz gücünə arxalanma gəl!
Qalxanı deşilmiş bir gül ilə sən
Çoxmu bülbül kimi öyünəcəksən?
Yol qanad qırandır, neyləsin qanad?
Qılınc qüvvəlidir, qalxanını at,
Taki yüklü atın uçsun gülək tək,
Qoy sənin payını artırsın fələk.
Yaxşısı budur ki, atı da tərk et,
Doğru bir yol tapıb, o yol ilə get.
Bax ki, ay hilala döndüyü zaman
Canını qurtarır parçalanmaqdan.
Saqi, can boğaza dayandı, tez çat!
Şərab qətrəsiylə ağzımı islat!
Bir şərab gətir ki, içməmiş candır,
İçəndən sonrasa, cana dərmandır.

## XƏLVƏTƏ ÇƏKİLİB SÖZ YARATMAQ

Arxayın oturma, köç vaxtıdır, qalx!
Sən bu çaş gözünlə özünə az bax!
Mənzilin çətindir, ayağın qabar,
Bəs bu iş nə olsun, de, ey sənətkar!
Ya çıx bir dəfəlik söz meydanından,
Ya bağla qapını, gəlməsin zaman!
Söhbət ki, qılıncı qınında saxlar,
Sən də xəlvətcə tut qınında qərar.
Boş səhifələrmi oldu həmdəmin?
Çoxmu susuz yerdə üzəcək gəmin?
Nizami, bu yolda Xızır kimi dur!
Hər bulaq başında bir söz çadrı qur!
Məcnun sövdasının sər çeşməsindən
Iç, doy sədəfdəki inci kimi sən.

## DASTANIN BAŞLANĞICI

Bu söz incisini düzən zaman mən,
Böylə danışmışdı bu nəqli deyən:
Ərəb torpağında bir kişi varmış,
Şöhrəti, hörməti aşıb daşarmış.
O imiş başçısı Amirilərin,
Abadmış torpağı olduğu yerin.
Yel kimi əsdikcə şöhrəti, sanı,
Ətirlə yuyarmış Ərəbistanı.
Insanlıq elmində bolmuş hünəri,
Heyrətə salarmış o, dünyaləri.
Ondaymış ərəbin hər ixtiyarı.
Qaruna bənzərmiş dövləti, varı.
Fəqirlər, qonaqlar razıydı ondan,
Bəxti çıxmamışdı öz qabığından.
O, bir xəlifə tək məşhur olsa da,
Övladsız, işıqsız bir şamdı o da.

Sədəfdən daha çox oğul arardı,
Dənsiz sünbül kimi dən arzulardı.
Deyərdi, bəxt gəlib imdada çatsın,
Onun da ağacı bir budaq atsın.
Özü sərv kimi qopsa kökündən,
Başqa sərv boy atsın onun mülkündən.
Laçın qanad çalıb, gəlsə çəmənə,
O sərvin yerində sərv görsün yenə.
Köhnə olmasa da, qoy sevə-sevə
Otursun bu təzə, kölgəli sərvə.
Insan bu dünyada daimi yaşar,
Yurdunda bir övlad qalsa yadigar.
Məcnunun atası bu xoş diləklə
Aclar doydurardı min bir köməklə.
Nəzirlə bir oğul istərdi tez-gec,
Əkdiyi yasəmən göyərməzdi heç.
Gəzdiyi incidən tapmazdı əsər,
Yenə yaşadırdı onu ümidlər.
Bilməzdi bu nədir, bu nə hekmətdir?
Bu gec yaranmaq da bir məsləhətdir.
Cahanda məqsədə nail olmasan,
Bunda da sirr var, məna var, inan!
Qarşıya çıxsa da hər yaxşı, hər pis,
Işin xeyrinədir, diqqət etsəniz.
Tapmaq istədiyin çox şeylər də var,
Onları tapmasan, daha xoş olar!
Ürəkdən arzular keçsə də bir-bir,
Çoxunu gizləmək daha gözəldir.
"Olsun!", "olsun!" deyir dünyada hər kəs,
Yoxdur məsləhəti bilən bir nəfəs.
Bu sirrin nə ilki, nə sonu vardır,
Qıfıl zənn etdiyin özü açardır.
Bədbəxt yaratmışdır insanı fələk,
Onu torpaq kimi sovurar külək.
Belə bir aləmi şadlıqla yaşat,
Ömrün arzusunu torpaqlara qat!
Övlad arzusuyla yanırdı qəlbi,

Ləl üçün sıxılan bir mədən kimi.
Onun naləsini eşitdi allah,
Ona da bir oğul verdi bir sabah.
O, nar kimi gülər, çiçək kimi şən,
Min dəfə gözəldi nardan və güldən.
Onda gövhər üzlü bir sifət vardı,
Gecə, o sifətdən gündüz olardı.
Ata baxan kimi oğlun üzünə,
Açdı xəzinəni ellər üzünə.
Belindən gələni görüb dünyada,
Gül kimi xəzinə payladı o da[65].
Bir müddət dayələr göz oldu buna,
Süd verdi ərəbin bu ilk oğluna.
Zamana, mehriban dayələr kimi,
Məhəbbət südüylə onu bəslədi.
Onun dodağına hər damla süddən
Bir vəfa kəlməsi yazıldı bilsən!
Verilən mayədən körpəcik doydu,
Köksünə bir dostluq ürəyi qoydu.
Üzünə nil alıb çəkdikdə onun,
Oxundu ona bir könüldən əfsun.
Lalə tək ağzını südlə islatdı,
Səmən yarpağı tək südlə boy atdı.
O, süd içindəki bala dönürdü,
Sanasan beşikdə ay görünürdü.
Boy atıb, ikicə həftəyə doldu,
Lap on dörd gecəlik ay kimi oldu.
Bilindi ondakı hünərlə vüqar,
Adını hünərli Qeys qoydular.
Güldü bir yaşında gözəl camalı,
Camala can verdi onun kamalı.
Suvardı körpəni eşqin əlləri,
Üzündə parladı sövda gövhəri.
Şadlıqla iki-üç yaşına çatdı,
Öz könül bağında azad boy atdı.
O, yetişən kimi yeddi yaşına,
Düzüldü bənəfşə, lalə başına[66].

Böyüyüb on yaşa çatandan bəri
Oldu gözəlliyi dillər əzbəri.
Kim onun üzünü görsə uzaqdan,
Ona can sağlığı dilərdi haqdan.
Atası gördükdə, gülüb sevindi,
Məktəbə yolladı oğlunu indi.
Bilikli alimdən istədi kömək
Ona gecə-gündüz sərf etsin əmək.
Ona yoldaş oldu bir bölük uşaq,
Sən bir onlardakı səadətə bax!
Hər uşaqda qorxu və ümid vardı,
Dərsinə, elminə can yandırardı.
Xırda oğlanlarla, qızlar-yanaşı
Hamısı olmuşdu sıra yoldaşı.
Hərəsi bir yerdən, bir qəbilədən,
Bu ədəb evində, öyrənirdi fənn.
Qeysin elm işində vardı hünəri,
Dodağı saçardı söz inciləri.
Orada bakirə bir inci vardı,
Sırada Qeys ilə bir oturardı.
Hələ saf qalmışdı o gözəl dilbər,
Kamalı olmuşdu dillərdə əzbər.
Camalı ay kimi, süd işıqlıydı,
Boyu, sərv kimi, yaraşıqlıydı.
Qəmzə xəncərini çəksəydi əgər,
Min sinə deşərdi o nazlı dilbər.
Ahu gözlərini süzsəydi bir an,
Yanıb məhv olardı bütün bir cahan.
Ərəb ayı kimi sifəti vardı,
Əcəm türkü kimi könül ovlardı.
Saçları gecəydi, camalı bir bağ,
Sanki qara qarğa tutmuşdu çırağ[67].
Lələ bəzənmişdi püstəcik ağzı,
Şəkər dodaqlıydı o ellər qızı.
Nə qədər istəsən şəkər qırardı,
Yalnız şəkər deyil, ləşkər qırardı.
Qoynunda bəslərdi qızı gözəllər,

Sevərdi, oxşardı onu ağ əllər.
Dünyanın həyalı bir dilbəriydi,
Gənclik dastanının şah əsəriydi.
Onun mirvarisi-alın təriydi,
Boyun həmaili-hörükləriydi.
Ənliyi anadan gəlmə qırmızı,
Sürməni neylərdi o ellər qızı?
Öpərdi xalını qara telləri,
Zülfünə bağlıydı camal gövhəri.
Bir ona düşmüşdü hamının meyli,
Zülfü də "leyl" idi, adı da Leyli[68].
Qeys onu gördükdə heyrətdə qaldı,
Ona könül verdi, könlünü aldı.
Qeysin bu sevgisi qızı oyatdı,
Könüldən-könülə sevgi boy atdı.
Içdilər ilk eşqin piyaləsini,
Iki can bir qəlbin duydu səsini.
Birinci badənin yaman zəhmi var,
Ilk dəfə yıxılan çox bərk yıxılar.
Onları məst etdi ilk eşqin dadı,
Onları bir yerə sövda bağladı.
Bu ona can verib meylini saldı,
Qəlbini ovladı, can isə qaldı.
O bunun üzünə nəzər salaraq,
Quruca könlünü vermişdi ancaq.
Yoldaşlar elm alıb, dərs oxuyurdu,
Onlar da eşq adlı elmi duyurdu.
Yoldaşlar lüğətdən söz axtarardı,
Onların başqa bir lüğəti vardı.
Yoldaşlar deyirdi addan, sifətdən,
Onlar da eşq adlı bir sərgüzəştdən.
Yoldaşlar elm üçün kitab açardı,
Onlar da eşqdən söhbət açardı.
Hesab öyrəndikcə hər oğlan, hər qız,
Onlar özlərini sayırdı yalnız.

## LEYLİ İLƏ MƏCNUNUN SEVİŞMƏSİ

Hər gün parladıqca sübhün güzgüsü,
Doğardı şərqin də Yusif üzlüsü[69].
Öz reyhan köksünə turuncu fələk
Qızıl bir turuncla verirdi bəzək.
Leyli də bəhs edib turunc fələklə,
Turunc çənəsini alardı ələ.
Turunclu gördükcə xalq o nigarı,
Açıldı eşqinin yetişmiş narı.
O təzə turunca baxdığı zaman
Turunc tək, əlini kəsərdi insan.
Qeys onun turunca bənzər üzündən
Saralıb narınca dönmüşdü bilsən.
Narıncla turuncun ətri dünyada
Dostlar damağını gətirdi dada.
Böyləcə bir müddət gəlib dolandı,
Bu iki nazənin odlara yandı.
Çəkib qılıncını zalım məhəbbət.
Bu gənc ürəkləri eylədi qarət.
Ürək əvəzində qəm verdi yalnız,
Ürəklə səbri də apardı vaxtsız.
Onlar bir-birinə könül verdilər,
Tezcə dildən-dilə düşdü bu xəbər.
Hər yandan yırtıldı bu gizli pərdə,
Bu sirr əzbər oldu bütün dillərdə.
Bu qəmli dastanın sərgüzəştindən
Hər ağız bir parça deyirdi bəzən.
Aşiqlər çalışıb, çox əlləşdilər
Ki, aləm tutmasın bu sirrdən xəbər.
Lakin, bağlansa da ətir şişəsi,
Yenə duyulacaq xoş rayihəsi.
Eşqə məhrəm olan ruzgar, qəflətən
Götürdü pərdəni eşqin üzündən.
Xeyli səy elədi oğlan da, qız da,
Bu sirr dolaşmasın dildə, ağızda.
Bu səyin olmadı faydası bir az.
Günəşi palçıqla qapamaq olmaz.
Göz qəmzə oxunu atsa, aşikar,

Bu sirri pərdəylə örtməkmi olar?
Zülfü min halqalı zəncirsə, əgər
Könül vurulmaqdan başqa nə edər?
Sonra, gələcəkçin sözləşirdilər,
Bəzən oğrun-oğrun gözləşirdilər.
Aşiqlik olalı Qeysin murazı,
Eşqin kəməndinə keçdi boğazı.
Bir qəlb ovçusuydu Qeysin nigarı,
Uçub dağılmışdı səbri, qərarı.
Bəzən, ortalıqda olsa da söhbət,
Yaxırdı qəlbini yenə də möhnət.
Bir gün dərd əlindən yoruldu ürək,
Tüluqlar yırtıldı, yıxıldı eşşək[70].
Eşqdən xəbərsiz adamlar ki, var,
Onu "Məcnun" deyə çağırırdılar.
Biçarə Qeys də əlacsız qaldı,
Bu "Məcnun" sözünü üstünə aldı.
O qədər artdı ki, tənə yarası,
Gizləndi dəlidən o ay parası.
O qədər it kimi hürdü avamlar,
Çəməndən ayrıldı o ahu nigar.
Hicrana dözmədi Leylinin qəlbi,
Axdı göz yaşları incilər kimi.
Məcnun görmədikdə Leylini bəzən,
Bir sel axıdardı hər kirpiyindən.
Gözündə qəm yaşı, ürəyində qəm,
Küçəni, bazarı gəzərdi sərsəm.
Ürək parçalardı onun nəğməsi,
Aşiqlər səsiydi Məcnunun səsi.
Gəzəndə, ardınca bağırardılar,
-Məcnun! Məcnun! - deyə çağırardılar.
O da bu tənədən qəmlər yeyərək,
Pərişan gəzərdi divanələr tək.
O, eşşək sürürdü zəif boyunla,

Eşşəyi də getdi, ip də onunla.
Öz qəlbini bölüb, bənzətdi nara
Ki, Leyli söyləsin "Ey qəlbi para".
Çalışdı, sirrini bilməsin ellər,
Lakin, qəlb oduna kim dözə bilər?
Beyninə sıçradı qəlbinin qanı,
Aşiqin dərdini üzündən tanı.
O, yar dərdindəydi, ondan yar uzaq,
O, qəm içindəydi, qəmküsar uzaq.
Gözünə şam kimi yuxu gəlməzdi,
Gecə də, gündüz də o dincəlməzdi,
Üzürdü canını bu bəla, bu qəm,
Nə bir can dərmanı, nə də bir məlhəm!
Umudla qəsd edir o öz canına,
Başını çırpardı yar eyvanına.
Səhər ayaqyalın, baş açıq, yalnız,
Çöllərə qaçardı o vaxtlı-vaxtsız.
O yarın quluydu, yarsa zindanda,
Bir qəlb döyünürdü o iki canda.
Dilində hər gecə hicran qəzəli,
Pünhan axtarardı nazlı gözəli.
Onun qapısını öpüb hər gecə,
Yenə qayıdardı ordan gizlicə.
Gedəndə yel kimi əsərdi o, bil,
Geri qayıtması çəkərdi bir il.
Gedən baş, quşu da vurub ötərdi,
Gələn baş, yolunda tikan bitərdi.
Gedən baş, sellərə bənzəri vardı.
Gələn baş, yolları çuxur olardı.
Gəzərdi cananı ayağı qabar,
Elə bil altında yorğa bir at var.
Evinə dönəndə deyirdi ürək:
-Qarşımda quyu var, arxamda külək,
Bəxt əl uzatsaydı ona bir yerdə,
O öz yuvasına dönməzdi bir də.

## MƏCNUNUN EŞQİ HAQQINDA

Yuxusuz gözlərin taxtına sultan,
Matəm ordusuna sərkərdə olan,
Sövda yollarının o yalnız səsi,
Aşiqlər mülkünün qəm divanəsi.
Fəryada, naləyə, bəlayə məftun,
Bağdad ellərinin qanunu, Məcnun[71],
O qəm dovulunun təbil sahibi,
Hicran kilsəsinin sövda rahibi,
O aşkar gəzən div, o gizli cadu,
Şeyda aşiqlərin şeyda Harutu,
Bir Keyxosrov olan o tacsız-taxtsız,
O yuz min bədbəxti düşünən baxtsız,
Qarışqa selinə köməkçi duran,
Taxtını ahular belində quran,
Sirrli qələləri fəth edən hünər,
Sahibsiz yerlərə o keşikçi ər,
Qəlbi dəniz kimi daima daşqın,
O məcnun könüllü, sövdalı şaşqın
Iki-üç aşiqə olmuşdu həmdəm,
Onların qəlbində bir bəla, bir qəm,
Sövda yuxusundan qalxıb hər səhər
Leylini görməyə bir gedərdilər.
Məcnunun dilində əzbərdi Leyli,
Başqa heç bir sözə düşməzdi meyli.
Yanında özgə bir ad çəkən olsa,
Onu dinləməzdi, dinməzdi əsla.
Gedib Leyligilin qəbiləsinə
Yurd olan Nəcd adlı dağ sinəsinə,
Məcnun ah çəkərdi, ağlardı zar-zar,
O dağda tutardı daima qərar.
Yıxılıb durardı, sərxoşlar kimi,
Əl çalıb oynardı, dərdi var kimi.
Ürək yandırardı zəngulələri,
Qaçardı gah geri, gah da irəli.

Birdən, ağlar gözdə coşardı dərdi,
O, səba yelinə xitab edərdi:
-Oyan, tezdən oyan, səba yeli, sən!
Get, asıl Leylinin ipək telindən!
Söylə ki: "Eşqindən məhv olan yazıq
Sənin yollarına döşənmiş artıq.
Alır sorağını səba yelindən,
O, daşa torpağa dərd açır bəzən,
Qoy əssin qapından bir elçi ruzgar,
Bir ovuc torpaq ver, ona yadigar.
Səninçin, yel kimi, əsməyən bir kəs,
Inan ki, bir ovuc torpağa dəyməz.
Kim ki, əsirgədi canını səndən,
Can versə yaxşıdır dərddən, qüssədən.
Sənin eşq oduna düşməsəydi can,
Məni aparardı qəm seli çoxdan.
Bir də, gözlərimdən axmasaydı sel,
Qəlbim qəm odundan yanardı tel-tel.
Dünyalar gözəli günəş də, inan,
Alışıb odlanır mənim ahımdan.
Qəlbimin şamısan! Bir düşün məni,
Yaxma eşq oduna öz pərvanəni.
Dağıtmış yuxumu sehirli gözün
Ki, yansın ciyərim, kababa dönsün.
Dərdindən, qəmindən zövq alıram mən,
Bil ki, dərmanım da, dərdim də sənsən!
Qənddir dodaqların, bacarsan əgər,
Ondan aşiqə də bir az pay göndər.
Qoyma ki, ürəyim pərişan olsun,
O qənd dərdlərimə bir dərman olsun!
Gözmü dəydi bizə? Nə oldu ki, mən
Düşdüm birdən-birə sənin gözündən?
Yəqin yaman gözə gəlmişəm ki, mən,
Çıxdı sənin kimi qismət əlimdən
Dünyada çox ləziz, şirin meyvələr
Pis gözə oğrasa torpağa düşər.
Zəmanə barmaqla göstərdi bizi,

Bu yara öldürər hər ikimizi.
Yadlardan yetməsin deyə bədnəzər,
Üzün dövrəsinə nil də çəkərlər[72].
Küsufun gözündən günəş qorxaraq,
Üzünə salmışdır qara bir duvaq.
Xəzinə üstünü örtməsə əgər
Onu bu insanlar tez qarət edər"[73].

## MƏCNUNUN LEYLİNİN TAMAŞASINA GETMƏSİ

İpək paltarını geydi asiman,
Göy öz sırğasını taxdığı zaman.
Ulduzlar civə tək səpələndilər,
Şəfəqdə qalmadı onlardan əsər.
Qəlbi civə kimi dağınıq Məcnun
İki-üç dostuyla yaralı, məhzun,
Şərqilər deyərək, yola düzəldi,
Qaçaraq Leylinin yurduna gəldi.
Səbir kömləyini parçalayaraq,
Canan yollarında inlədi ancaq.
Könül xırmanını dolaşıb yalnız,
Təsəlli gəzirdi o Məcnun baxtsız.
Oxuya-oxuya o, sərxoşlar tək,
Döyürdü başına, üzünə bərk-bərk.
Qüvvədən düşmüşdü o talei kəm,
Yarın çadırına yetişdi sərsəm...
Ərəb adətiylə oturub o qız.
Çadırda yollara baxırdı yalnız.
Leyli bir ah çəkdi, görüb Məcnunu,
Məcnun da fəryadla səslədi onu.
Leyli ulduz kimi çadırda təkdi,
Məcnun sanki pərdə tutan fələkdi.
Leyli duvağını üzündən açdı,
Məcnun gileylənib, dərddən söz açdı,
Leyli çəng tutmuşdu bağrı başında,

Məcnun rübab kimi əli başında[74].
Leyli səhər kimi işıqlanırdı,
Məcnun da şam kimi qəmdən yanırdı.
Leyli bağ içində gözəl bir bağdı,
Məcnun dağ üstündə böyük bir dağdı.
Leyli yaranmışdı ay kimi parlaq,
Məcnun ipək kimi qaraydı ancaq.
Leyli gül saçırdı ağaclara, bax,
Məcnun dürr səpirdi şabaş olaraq[75].
Leylini sormayın, pəriydi o can,
Məcnun bir od idi, nə deyim ondan?
Leyli-qış görməmiş yasəmən kimi,
Məcnun-xəzan vurmuş bir çəmən kimi.
Leyli parlayırdı sübhün qızı tək,
Məcnun da sönürdü dan ulduzu tək.
Leyli dağıtmışdı saçını nazla,
Məcnun qul olmuşdu min iltimasla.
Leyli can bəsləyən şərbət içirdi,
Məcnun yaxa yırtıb, candan keçirdi.
Leyli toxuyurdu qəlbində ipək,
Məcnun alışırdı bir üzərlik tək,
Leyli boy atırdı qızıl gül kimi,
Məcnun ağlayırdı bir bülbül kimi.
Leyli keçirdikcə zülfü şanədən,
Məcnunun göz yaşı axırdı dən-dən.
Leylinin əlində müşkin piyalə,
Məcnun mey ətriylə dalmış xəyalə.
Bunu əyləndirir canan səfası,
Ona xoş gəlirdi aşiq vəfası.
Onları görməsin, deyərək, əğyar,
Qərib tək uzaqdan baxışırdılar.
Bunu da çox gördü onlara zaman,
Quru bir baxış da çıxdı ortadan.

## MƏCNUNUN ATASININ LEYLİYƏ ELÇİ GETMƏSİ

Elə ki, yar yolu bağlandı bir gün,
Arxın körpüsünü kəsdilər bütün.
Məcnun ağlayırdı qəlbində hicran.
Gözünü yummazdı gecələr bir an.
Başından aşdıqca ayrılıq dərdi,
Dilində nəğmələr Nəcdə gedərdi.
Dalınca qaçardı iki-üç nəfər,
Baş açıq gəzərdi o divanələr.
Sövda xəstəsiydi bu aşiq artıq,
Dillər dastanıydı bu rüsvayçılıq.
Şikayət eylərdi qohumlar ondan,
Atası qalmışdı bu dərdə heyran.
Nəsihət verdilər, əməl etmədi,
Əfsanə dedilər, o eşitmədi.
Nəsihət versə də çoxlu mənfəət,
Eşqin meydanında nədir nəsihət?
Zavallı atası gətirməyib tab,
Oğlunun dərdiylə çəkirdi əzab.
Bütün nazlar ilə oynardı, yenə
Bir çarə tapmazdı onun dərdinə.
Bu sirri dostlardan o aldı xəbər,
Dostlar bu mətləbi şərh eylədilər,
"Bir qız həsrətidir bu dərd, bu nəva,
Eşqidən gəlmişdir başına hava".
Ata bu sözlərdən çıxardı qərar,
Dedi: "Gül üzündən silinsin qübar.
O dünya gözəli, dürrü gətirək,
Başımın tacına nəqş edəm gərək.
O gözəl zinəti yüz calalla mən
Alım öz oğluma o qəbilədən".
Bütün ağsaqqallar danışdı bir-bir,
Bu oldu məsləhət, bu oldu tədbir:
"O gözəl tayfanın incisini biz

Bizim bu gövhərə tay etməliyiz".
Bu oldu tayfanın verdiyi qərar,
Səfər paltarında yola çıxsınlar.
Razılıq əliylə kəsilsin kəbin,
Bəlkə bu divanə o aya yetsin.
Elə ki, səsləndi bu şadlıq zəngi,
Açıldı gül kimi atanın rəngi,
Ata dinlədikcə bu məsləhəti,
Dağıldı qəlbindən qəmi, möhnəti.
Böyük bir dəstəylə qalxıb o zaman
Səfər tədarükü gördü hər yandan.
Tamam hazırlaşıb, düzəlişdilər,
Böyük bir calalla yola düşdülər.
Çatdı Leyligilə gedən elçilər,
Böyükdən kiçiyə yetdi bu xəbər.
Hər elin, obanın öz adəti var,
Qonaq gəlir deyə, yola çıxdılar.
Hörmət ayağında durdular möhkəm,
Bütün hədiyyələr verildi o dəm.
Baxıb başçısına amirilərin,
Dedilər: "Gəlməkdən nədir məqsədin?
Danış istəyini, hazırıq biz də
Can-başla dayanaq xidmətinizdə!"
Dedi ki: "Məqsədim-qohum olmaqdır.
Iki gənc gözünə işıq salmaqdır.
- Qızın atasına üz döndərərək,
Qoy birləşsin, - dedi, - bu iki ürək.
Bil ki, məhəbbətlə, kəbinlə səndən
Qızını oğluma istəyirəm mən.
Qumlarda doğulmuş, ciyəri teşnə
Gözünü tikmişdir sənin çeşmənə.
Sərin bulaqlardan kim içsə bir az,
Bir də susuzluqdan ürəyi yanmaz.
Qapına gəlmişəm bu məqsədlə mən,
Xəcalət çəkmirəm dediklərimdən.
Sən özün bilirsən, bilir bu aləm,
Zamanın ən məşhur adamı mənəm.

Mənim xəzinəm də, calalım da var,
Dosta, düşmənə də qüdrətim çatar.
Ağlın başındasa, mətaini sat!
Almağa gəlmişəm, sən də əl uzat!
Nə qədər olsa da onun qiyməti.
Almağa hazıram mən o zinəti.
Sən onu satmağa vergilən qərar,
Dünyada hər şeyin öz bazarı var".
Dinləyib-dinləyib bu iltiması,
Böylə cavab verdi qızın atası:
"Baş tutan deyildir sənin diləyin,
Başqadır qərarı, hökmü fələyin.
Şirin bir dil ilə danışsan da sən,
Əyləşə bilmərəm o atəşlə mən.
Bir dostluq olsa da bu xeyir işdə,
Min ədavət olar bu tərpənişdə.
Nə yaman ərköyün böyümüş oğlun,
Özbaşına gəzir, muğayat olun.
Dalınca "divanə" söyləyir hər kəs,
Bizə divanələr tay ola bilməz.
Əvvəl dua et ki, gəlsin ağıla,
Sonra məhəbbətdən başla nağıla.
Hələ düzəlməmiş sizin o gövhər,
Bu sövda söhbəti verməz bir səmər.
İllətli gövhəri almaz ki, heç kəs,
Eyibli gövhərlər sapa düzülməz,
Gözdən kirpik çəkir bizim ərəblər,
Gülərlər üstümə, dil versəm əgər.
Bir də bu mətləbdən gəl danışma heç,
Söhbəti qurtaraq, bu işdən vaz keç",
Onu amirilər sakit dinlədi,
Atanın qəlbində kaman inlədi...
Qayıtmaqdan başqa bir əlacmı var!
Pərişan olaraq çəkildi onlar.
O yol yorğunları, dil inciklləri
Dərdin dəryasına batandan bəri,
"Bu dərdə bir dərman axtaraq" deyə,

Əlac gətirdilər o divanəyə.
Nəsihət dilinə keçdi hər nəfər
Ancaq od üstünə tikan səpdilər.
"O ruh ovçusundan daha da xumar,
Burda ruh bəsləyən gözəlimiz var.
Bax, yaqut dodaqlı, inci buxaqlı,
Ruha ətir saçan, lalə yanaqlı
Gözəllər, aydan da çox işıqlıdır,
Onlar ilk bahardan yaraşıqlıdır.
Qarşında yüz tanış ola-ola, sən
Nədən yad qızına könül verirsən?
Gəl, bu gözəllərə, cananlara bax,
Səninçin nazəndə bir sənəm alaq.
Oxşasın könlünü o nazlı nigar,
Şəkərə süd kimi uyuşsun o yar.
Canından deyildir, unut Leylini,
Bir də o dilbərə salma meylini".

## LEYLİNİN EŞQİ İLƏ MƏCNUNUN AĞLAYIB SIZLAMASI

Məcnun qohumların yalvarışından
İnciyib daha da oldu pərişan.
Cırdı köynəyini, lüt qaldı bədən,
Dedi ki: "Ölmüşə nə lazım kəfən?
Bu iki aləmə sığmayan bir kəs
Bir can köynəyinə yerləşə bilməz".
Əzraçün Vamiq tək düşmüşdü dərdə,
Gah dağda yaşardı, gah da çöllərdə.
O evdən türk kimi çıxaraq yenə,
Düşdü köçərilik düşərgəsinə.
Geymini yırtaraq, tikdi bir kəfən,
Qırıb zəncirini, çıxdı məhbəsdən.
Döşədək cırılmış halda ətəyi,
Uzaqda gəzirdi qəriblər kimi.
Canına qəsd etmək xəyalı vardı,

O, yalnız oturub, yalnız durardı.
Dəli tək hər evə yaxın gedərdi,
Leyli! Leyli! deyib xitab edərdi.
Ah! O ayaq yalın, bir də baş açıq,
Məlamət yurduna düşmüşdü yazıq.
Istər pislik olsun, istər yaxşılıq
Yamanı yaxşıdan seçməzdi artıq.
Yəmən ulduzunun xəyalilə tək,
Nəğmələr deyərdi, inildəyərək.
Beyitlər axdıqca onun dilindən,
Yadında saxlardı hər gəlib gedən.
Hamı bu matəmə olmuşdu heyran,
Görənlər ağlardı bu hala candan.
O da xəbərsizdi görən gözlərdən,
Dalınca söylənən acı sözlərdən.
Həyat dəftərindən silmişdi eybi,
Yaşardı nə ölü, nə diri kimi.
Qəlbinin başında bir sövda daşı,
Olmuşdu xar kimi daşın sirdaşı.
Altı daş, üstü daş, o əzilərək,
Bədəni bir xılta dönmüşdü, gerçək.
Şam kimi keçinib, o qaralmışdı,
Quş kimi tayından ayrı qalmışdı.
Qəlbinin başında çal-çarpaz dağlar,
Üzünü örtmüşdü tozlar, torpaqlar.
Ələmi, qüssəsi başdan aşaraq,
Insan məclisindən uzaqlaşaraq,
Ah çəkib, ağladı: "Əlacım nədir?-
Dedi, - könül mülkü bir viranədir.
Avara düşmüşəm xanımanımdan,
Məskənim olmuşdur mənim biyaban.
Nə öz qapımıza gedir bu yollar,
Nə də yar yurduna bir cığırım var.
Həyamın şüşəsi, adımın camı
Sındı daş üstündə, eşitdi hamı.
Ah, səadət təblim gedəli bada,
Köç təbli çalıram artıq dünyada.

Gah mənə "bir sərxoş" deyir bu yerlər,
Gah da "bir bütpərəst aşiq" deyirlər.
Öylə zənn etmə ki, bir bütpərəstəm,
Mən torpaqla deyil, gül ilə məstəm.
Olmuşam o türkə çolaq bir şikar.
Oxuna hədəfəm açıq, aşikar.
O yarın quludur bütün varlığım,
Ona can verməkdir bəxtiyarlığım.
Mənə sərxoş desə, neyləməliyəm?
Dəli də söyləsə, yəqin, dəliyəm!
Madam ki, dəliyəm, sərxoşluğum var,
Dəlidən, sərxoşdan ağıl ummazlar.
Elə bir divanə deyiləm ki, mən
Bir də azad olam zəncirlərimdən?
Suyum bərk bulanmış, bir də durulmaz,
Mənim viran könlüm heç abad olmaz.
Kaşki dəli bir yel əssin bir kərə,
Sovursun kül kimi məni göylərə.
Yaxud da şiddətlə ildırım çaxsın,
Evimi, canımı yandırıb, yaxsın.
Odlara salsaydı məni bir insan,
Yanan varlığımdan qalmazdı nişan.
Bir nəhəng ağzına atılsaydım mən,
Dünya qurtarardı xəcalətimdən.
Bəd övlad yaratdı məni zəmanə,
Evdə div oluram, çöldə divanə.
Baxdıqca xar olur qohum-qardaşlar,
Adımdan utanır yaxın yoldaşlar.
Xəstəyəm, qanımı tökən o cəllad
Öz keyfində gəzir qisasdan azad.
Of! Salamat qalın can sirdaşlarım!
Məclis yoldaşlarım, söz yoldaşlarım!
O şərab şüşəsi əlimdən düşdü,
Sınıb parçalandı, yadlar gülüşdü.
Yolumda şüşələr qırılsa da, bax,
Onları, göz yaşım sel tək coşaraq,
Yudu ki, o şüşə qırıntıları

Dostlar ayağına batmasın barı.
Ey mənim dərdimi anlamayanlar
Yolumdan çəkilin, nə işiniz var?
Özümdə deyiləm... məni anmayın,
Itgin bir insanam, mənə yanmayın.
Bəsdir bu zülmünüz, halıma baxın,
Məni öz dərdimlə azad buraxın!
Qovmayın məni siz ana vətəndən,
Onsuz da, qaçmağa atlanmışam mən.
Taqətdən düşmüşəm, əlacım nədir?
Canan! Əlimdən tut, can viranədir!
Sənə könül verən xəstəyəm, ey yar!
Uğrunda ölməyim daha xoş olar.
Bir salam lütf elə, durult suyumu,
Bircə sifarişlə oxşa ruhumu.
Divanə bir mənəm, gizli deyildir,
Bəs sənin boynunda nədir o zəncir?[76]
Canan! O zənciri salma boynuna,
Qoy mən zəncirlənim, layiqəm buna.
Uçurdu könlümü zülfüyün bağı,
Kim öyrətdi sənə bu ev yıxmağı?
Könül ovçusudur o qara saçlar,
Oğrudur saçların, kordur ruzigar...
Ey mənim diləyim, ağzımda dilim!
Əl ver, bu quyudan çıxım, sevgilim!
Ya əlimdən yapış, sevimli canan!
Ya da ki, qoy öpüm ayaqlarından.
Bir kömək əli ver, işsiz oturma!
Əllərin qoynunda bir küncdə durma!
Nədən mənə qarşı mərhəmətsizsən?
Bəs "İrhəm-türhəm"i oxumadın sən?[77]
Dərdlərdən, qəmlərdən azad bir ürək
Özgənin dərdini hardan biləcək?
Toxun ac olandan nə xəbəri var?
Verdiyi çörəyi xırdaca doğrar!
Əlini vurmasa oda bir nəfər,
Odun istisini necə hiss edər?

Sevgilim! İnsanıq ikimiz də, bax:
Mən tikan koluyam, sən şümşad budaq.
Qızılı zırnıxdan seçərək, tanı,
Onun bir misqalı, bunun batmanı.
Hardasan, ey mənim dərdimə dərman?
Nə üçün can almaq xəyalındasan?
Şikəstə könlümün nədir pənahı?
Səni sevməkmidir onun günahı?
Nolar bir gecəlik bizə gələndə?
Bir dəfə yanılıb, səvab et sən də.
Gəl inad eyləmə, boyun ol buna,
Bu işin babalı mənim boynuma.
Bu dərdli aşiqin günahı çoxdur,
Sənin ki, lütfün var, qorxusu yoxdur.
Qəzəbin yandırır, qəlbi, ciyəri,
Yoxmu iltifatın, ey gözəl pəri?
Sənin qəzəb odun yandığı zaman
Ona göz yaşımdan su çilə, canan!
Ayımdır, günümdür səndəki camal,
Onunçun seyr edir aləmi xəyal.
Yaxşı ki, görmürəm səndən nəvaziş,
Dəli təzə ayla bağlamaz saziş.
Səni kölgəmdən də sormuram, ey yar,
Çünki kölgəmə də yoxdur etibar.
Mən ki, öz kölgəmdə görürəm səni.
Başımdan kəsirsən sən öz kölgəni.
Apardın könlümü, aldın canımı,
Zalım cəllad olub, tökdün qanımı.
Eşqindən aldığım bu şöhrət, bu ad
Elədi ömrümü, eşqimi bərbad.
Sənin visalına yetməyir ünüm,
Lakin ümidinlə keçir hər günüm.
Evdə susuz qalıb yatsa bir uşaq,
Görsə yuxusunda sulu bir bardaq,
O şirin yuxudan qalxdığı zaman
Sorar barmağını susuzluğundan.
Qatlandı dizlərim qoşa, "lam" kimi,

"Yey" kimi bükmüşəm öz əllərimi[78].
Ah, adın məni də adın tək edir,
O da, bax, iki "lam", iki də "yey"dir.
Eşqin çıxan deyil candan, ürəkdən,
Nə çıxar aləmə sirr söyləməkdən.
Süd ilə gəlmişdir canıma bu sirr,
Canımdan ölüncə çıxan deyildir".
Bunu söyləyərək, yıxıldı yerə,
Çökdü qəm buludu baxan gözlərə.
Mərhəmət üzündən kömək etdilər,
Onu evlərinə alıb getdilər.
Məhəbbət daimi olmasa əgər,
Gəncliyin bir şəhvət oyununa dönər.
Məhəbbət odur ki, odu sönməsin,
Insan yaşadıqca, üzü dönməsin.
Həqiqi məhəbbət bir məhəbbətdir,
Ilki də, sonu da əbədiyyətdir.
Məcnun məhəbbətlə yetdi kamala,
Yayıldı şöhrəti bütün mahala.
Məhəbbət yükünü çəkən o ürək
Sövda nəsimiylə açıldı gül tək.
Indi onun gülü olmuşdur xarab,
Ondan xatirələr bir damcı gülab.
O gözəl gülabın xoş ətirindən
Arxımın suyunu durulduram mən.

**ATASININ MƏCNUNU KƏBƏYƏ APARMASI**

O sövda bayrağı qalxandan bəri
Leylinin hüsnü tək tutdu göyləri.
Aləmdə Məcnunu bu rüsvay etdi,
Onun dəliliyi kamala yetdi.
Başa divanəlik gəlsə hicrandan,
Bütün zəncirlərdən qurtarır insan.
Talein ürəyi yanmırdı ona,

Atası baxdıqca yazıq oğluna,
Dua edirdi ki, günəş görünsün,
O qaranlıq gecə gündüzə dönsün.
Duasız bir qapı, bir pir qoymadı,
Yazıq yalvarmaqdan cana doymadı.
Bütün qohumlar da pirə gedərdi,
Atayla birlikdə dua edərdi.
Gördülər bir əlac yoxdur bu dərdə,
Bir xeyir verməyir ziyarətlər də;
Bu oldu dostların verdiyi qərar:
Bu dərdə Kəbədən qapı açılar.
Bütün yer üzünün o pənahıdır,
Yerin də, göyün də qibləgahıdır.
Dedilər: "Həcc vaxtı gələndə yenə,
Gedərik Məkkənin ziyarətinə...
Ata bu səfərə çıxdığı gündə,
Kəcavə bəzədi dəvə üstündə.
Oğluna yalvardı: "Gəl əyləş", deyə,
Oturtdu ay kimi onu beşiyə.
Çatınca Kəbəyə o dərd atası
Taxdı qulağına qulluq sırğası.
Gövhəri qızıla qatıb yüz kərə,
Qum kimi səpdi o qum rənglilərə.
O qədər xəzinə payladı ki, tək
Qaldı xəzinəsi boş bir daxma tək.
Kəbənin üzünü görüncə ata
Istədi mətləbi yetsin murada.
Öpüb, qucaqladı yazıq oğlunu,
Kəbə kölgəsində saxladı onu.
Dedi: "Oyun yeri deyil bu, oğlum,
Əlaca gəlmişik, qurbanın olum.
Kəbə zəncirindən yapışsan bu an,
Qəmlər zəncirindən azad olarsan.
De ki: - Böyük tanrı, bu hərzəlikdən
Canımı bir dəfə azad eylə sən.
Rəhm elə, məni öz himayənə al,
Gəl bu divanəni doğru yola sal.

Bu dərdi canımdan irağa göndər,
Bir də bu eşqdən qəlbimi döndər.
Mən eşq əsiriyəm, bir məni yad et,
Eşqin bəlasından məni azad et".
Məcnun eşq sözünü eşidən zaman
Əvvəlcə ağlayıb, güldü sonradan,
İlan tək qıvrılıb, sıçradı yerdən,
Kəbə halqasına əl atdı birdən,
Halqanı öpərək, dedi: "Ey allah!
Mən də bir qapının halqasıyam, ah!
Eşqin halqasında inildəsin can,
Bir gün də düşməsin o qulağımdan.
Mənə deyirlər ki: - Gəl eşqi burax, -
Bu, dost məsləhəti deyildir ancaq.
Eşq ilə yaşayır aləmdə səsim,
Eşqsiz aləmdə batar nəfəsim.
Eşqdən yoğrulmuş ruhum, bədənim,
Eşqsiz bir günüm olmasın mənim.
Eşqsiz bir ürək heçliyə varsın,
Onu qəm selləri yuyub aparsın.
Ilahi, birliyin xatirəsinə,
Yenə yalvarıram ürəkdən sənə.
Qoy eşqim ucalıb, namidar olsun,
Mən özüm ölsəm də, eşqim var olsun.
Eşqin günəşindən ayırma məni,
Silmə gözlərimdən sən bu sürməni.
Könül bu sövdadan sərxoş olsa da,
Qoy bundan da bətər olum dünyada.
Deyirlər: - Eşqi tut özündən kənar,
Leylini sevməyi qəlbindən çıxar.
Ilahi, sən saxla mənim Leylimi,
Çoxalt hər dəqiqə ona meylimi!
Ilahi, ömrümdən kəs indən belə
Leylinin ömrünə cala əlinlə!
Mən tükə dönsəm də onun qəmindən,
Başından bir tük də əskik etmə sən.
Qoyma ki, boş qala qulağım bir an,

Yarın öyüd verən o halqasından.
Cananın meyiylə dolsun piyaləm,
Sikkəsi düşməsin adımdan bir dəm.
Qoy alsın canımı yarın camalı.
Qanımı içsə də olsun halalı.
Qəmindən şam kimi yansa bədənim,
Bir günüm olmasın o qəmsiz mənim.
Bu eşq aləmində ürək düz olsun,
Eşqim yaşadıqca, birə yüz olsun".
Ata dinlədikcə oğlunu, yenə
Dərin bir susqunluq çökdü qəlbinə.
O indi bildi ki, nadir məhəbbət,
Dərmansız, davasız yaranmış bu dərd.
Baş alıb qayıtdı öz evlərinə,
Bütün qohumlarla görüşdü yenə.
Dedi: "Bu zənciri qırılmış bədbəxt
Kəbə halqasına əl atdığı vaxt
Qulağım titrədi zəmzəməsindən,
Mən də Zəmzəm kimi coşdum səsindən[80].
Deyirdim, əl açar oğlum Kəbəyə,
Leylinin dərdindən qurtarsın, deyə.
Osa öz canına qarğadı yalnız,
Dualar etdi ki, yaşasın o qız".

## MƏCNUNUN ATASININ LEYLİ QƏBİLƏSİNİN QƏSDİNDƏN XƏBƏR TUTMASI

Yayıldı aləmə bu acı xəbər,
Bu sirri yadlar da açıq bildilər.
Dedilər: "Can alan bir eşq ucundan
Divanə olmuşdur gözəl bir cavan".
Ondan danışdıqca hər oba, hər kənd.
Gah təəssüf etdi, gah da məzəmmət.
Leyliyə güldükcə istehzaçılar,
Girdi qəm evinə o dərdli nigar.
Leyligil tərəfdən bir-iki nəfər

Qəbilə şahına belə dedilər:
"Filan biyabandan çıxan bir sarsaq
Bizim qəbiləni rüsvay edir, bax.
Yanında it kimi bir sürü adam,
Baş açıq buraya gəlir o müdam.
Gəzir sızıltıyla bizim yerləri,
Gah atılıb düşür, gah öpür yeri.
Yaxşı şer deyir, şeri gözəldir,
Dəqiqə başına qəzəl düzəldir.
Onun qəzəlləri oxunan yerdə
Yırtılıb dağılar yüzlərcə pərdə.
Bütün sözlərini el deyir əzbər,
Bizi də, səni də rüsvay edirlər.
Leyli də olmuşdur sinəsi dağ-dağ,
O yeldən sönəcək bizim bu çırağ.
Bir qulaq burması göstər ona sən,
Bizim ay qurtarsın onun şərrindən".
Oğru yorğun idi, darğa qan tökən
Işdən xəbər tutub qopdu yerindən.
Qılıncı çəkərək, dedi, müxtəsər:
"Onun cavabını bu qılınc verər".
O yerdə bir nəfər amiri vardı,
Öz qəbiləsinə xəbər apardı.
Dedi atasına Məcnunun dərhal:
"Gözlənən bəlanın qarşısını al.
Yoxdur o darğanın qəlbi, duyğusu.
Alovlu bir oddur, sürətli bir su.
Məcnun xəbərsizdir, qorxuram ki, mən,
Bilsin, ayrılanda başı bədəndən.
Onun qarşısında boş bir quyu var,
Quyuya düşməmiş edək xəbərdar".
Sən yazıq atanın taleinə bax!
Atalıq eşqiylə qəlbi yanaraq,
Dostlara əmr edib, buyurdu qoca:
Yel kimi düşsünlər onun dalınca,
Nəsihət diliylə onu bir təhər
Təsəlli tapmağa dəvət etsinlər.

Axtarıb gəzdilər onu hər yandan,
Nə bir iz tapdılar, nə də bir nişan.
Dedilər: "Bəlkə də əcəl yetmişdir,
Vəhşilər əlində ölüb getmişdir".
Hər dost ürəyindən qopdu bir nalə,
Qaranlıq çökmüşdü hissə, xəyalə.
Ondan nə iz vardı, nə də yadigar,
Bütün ailəsi qalmışdı ağlar.
Eşqin halqasını qulağa taxan,
Dünyanın işinə biganə baxan,
Bir xəzinə kimi küncdə qalaraq,
Nə səs eşidirdi, nə də ki, soraq.
Belə bir ovlaqda o Məcnun yazıq
Yolun tozuna da qanedi artıq.
Şir güclü olsa da tox bir canavar,
Ondan qoçaq olar ovda çaqqallar.
Aclığı olmasa şahinin bir az,
Turacın üstünə uçub şığımaz.
Ac üçün kəpək də yağlı çörəkdir,
Tox üçün yağ-çörək sanki kəpəkdir.
Iştah qızışanda baş alıb gedər,
Çovdar çörəyini mum tək əridər.
Halva çox şirindir, şəkər kimidir,
Kəkliyi azmışa zəhər kimidir,
Məcnun dolaşdıqca o baldan kənar,
Yediyi olmuşdu tamam zəhrimar.
Başından aşdıqca aşiqin dərdi,
Kasad mətaına rəvac verərdi.
Yox, yox, əridəcək bu sövda onu,
Yoxdur bu qüssənin, bu dərdin sonu.
Məcnuna üz verən hər ölçüsüz qəm
Olmuşdu dərdini dağıdan həmdəm.
Bir yol tapmasa da o xəzinəyə,
Axtarıb gəzərdi, xəzinə deyə.
Bəni-Səd adlanan yad bir tayfadan
Bir nəfər Məcnuna rast gəldi bu an.
O gördü aşiqi xərabəzarda,

Əhvalı pozğundur, xəyalı darda.
Qalmış öz beyti tək tənha, giriftar,
Mənası genişdir, qafiyəsi dar,
Yəni ki, məhrumam yardan, yoldaşdan,
Qafiyəsiz şerdir, kimsəsiz insan.
Öz talei kimi dönmüş kamana,
Vəfada ox kimi durur mərdana.
Onun duruşunda məna gəzərdi,
Kamanla birləşmiş oxa bənzərdi.
Bir nalədən başqa yoxdu həmdəmi,
Yalnız kölgəsiydi onun məhrəmi.
O yolçu ordaca gördü Məcnunu,
Nəcib bir insana bənzətdi onu.
Sonra əhval tutub, nə soruşdusa,
Məcnun cavab verib dinmədi əsla.
Umudu kəsildi, onu tərk etdi,
Yolçu öz yoluna düzəlib getdi.
Gəldi Məcnungilin qəbiləsinə,
Qəbilə toplaşdı onun səsinə.
Dedi: "Filan yerdə, xərabəzarda
Məcnun ilan kimi qıvrılır darda.
Divanə dərdlidir, yorğundur, bilin,
Div kimi qaçmışdır gözündən elin.
Hər yetən tənədən bir yara almış,
Əriyib bir dəri, bir sümük qalmış".
Atası oğlundan xəbər tutunca,
Eldən üz döndərdi zavallı qoca.
Oğul sorağıyla o ixtiyar da
Dolaşdı div kimi mağaralarda.
O gəlib yetişdi bir viranəyə,
Daş üstə rast gəldi o divanəyə.
Məcnun sinəsindən söz bağlayırdı
Gah oxşatma deyir, gah ağlayırdı.
Ciyərinin qanı gözdən axırdı,
Bəxti tək gah düşüb, gah da qalxırdı.
Elə məst etmişdi onu bu hicran,
Nə dünya bilirdi, nə də ki, insan

Ata salam verdi yazıq oğluna,
Şirin bir dil ilə yalvardı ona.
Məcnun atasının şəklini görcək,
Onun ayağına düşdü kölgə tək:
"Ey başımın tacı, könlümün taxtı,
Üzrüm var, gəl dinlə sən bu bədbaxtı,
Soruşma halımı, üzümə bir bax,
Gəl qəzaya tapşır məni sən ancaq.
Arzu etməzdim ki, belə bir halda
Gözlərin görəydi məni, ey ata!
Doğrudur, qaradır yanında üzüm.
Ah, üzr istəməyə varmıdır sözüm.
Mənim ki, dərdimi özün bilirsən,
Çıxmış ipin ucu əllərimizdən..."

**ATASININ MƏCNUNA NƏSİHƏTİ**

Ata eşitdikcə onun səsini,
Alıb yerə vurdu əmmaməsini.
Bir səhər quşu tək sızladı qəlbən,
Gündüzü gecə tək qaraldı birdən.
Dedi: "Ey gözümün qarası, ağı,
Dağılmaz bir gülün solğun varağı,
Xəyalın yenəmi bir divanədir?
Yanıb külə döndü, bu halın nədir?
Kimin gözü dəydi gül camalına?
De, kimlər qarğadı sənin halına?
Kimlər öz qanını boynuna atdı?
De, kimin tikanı ətəynə batdı?
Sənə nə oldu ki, qaldın işindən?
Düşdü gözlərinə, de, hansı tikən?
Heç aşiq sən kimi bədbəxt olmamış,
Bu qədər dərd çəkib darda qalmamış.
Neçin yorulmadın, usanmadın sən,
Düşmən tənəsindən, qəm qəfəsindən?
Qəlbin doymadımı bu məzəmmətdən?

Neçin dirilmədin bu qiyamətdən?
Oğul, bu sövdanı bir dəfə unut,
Özünə rəhm elə, hörmətimi tut.
Nədir bir eşq üçün bu rüsvayçılıq?
Aləmə göstərmə bu eybi açıq.
Çox gözəl olsa da eybi gizləmək,
Dost dostun eybini örtməsin gərək.
Bu dostluq aynası göstərir ki, sən
Özündən bu eybi kənar edəsən.
Aynanın nə pisi, nə yaxşısı var,
Bu cür xasiyyətlər insanda olar.
Bu dərdi qəlbindən çıxar bir kərə,
Soyuq bir dəmiri döymə boş yerə.
Tutaq ki, ağırdır canan həsrəti,
Qalmamış könlüyün səbri, taqəti
Bari bu həsrəti arabir unut,
Gəl biz tərəfin də əhvalını tut.
Xəyal havasına at çapan olar,
Qaçmaq ayağında piyada qalar.
Bəsdir bu şərabsız, içgisiz məstlik,
Bəsdir bu arzusuz arzupərəstlik.
Oğul, sən xırmanı yelə vermisən,
Bu zalım düşmənə kam olmuşam mən.
Sən adlı, sikkəli istərsən məni,
Boşla dəliliyi, bu pis sikkəni.
Sən sazı döyürsən, mən də dizimi,
Sən paltar cırırsan, mən də üzümü.
Eşqin odlarına yansan belə sən,
Mənim ciyərimdir küllərə dönən.
Umuddan əl üzmə, gəl çarə qılaq,
Göyərmək deyildir danədən uzaq.
Umudsuz bir işdən, səbr etsən əgər,
Bir umud işığı parlaya bilər.
Hər umudsuz işdə bir çox umud var,
Qaranlıq gecədən ağ səhər doğar.
Oğul, səadətin qapısını aç,
Ayağı sürüşkən taleindən qaç.

Çalış, əllərindən çıxmasın dövlət,
Dövlətlə yaranır bütün səadət.
Dövlət, düyümləri açandır bir-bir,
Şahlıq üzüyünün firuzəsidir.
Dünya qapısının açarı hər an
Dövlətin cibində saxlanır, inan.
Sən də səbr eləsən, dayansan əgər,
Tale yavaş-yavaş əlinə gələr.
Dərinlik, sonsuzluq varsa dəryada,
Arxların suyundan yaranmış o da.
Başında bulutlar oynayan hər dağ
Torpaq zərrəsindən qurulmuş ancaq.
Sənin də səbrində qoy olsun qərar,
Gövhəri səbr ilə qazanmaq olar.
Iradəsiz olma, iradəsizlər,
Ayaqsız qurd kimi yerdə sürünər
Tülkü canavarı edirsə məğbun,
Ondan iradəsi böyükdür bunun.
Səni illər boyu yad etməyənə
Nə üçün könlünü verirsən yenə?
O, şaddır, gül kimi, sən gözü yaşlı,
O, daş ürəklidir, sən başı daşlı.
Kim ki, söhbət açır o qızdan sana,
Səni rüsvay edir, bir ayılsana.
Əqrəb çalmışlara verilsə gərfəs[81],
Zəhərlə məhv olub kəsilər nəfəs.
Can oğul, başqa bir iş ucundan tut,
Bu sövda işini bilmərrə unut.
Hindli fil başına döyər hər yerdə
Ki, fil Hindistanı anmasın bir də.
Canımsan, canımdan daha əzizsən,
Evə dön, evimin işığısan sən.
Bu dağda yurd salıb otursan, əgər,
Yalnız üzümüzün suyu tökülər
Bu yolda daşlıq var, quyu var ancaq,
Bir aç gözlərini, ona yaxşı bax.
Darğa pusqudadır, inad olma bir,

Zəncirə əl vurma o dəmirdəndir.
Sən yol uşağısan, fitnə yolkəsən,
Qılıncdır başıyın üstündə əsən.
Sən şadlan, kor olsun buna düşmənin,
Gəlsin məclisinə dostların sənin"

**MƏCNUNUN ATASINA CAVABI**

O şəkərdillini Məcnun eşitcək,
Ağzından söz tökdü o da şəkər tək:
"Sən, ey böyüklüyü göylər calallı,
Uca göylərdən də uca xəyallı,
Viranə yerlərə sənsən şəhriyar,
Ərəblər üzündə, ənbər xalın var.
Sənin dərgahındır ilk qibləgahım,
Canım canındandır, sənsən pənahım.
Ömrün uzun olsun, daima yaşa,
Səninlə bir vuraq dünyanı başa.
Böyük xəzinədir bu nəsihətin,
Yaramı bağladı mehrin, ülfətin.
Ancaq, neyləyim ki, mən bəxti qara
Xoşla düşməmişəm vəhşi dağlara.
Doğrudur, dağılmış səbrim, qərarım,
Özümdə deyildir öz ixtiyarım.
Bağlanıb qalmışam, zəncirim dəmir,
Görünür mənim də bəxtim belədir.
Zənciri açmağa gücsüzəm bu dəm,
Bu yükü üstümdən ata bilmərəm.
Dedim ki, dönməsin ciyərin qana,
Xəyal pərişandır, könül virana.
Başımda partlayan bu ildırımdan
Minlərcə xırmanlar yanmışdır, inan.
Məzlum mən deyiləm yalnız bu yerdə,
Yüzləri düşmüşdür mən düşən dərdə.
Kölgə özbaşına düşməz quyuya,
Göydə dayanmamış ay duya-duya[83].

Filin vücudundan milçəyə qədər,
Bu zülmü çəkməyən varmıdır məgər?
Xalqın istəyincə olsaydı hər iş,
Bir iş qalardımı xalq istəməmiş.
Daşları əridir çəkdiyim kədər,
Kim öz ürəyinə sıxıntı istər.
Məni pis taleim təqib edir, bil,
Heç kəs bədbəxtlikdən qurtaran deyil.
Neyləyim, olsaydı əlimdən tutan,
Ya günəş, ya da ay olardım, inan.
Bizdən ixtiyarsız yaranmış hər iş,
Insan iradəsi ona dəyməmiş.
Başım bəlalıdır, ürəyim xal-xal,
Dünyada varmıdır bir nəfər xoşhal.
Vətən tozu kimi mənəm sərgərdan,
Axır gözlərimdən yaş yerinə qan.
Bükdüm ildırım tək dodağımı mən,
Qorxub gülmədim ki, od tutar bədən.
Deyirlər, nə üçün gülməyirəm bir?
Ağlamaq qəmginlik əlamətidir.
Ömrümdə şadlanıb gülsəm bircə gün,
Qorxuram ağzımdan alov püskürsün.
Kəklik qarışqanı dimdikləyərək,
Onu dimdiyində sıxırdı bərk-bərk.
Qarışqa kəkliyə gülərək bu an,
Dedi ki: "Sən gülmək bacarmayırsan"
Yazıq qarışqaya baxaraq dik-dik;
"Bu mənim peşəmdir" söylədi kəklik.
Sonra qəhqəhəylə o güldü birdən,
Saldı qarışqanı öz dimdiyindən.
Hər kim bu dünyada gülərsə artıq,
Ondan uzaqlaşar məncə xoşbaxtlıq.
Yersiz bir gülüşün nə mənası var?
Yerində ağlamaq daha xoş olar.
Mənim ki, nəsibim oldu əziyyət,
Hansı bir günümlə mən olum rahət?
Belində yük olan qoca bir eşşək

Nə qədər ömrü var əzab çəkəcək,
Rahat olmayacaq o əziyyətdən,
Bir ölüm qurtarar onu bu dərddən.
Demə məhəbbətə qılıncdan iti,
Ürəkdir yaradan bu məhəbbəti.
Qılınc oyunundan kim qaçsa, gerçək,
Başı bir qılıncla vurulsun gərək,
Eşqin qılıncından qorxmaz ki, heç kəs,
Aşiqin başından qılınc əksilməz.
Aşiq olan kimsə canından qorxmaz
Cananını sevən cahandan qorxmaz.
Girdi bulutlara o ay sirdaşım,
Qoy qılınc altına qoyulsun başım.
Bir baş verilməsə canana qurban,
Qılınca və teştə layiqdir, inan.
Bu odlara düşən canım naxoşdur,
Bu naxoş canımın yanması xoşdur.
Mən ki, söz olmuşam ağıza, dilə,
Sən də unut məni bu gündən belə".
Ata dinlədikcə yazıq oğlunu,
Ağladı, ağladı, yaş boğdu onu.
Bir yanda atası dayanmış giryan,
Bir yanda balası yıxılmış üryan.
Sonra evlərinə onu apardı,
Təsəlli verərək öpdü, yalvardı.
O sinəsi dağlı, o bəxti qara
Qəfəsdə quş kimi düşmüşdü dara.
Evdə iki-üç gün qara bağladı
Bu acı səhnəni görən ağladı.
O pərdəni yırtıb, ah çəkdi yenə,
Baş alıb yollandı çölün düzünə.
Əzab içindəydi həyatı ancaq,
Ölümdən pis idi ona yaşamaq.
Məhəbbət coşdurdu onun ruhunu,
Yenə Nəcd dağına apardı onu.
Əli daş kimiydi, ayağı dəmir,
Dağı dolaşırdı o havalı şir.

Orda gurladıqca Məcnunun səsi,
Bir qəzəl deyirdi hər zümzüməsi.
Ellər, obalar da yığışıb səf-səf
Gəlirdi heyrətlə o dağa tərəf.
Eşitdikdə ondan nadir bir inci,
Xatirə qələmə tutub birinci.
Töhfə apardılar diyarbədiyar,
Aşiqlər nəğmədən varlanırdılar.

**LEYLİNİN ƏHVALI HAQQINDA**

Murad dastanının ilk səhifəsi,
Gözəllik mülkünün baş sərkərdəsi,
Yeddi ulduz kimi gözəl camallı,
O göylər duruşlu, göylər calallı,
Gözəl camalına ay həsəd çəkən,
Hüsnüylə sərvin də bağrını sökən,
Umudu, qorxunu mars qoyan hünər,
O aydan, günəşdən irs alan dilbər,
O, bütpərəstlərin səcdə mehrabı,
O, saray qəndili, gülşən gülabı,
Eşqin yatağına, nazına bir yar,
Həm xəzinə olan, həm xəzinədar,
Hüsnün, gözəlliyin zinət mayəsi,
Şəkər dillilərin naz sərmayəsi,
Özünə min aşiq qəlbi bağlayan,
Min Məcnun zənciri qırıb ağlayan
Leyli parladıqca min təmtəraqla,
Aləm göstərirdi onu barmaqla.
Daradı saçını o təzə sünbül,
Yırtdı qönçəsini o növrəstə gül.
Boyu sərv kimi qalxıb, ucaldı,
Yaqut dodaqları nə canlar aldı!
O, könül bağında boy atan pəri,
Qəmzə oxlarına tutdu elləri.
Ah, o baxışları nə sehirkardı!

Yüz könül mülkünü birdən talardı.
Qəmzəsi ox kimi süzüb gedərdi,
Ərəb, türk yurduna hücum edərdi.
Atdığı kəməndin bir sirri vardı,
Qəmzəsi ov tutar, zülfü bağlardı.
Sonra da atardı damın üstündən,
Müşgə bənzəyirdi ahu gözləri,
Ahular ovlardı o gözəl pəri.
Şikar zamanında şirləri belə
Tutub zəncirlərdi hörüklərilə.
Üzü gül, dodağı baldan da şirin,
Şəkər görüb onu, dedi afərin,
O gül yanaqlara, bal dodaqlara
Min nazənin baxıb, düşmüşdü tora.
Saçı öpüş üçün yol təmizlərdi,
Kirpiyi "qoy allah versin" deyərdi.
Zülfü kəmənd olub, aşiq ovlardı.
Kirpiyi ox kimi onu qovlardı.
Aydan gözəl olan o iki yanaq
Güldən iki addım düşmüşdü qabaq.
Bir sərv boyluydu o qızın özü,
Sərv üstə qırqovul kimiydi üzü.
Dodağı şəkərdən şirə çəkmişdi,
Xurmanın üstünə qələm çəkmişdi.
Öpüş yaraşırdı o gül dodağa,
Şəkərin tüngünü qoymuşdu lağa.
Açıq quyu kimi zənəxdanına
Yüz könül düşmüşdü, aldanıb ona.
Zülfünü ip kimi atmışdı canan,
Bəlkə, aşiqləri çəksin quyudan.
Aşiqlər halına o yana-yana,
Özünün qəlbi də dönmüşdü qana.
O, dustaq qalmışdı bir pərdədə tək,
Ürəyi sınmışdı onun pərdə tək.
Bəzən oğrun-oğrun dam üstündə qız.
Səhərdən axşama baxardı yalnız.
Bəlkə də, Məcnunu görə bir təhər,
Bari, bir dəqiqə deyib gülələr.

Harda tapsın onu bu gözəl sona,
Dərdini, sirrini bir açsın ona?
Ah, rəqib hədəsi, ah, düşmən dərdi!
Qız gecə yarısı min ah çəkərdi.
Şam kimi dəlicə gülməyi vardı,
O, şirin gülsə də, acı ağlardı.
Göz yaşı gülünü islatdıqca hey,
Məcnun görünürdü gözünə hər şey.
Ayrılıq oduna yanırdı pünhan,
Nə işıq, nə tüstü çıxırdı ondan.
Üzdə külək kimi coşsa da hər vaxt,
Içərdə qəlbini yeyirdi bədbaxt.
Öz dərd aynasına baxaraq yalnız,
Orda xəyaliylə danışırdı qız.
Yalnız kölgəsiydi onun sirdaşı,
Bir də həmdəmiydi eşqin göz yaşı
Kölgəyə dərdini açdıqca dilbər,
Qonşusu yatmırdı onun gecələr.
Odla su arası olmuşdu yeri,
Bir pəri üzlüydü o gözəl pəri.
Qadının nəğməsi cəhrə səsidir.
Ox isə şahların ov həvəsidir.
Leyli iki başlı iyi ataraq,
Bir başlı ox aldı, ah çəkdi ancaq.
Sarsınıb atdığı bir başlı oxdan,
Iki başlı iy də oldu sərgərdan
Dərya-dərya yığıb dərd ilə qəmi,
Gözündən tökürdü o, gəmi-kəmi.
O, pərdə dalında qəmlər yedikcə,
Qəmlər əridirdi qəlbini təkcə.
Qulağa bir qızıl halqa taxaraq,
Halqa tək qapıya asırdı qulaq.
Eşqin halqasını öz qulağından
Başqa bir insana verməzdi bir an.
O, ay çeşməsinə baxıb dalardı.
Gözləri çeşmə tək yolda qalardı.
Bəlkə bir sifariş gələ Məcnundan,

Ya quru bir salam eşidə ondan.
Arabir əsdikcə Nəcdin küləyi,
Bir vəfa duyurdu qızın ürəyi.
O yandan bir bulut gəlsə bu yana,
Umud damlaları verirdi ona.
Evin hər yerindən, hər bucağından
Yarın qəzəlini duyurdu canan.
Leyliyə bazardan gələn hər uşaq
Baxırdı, Məcnundan söz oxuyaraq.
Damının altından keçdikcə hər kəs,
Qəzəl söyləyərdi ona bir nəfəs.
O dünya camallı nazəndə dilbər
Qəlbindən qoşardı gözəl şerlər.
O bakirə gözəl, bir sənətkardı,
Özü tək bakirə sözləri vardı.
Məcnunun dilindən söz düzəldərək,
Cavab da yazırdı o gözəl mələk.
Məcnunun şeriylə yandıqca pəri,
Ona su səpərdi öz şerləri.
Kağızı gizlində isladıb qanla,
Ona söz yazardı min həyəcanla.
Salam göndərərdi sərvə yasəmən.
Kimə rast gəlsəydi o məktub, inan,
Oxuyub oynardı o, şadlığından.
Aparıb Məcnuna verərdi ki, bir
Desin cavabında o gözəl bir şer.
O da canan yazan söz əvəzinə,
Axıcı bir qəzəl deyərdi yenə.
Demək, bu həsbhal qəlbin səsiydi.
Iki sevgilinin deyişməsiydi.
O aşiq bülbüllər ötəndən bəri,
Qırıldı dünyanın bütün qəmləri.
Dinib danışdıqca o qoşa sazlar,
Qopdu simlərindən gözəl avazlar.
Rudla çəng çalsa da iki nəğməkar,
Bir qəlbin səsini verirdi onlar.

Onlar ki, hər dərdi şerə salardı,
Başqası çəngdə, neydə çalardı.
Nəğmə düzəltdikcə iki nəğməkar,
Çalıb oynayardı evdə uşaqlar.
Tənə qapısını açıb yenidən,
Böhtan uydurardı onlara düşmən.
Ağlamaq tutardı axır onları,
Göz yaşı yuyardı o böhtanları.
Tamam bir il keçdi bu münval ilə,
Onlar dolanırdı bir xəyal ilə.

## BAHARIN TƏRİFİ VƏ LEYLİNİN XURMALIQ TAMAŞASINA GETMƏSİ

Sərdi xalısını səhraya min gül,
Bəzədi torpağı susənlə sünbül.
Ağacda qonçalar baxdı göz-gözə,
Bənzədi qayğısız, gülər bir üzə.
Qırmızı lalədən sarı çiçəkdən
Təbiət bir bayraq qaldırdı bilsən.
Baxıb bostandakı, bağdakı hüsnə,
Bülbül rübabını basdı köksünə.
Üstünə şeh düşmüş yaşıllıqlar da
Zümrüdə bənzərdi o ilk baharda.
Çəmənlər başına bürümüşdü şal,
Lalənin yarpağı olmuşdu xal-xal.
Hələ, nəzər yetir bənəfşələrə,
Zülfünü darayıb tökmüşdü yerə.
Qonça, kəmərini bağlayıb bərk-bərk,
Tikandan ox tutub atırdı, gerçək.
Güllər ipək geyib bəzənən zaman
Külək yapışmışdı sırğalarından.
Gül rəngli günəşdən açıb neylufər,
Suyun qarşısında atmışdı süpər
Şümşad tellərinə çəkib şanəni
Nar gülü yığırdı nara danəni.

Ətrinin ağzını açdıqca sünbül,
Baxıb əl verirdi ona qızılgül.
Od tutub alışan nərgiz də bu an
Qızdırmalı kimi qalxdı yuxudan.
Şərab qətrələri qaynayıb haman.
Yavaşca axıtdı damarında qan
Axıtdı yasəmən can bulağını,
Nəstərən yıxadı gül yanağını.
Qızıl gül qorxaraq açdı gözünü,
Nazlandı misilsiz görcək özünü.
Beldəki qılınca bənzərdi süsən,
Yox, o sıyırmaydı, səhv elədim mən.
Quşlar dil açmışdı bağda hər yandan,
Baş açmaq olmazdı hərzə-hədyandan.
Turac ürəyindən kabab bişirir,
Qumru sinəsindən ona duz verir.
Çinar başındakı göyərçin səsi
Deyirdi aləmə yar zümzüməsi.
Ağacda bülbül də qan yaş tökərdi,
O da Məcnun kimi nalə çəkərdi.
Gül də Leylidəki o vüqar kimi,
Çadırdan çıxmışdı tacidar kimi.
Baxıb gül fəslinin çəmənlərinə,
Leyli qədəm basdı onun seyrinə.
Sonra saçlarını hörərək yenə,
Su səpdi gülünün yaqut rənginə[84]
Haman qəbilənin gözəl qızları
Aldı ortalığa bizim dildarı.
Ərəb torpağında türk idi onlar,
Xoşdur ərəbboylu türk olan nigar.
Sənəmlər içində gedir xuraman,
Yaman göz dəyməsin ona heç zaman.
Bağda bitkilərin seyrinə dalsın,
Gülün kölgəsində dincini alsın.
Piyala uzatsın ona nərgizlər,
Lalədən öyrənsin təzə bir xəbər.
Bənəfşə zülfündən aldıqca işıq,

Camalı güllərə olsun yaraşıq.
Boy atmaq öyrətsin sərvə özündən,
Utansın yasəmən onun üzündən.
Qönçənin ətrindən min bac istəsin,
Çəmənlər mülkündən xərac istəsin.
Boyu kölgə salsın çəmən üzünə
Gülsün o sərv ilə səmən üzünə,
Yox, yox onun qəsdi bu deyil, bilsən,
Nə güldür, nə sərvdir, nə də nəstərən.
Onun məqsədi də, eşqi də təkdir,
Bir bucaq axtarıb, min ah çəkməkdir.
Bülbülə sirrini açmaq istərdi,
Bəlkə təzələnə yenidən dərdi.
Bəlkə gülüstanda əsən küləklər
O qərib aşiqdən verə bir xəbər.
Bəlkə də açıla qəlbinin bağı.
Qalxa sinəsindən ayrılıq dağı.
O yerdə bir gözəl xurmalıq vardı,
Çin nəqqaşlarından bir yadigardı.
Onun cərgə-cərgə xurmalıqları
Sanki yol salmışdı behiştə sarı.
Bu xoş seyrangaha - başdan, binadan
Ayaq basmamışdı canlı bir insan.
Leylinin yanında bir bölük nigar
Gəlib o çəmənə yetişdi onlar.
Leyli yaşıllıqda oturdu gül tək,
Otlardan belinə kəmər çəkərək,
Hayana dəydisə onun nəfəsi,
Açıldı süsənin, gülün qönçəsi.
Hansı çəmənə ki, əli çatardı,
Şümşad göyərərdi, sərv boy atardı.
O sərv boylular, o gül üzlülər
Şadlanıb güldülər orda bir qədər.
Bir an qoşuldusa şadlığa Leyli,
Çox da bağlanmadı məclisə meyli.
Tutu quşu kimi o sövdalı qız
Bir sərvin altına oturdu yalnız.

Gizlicə sızladı mehribanlıqla,
Sonra dilə gəldi bir xoş qılıqla:
"Sən ey eşqə layiq, əziz dildarım,
Sən mənə layiqsən, mən sənə, yarım.
Ey sərv qamətli, coşqun həvəsli,
Ey atəş ürəkli, sərin nəfəsli,
Nolar ki, görəsən sən də bu bağı!
Gəlib qaldırasan sinəmdən dağı.
Nolar, bir tapasan bu bağda məni!
Sən sərvi görərsən, mən də narvəni.
Tutaq ki, dözmürsən məni görməyə,
Mənim bu bağçamdan qaçırsan niyə?
Söylə, sifarişin gəlməyir nədən?
Layiq deyiləmmi bu vəfayə mən?"
Söz sona çatmamış eşitdi bir səs,
Elə bil bir anlıq kəsildi nəfəs.
Qəzəl oxuyurdu yolda bir nəfər,
Məcnunun şeriydi o gözəl əsər:
"Ey mənim pərdəmi açan cananım,
Qoy olsun umudun pərdə tutanım.
Məcnunu boğmuşdu qan dalğaları,
Leyli o yazığı anırmı barı?
Məcnunun bağrını yandırır ələm,
Leyli hansı qəlbə su səpir bu dəm?
Məcnunun qəlbini dəlmiş ox, tikən,
Leyli nə naz ilə yatır, görəsən?
Məcnun min ah çəkib ağlayır burda,
Leyli necə şadlıq axtarır orda?
Məcnun dərd içində, dağ içindədir,
Leyli hansı bahar, bağ içindədir?
Məcnun qəm zənciri vurmuş özünə,
Leyli gülümsəyir kimin üzünə?
Məcnunun ürəyi ürkmüş hicrandan,
Leylinin xəyalı nədir bu zaman?"
Bunu dinlədikcə, qızın göz yaşı -
Tökülüb, yumşaltdı torpağı, daşı.
Bağdakı qızlardan birisi bu an

Leyliyə baxaraq gözünün altdan,
Gördü ki, dərd çəkir o gözəl pəri,
Eşqə mehribandır onun gözləri.
Sonra evlərinə qayıtdı qızlar,
Sədəfə dürr kimi girdi o nigar[85].
O qızın qəlbində qalmadı bu sirr,
Gedib anasına söylədi bir-bir.
Məqsədi buydu ki, anası yenə
Bir çarə axtarsın onun dərdinə.
Bu nakam gözəlin anasına bax,
Qəfəsdə quş kimi o çırpınaraq,
Dedi: "Özbaşına qalsa bu nigar,
O, Məcnun olmuşdur, bu da məst olar.
Onu səbr etməyə çağırsam əgər,
Qorxuram məhv olub əlimdən gedər".
Onun həsrətiylə hey yana-yana
Səbr edib dözürdü yenə də ana.
Leyli dörd divarda bir xəzinə tək,
Ay kimi çadırda yaşayırdı tək.
Bulutdan tutqundu çəkdiyi ahlar,
Qında qılınc kimi olmuşdu qəmxar.
Əzab içindəydi o nazlı mələk
Varmı məhəbbətlə şad olan ürək?

## İBN-SƏLAMIN LEYLİNİ İSTƏMƏSİ

Bağın calalını yaradan usta
Böylə nəql edirdi dastan xüsusda:
O gün ki, o bağa girdi aypara,
Yaydı şəfəqini asimanlara.
Gül sərvin başında dəstə bağladı,
Gülün və gülabın alçaldı adı.
Zəncir halqası tək biri-birinə
Keçmişdi Leylinin saçları yenə.
Yolda Bəni-Əsəd qəbiləsindən
Bir nəfər, Leyliyə rast gəldi birdən.

Böyükdü ondakı vüqar və hünər,
Ehtiram saxlardı ona ərəblər.
Çoxdu qəbiləsi və qohumları,
Hörmətlə keçərdi bütün ruzgarı.
Xalq da baş əyərdi o gəncə müdam,
Ona ad vermişdi bəxt-Ibn-Səlam.
Gümüşlə, arxaydı ondakı hünər,
Onu barmaq ilə göstərərdilər.
O parlaq çırağı-Leylini görcək,
Bir çarə tapmağa əsdi külək tək.
Lakin o baxmadı heç də gərdişə
Ki, çıraq küləklə gəlməz sazişə.
Vətənə qayıdıb, cumdu xəyala,
Qəlbi can atırdı onun visala.
Ayı qucaqlaya bilməmiş heç kəs,
Bəlkə xəbərsizdi bu işdən o şəxs.
Başında gəzirdi visalın dərdi,
O pəri qızına elçi göndərdi.
Istəyi buydu ki, getsin elçilər,
Versin öz könlünü ona bu dilbər.
Hiylələr düzəldib düşdü ayağa,
Qızılı gül kimi tökdü torpağa.
Min xəzinə yığıb göstərdi elə,
Sürüsü, ilxısı səs saldı çölə.
Könül ovçusuydu o gözəl mələk,
Onun arxasınca elçi gedərək,
Ələ gətirməkçin haman gəlini,
Ata, anasının öpdü əlini.
Ata da, ana da cüt əyləşdilər,
Onlara xoş gəldi bu xeyir xəbər.
Dedilər: "Başqa bir məsləhət olmaz,
Ancaq ki, gözləmək lazımdır bir az.
Çünki pərişandır bizim novbahar,
Leylinin azacıq xəstəliyi var.
Qoyun yaxşılaşsın, şadlanaq biz də,
Kəbin kəsərsiniz o zaman siz də.
Bu kəbin, qəlbaçan bu xeyir xəbər

Allahın iznilə tez başa gələr.
Hələlik dayanıb bir az səbr edin.
Hələlik vədəylə şadlanıb gedin.
Taki gül qonçası açsın bu taqda,
Tikanlar çürüsün bu gözəl bağda.
Qızıl boyunbağı taxıb boynuna,
Verərik, sizinki olar bu sona".
Bunu Ibn-Səlam eşidən zaman
Bilmədi neyləsin o şadlığından.
Çapdı öz yurduna atını o dəm,
Silindi könlündən qüssə ilə qəm.

**NOFƏLİN MƏCNUNLA TANIŞ OLMASI**

Leyli çadırdaydı, o gizlənmiş ay
Pərdədə qalmaqdan olmuşdu rüsvay.
Açılmışdı onun abır pərdəsi,
"Leyli" çağırırdı hər neyin səsi.
O, ağıza, dilə dastan olmuşdu,
Ətir çəkənlərə reyhan olmuşdu.
Aşiqlər zikriydi o gözəl dilbər,
Dəfində çalırdı onu mütrüblər.
Qıvrılıb qalmışdı öz zülfü kimi,
Nə yuxusu vardı, nə də həmdəmi.
Didərgin Məcnun da atıb elləri,
Sərgərdan gəzirdi vəhşi çölləri.
Vəhşilər yanınca yazıq qoşaraq,
Gəzərdi çölləri qayəsiz, çılpaq.
Güclə tərpənirdi zəif bədəni,
Min dərdlə oxurdu o bir nəğməni.
Vüqarı qılmadı yerlərə səcdə,
Yenə baş götürüb yollandı Nəcdə.
Eşqin tikanına ayaq döyərdi,
Torpaq sovurardı ah olmuş dərdi.
Aşiqlər görəndə onun yasını,
Didib parçalardı öz libasını.

O yerdə mehriban, olduqca qoçaq,
Dəmir kimi möhkəm, mum kimi yumşaq,
Nofəl adlanılan bir igid vardı,
Ərəblər önündə boyun burardı.
Qılıncla ordular basardı o ər,
Lütfü bir maraldı, hirsi şiri-nər.
Ordu sahibiydi, əzəmətliydi,
O çox xəzinəli, çox dövlətliydi.
Bir gün güvənərək öz qüvvətinə,
Şikara çıxmışdı o yerdə yenə.
Qorxunc mağaralar arasında tək,
Nofəl dolaşırdı şikar gəzərək.
Ayağı qabarlı bir dərdli gördü,
Onun hər tükündən qəm tökülürdü.
O möhnət dustağı, o zəif çıraq
Düşmənə kam idi, dostlardan uzaq.
Insandan qaçmışdı o talei kəm,
Vəhşilər olmuşdu Məcnuna həmdəm.
Əqli uçurardı hər bir nəğməsi,
Qəlbi parçalardı pərişan səsi.
Məcnunun halından o tutdu xəbər,
Başından keçəni tamam dedilər.
Dedilər: "Bir qızın divanəsidir,
Bir sövda şamının pərvanəsidir.
Beytlər, nəğmələr deyir ürəkdən,
Canan qoqusunu alır küləkdən.
Yarın sorağını gətirəndə yel,
Yüz qəzəl oxuyur ürəyi tel-tel.
O yandan süzülüb gələn buluda
Baxıb sinəsindən söz deyir bu da.
Hər yerdən səfərə gəlib gedənlər
Bu məzlum aşiqə baxıb bir qədər,
Taam da, şərab da verirlər buna,
Deyirlər bir işıq düşsün ruhuna,
Min cəhddən sonra bir təhər keçir,
Yarın sağlığına bircə cam içir.

Bir budur dünyada fikri, diləyi,
Leyliyə bağlıdır onun ürəyi".
Məcnunun dərdini Nofəl eşitcək,
Dedi: "Bu məqamda kişilik gərək!
Əlimdən gələni göstərməliyəm,
Yetsin muradına bu talei kəm.
Mən ov arxasınca gəzirdim, ancaq,
Bəh, bəh, rast gəldiyim şikara bir bax".
Bu sözlər çıxınca onun dilindən,
Düşdü yel qanadlı atın belindən.
Sonra öz yanına çağırdı onu,
Süfrəyə oturtdu eşqin oğlunu.
Şirin əfsanələr danışıb əvvəl,
Məcnunu mum kimi yumşaltdı Nofəl.
Dostdan danışmayan bir söz dünyada
Onca mənasızdı hikmət olsa da...
Lakin, o gördü ki, bu cavan mərddir,
Canansız yediyi, içdiyi dərddir.
Nə cürə söhbətlər olsaydı, inan,
Leyliydi aşiqin dilində hər an.
O yolsuz divanə, o qırılmış saz
Nofəli dinləyib yumşaldı bir az.
Azacıq şadlanıb, qüssəsi keçdi.
Onunla əyləndi, yedi və içdi.
Xoşsifət görüncə müsahibini,
Söhbətə girişib açdı qəlbini.
Beyni tək qəlbi də qızışıb coşdu,
Qənd kimi dadlı bir qəsidə qoşdu.
Hər sözü, gülüşü canlı şerdi,
Od kimi bədihə, qəzəl deyirdi.
Nofəl o aşiqi çox şad eylədi,
Xərabə könlünü abad eylədi.
Dedi: "O çırağın həsrətiylə sən
Şam kimi əriyib sönməyəcəksən.
Qızıl qüvvətinə, qol qüvvətinə
Səni çatdıraram öz niyyətinə.
Quş olub havaya uçsa da o qız,

Əlim boğazından tutacaq yalnız.
Daşlar gizləsə də o qığılcımı,
Daşlara çarparam bu qılıncımı.
Sənə yar olmamış ay üzlü sənəm,
Ondan kəməndimi çəkməyəcəyəm".
Umudla açıldı Məcnunun üzü,
Nofəlin önündə büküldü dizi.
Dedi: "Könül açan bu vədəni siz
Uydurub yalandan deməyirsiniz.
Mən bir divanəyəm, o ev sonası,
Onu divanəyə verməz anası.
Küləyə verməzlər qızıl gülü, bil,
Bir div balasına ay layiq deyil.
O bizim tərəfə endirib gəlməz,
O ay divanəylə dost ola bilməz.
Nə qədər yudular bizim kömləyi,
Yenə də olmadı suyun köməyi.
Nə qədər ağ gümüş səpildi, ancaq,
Bizim qara kilim ağarmadı, bax.
Xeyir iş gəlsə də sənin əlindən,
Qismətim deyildir, talesizəm mən.
Bir qorxum budur ki, sən də doyasan,
Sən də yarı yolda məni qoyasan.
Bu şikar hədəfə gəlməzdən əvvəl
Qorxuram, məni sən atasan, Nofəl!
Qorxuram verdiyin böyük vədlər
Axırda verməsin kiçik bir səmər.
Sözünün üstündə dursan mərdana,
Allah əvəzini yetirsin sana.
Yalan deyirsənsə bu sözləri sən,
Məni özbaşıma burax indidən,
Taki öz peşəmi izləyim yenə,
Özüm öz dərdimi gözləyim yenə".
Nofəl bu nalədən pozuldu o dəm,
Dedi: "Yox... köməyi tez etməliyəm".
Gördü ki, o gəncdir, özü də qərib,
Xəyalı azaddır, qəlbi müztərib.

Məcnuna bir yoldaş, bir qardaş oldu,
Hal bilib, hal duyan bir sirdaş oldu.
Əhd edib, əl açdı Nofəl dərgaha,
Ən əvvəl and içdi böyük allaha,
Sonra da and içdi peyğəmbərlərə,
Əqli, iradəsi dedi bir kərə:
"Bu vəfa yolunda qılınc çəkərək,
Qurd deyil, aslan tək döyüşəm gərək.
Bacarıb çatmasam bu xoş murada,
Rahət gün görməyim bir də dünyada.
Lakin xahişim var, bu sözümü tut,
Divanə qalma, gəl bu dərdi unut.
Azacıq sakit ol, döymə köksünə,
Özünü toxtaq tut iki-üç günə.
Gəl, odlu qəlbini kənara qoy sən,
O dəmir qapını tez açaram mən".
Içdi bu şərbəti bizim zavallı,
Qurtuluş gözlədi sövda xəyallı.
O artıq qaçmadı insandan bir də,
And içib, əhd etdi durduğu yerdə.
Səbr ilə bağlandı onun ayağı,
Sanki su səpildi, söndü ocağı.
Sığındı dostunun bu pənahına,
Gedib ayaq basdı qərargahına.
Hamama gedərək, paltar dəyişdi,
Artıq aram olub şərab da içdi.
Ərəb qaydasınca əmmamə qoydu,
Musiqi dinlədi, şərabla doydu.
Yarın camalını saldı yadına,
Dediyi qəzəllər yetdi dadına.
Dostuna yandıqca Nofəlin qəlbi,
Başına dürr səpdi bulutlar kimi.
O yedi, dincəldi, əynində libas,
Artıq gözəlləşdi siması bir az.
Saralmış rənginə qızartı gəldi,
Yay kimi bükülmüş qəddi düzəldi.
Yenə şəvə kimi qararmış xətti

Onun ay üzünə bir dövrə çəkdi.
O ətirli güldən şirə çəkərək,
Nə aparmışdısa, qaytardı külək.
Güldü dodaqları bir səhər kimi,
Parladı dişləri incilər kimi.
Artıq ağıllandı çöl divanəsi,
Kəsildi zəncirin pərişan səsi.
Yenə bağ içində boy atdı lalə,
Qızıl gül əlinə aldı piyalə.
Indi Məcnundakı əzəmət, vüqar
Hikmət məclisinə oldu hökmüdar...
O qonaqcıl Nofəl, o böyük adam
Məcnunu yüz nazla bəslərdi müdam.
Məclisi, şadlığı onsuz keçməzdi,
Üzünü görməsə bir mey içməzdi.
Onlar iki-üç ay şən keçirdilər,
Mehriban oturub şərab içdilər.

**MƏCNUNUN NOFƏLƏ ACIQLANMASI**

Bir gün ikilikdə oturmuşdular,
Yenə məclis açıb keyf qurmuşdular.
Məcnun zəmanəyə nifrət deyirdi,
Şerlər qoşaraq qəmlər yeyirdi:
"Ey mənim ahımdan xəbərsiz duran,
Aldadıb külümü göyə sovuran,
Yüz dostluq vədəsi verdinsə də sən,
Yarım dostluğa da vəfa etmirsən.
Gəl öz başındakı xəyalı unut,
Sən mənim sözümü, ilticamı tut.
Məni ağ yalanlar felinə verdin,
Yenə kimsəsizlik əlinə verdin.
Söz verdik dostluğa, səmimiyyətə,
Indi göz yumursan sən bu niyyətə.
Səndən mən eşitdim yüz dil yarası,
Görmədim bir dərman, bir dərd çarası.
Səbrim tükənmişdir, şaşqınam bu dəm,

Dadıma yetməsən əldən gedərəm.
Əvvəl bir yazığın dərdinə qalmaq,
Sonra öz sözünün ziddinə olmaq
Bil ki, böyüklükdən uzaqdır, məncə,
Dostluğun vəfası budurmu, səncə?
Vəfasız bir vədi vermə insana,
Layiq görməyirəm mən bunu sana.
Köməksiz, arxasız, qərib bir quşam,
Dirilik suyundan uzaq uçmuşam.
Xərabə bir kəndə xəzinə vermək,
Susuza su vermək şərt olsun gərək.
Bil ki, müşkülümü tez düzəltməsən,
Yenidən divanə olacağam mən.
Gəlməsə sevgilim-bəxtiyarlığım,
Bil ki, məhv olacaq bütün varlığım".

## LEYLİNİN QƏBİLƏSİ İLƏ NOFƏLİN MÜHARİBƏ ETMƏSİ

Nofəl bu xoş olan umu-küsüdən
Odlarda mum kimi yumşaldı, bilsən.
Qalxıb hazırlaşdı yol səfərinə,
Havada parladı qılıncı yenə.
Atlandı quş kimi o böyük hünər,
Toplandı başına sadiq igidlər.
Atının nalından odlar qoparaq,
Meydana şir kimi girdi çaparaq.
Elə ki, yetişdi o qəbiləyə,
Bir elçi çağırdı, sözüm var, deyə,
Nofəl ismarladı: "Öz ordumla mən
Od kimi keçərəm üzərinizdən.
Bu saat Leylini gətirin mana,
Qılınc girəcəkdir yoxsa meydana.
Göstərin Leylini, hardadır o qız?
O öz aşiqinə yetişsin yalnız.
Qoy, susuz can verən bir suya çatsın,

Ona su verən də savaba batsın".
Çatdı qəbiləyə Nofəlin səsi,
Sındı ortalıqda eşqin şüşəsi.
Cavab verdilər ki: "Bu mümkün olmaz,
Leyli ayparadır, düşünün bir az.
Ona əl yetişməz, aydır o dilbər,
Heç kəsin əlindən gəlməz bu hünər.
Qılınca qılıncla qisas alarıq,
Qarurə atsan da daşa çalarıq".
Qasid baş götürüb qayıtdı geri,
Nofələ söylədi haman sözləri.
Nofəl acıqlanıb, dedi qasidə:
"Bu saat piyada qayıdıb yenə,
De: - Dadmamışsınız qılıncımı siz,
Bu köhlən atımdan xəbərsizsiniz,
Dəniz dalğasıyam, qaçın qarşımdan,
Yoxsa tufan qopar hər bir daşımdan.
Qasid yenə gedib cavab gətirdi,
Nofələ nalayiq sözlər yetirdi,
Nofəl acıqlandı qəzəblənərək,
Köksündə od tutub alışdı ürək.
Sonra qılıncını çəkdi dörd yana,
Qoşunla şir kimi girdi meydana.
Onlar da qabağa ordu tökdülər,
Dağ kimi tərpənib nərə çəkdilər.
Nofəlgil tərəfə at oynatdılar,
Şirin qarşısına qılınc atdılar.
Coşdu dəniz kimi, qızışdı meydan,
Havadan od yağdı, gölə döndü qan.
Qılıncın əlində qan piyaləsi,
Torpağı məst etdi bu qan laləsi.
Aslanlar gəldikcə pəncə-pəncəyə,
Toqquşdu nizələr, intiqam, deyə.
O tökülən qanlar çatdıqca dizə,
Oxlar quzğun kimi töküldü düzə.
Qılınclar beyinlə şirələndikcə,
Bədəndən ayrılan başlar əndikcə,

Qızmış ərəblərin o nərəsindən
Göylərin qulağı kar oldu bilsən.
Əcəl ildırımı şığıyan zaman
Alov püskürürdü daşın ağzından.
Deyləmi tükünün ucları kimi
Qəhr edən zubinin ucu itiydi.
Günəş on cıqqalı bayrağa bənzər,
Sanki qızarmışdı yenə ilk səhər.
Daşlar deşik-deşik Sürəyya kimi,
Yer qana dönmüşdü bir dərya kimi.
Hər şirin baxışı alov saçmışdı,
Qara ilan kimi ağız açmışdı.
Yırtıb dağıtdıqca o qara şirlər,
Ağ atlar div kimi əlləşirdilər.
Hər kəs bu döyüşə atlanan zaman
Məcnun can verirdi ruhu pərişan.
Hamı at çapdıqca müharibəyə,
O dua edirdi barışıq deyə.
Hər kəs çıxardıqca düşmən gözünü,
O həlak edirdi dərddən özünü.
Açıb öz qəlbində dua yelkəni,
Sülhə çağırırdı müharibəni.
O utanmasaydı, qalxıb durardı,
Bulud tək özünə qılınc vurardı.
El qınamasaydı bu dəmdə onu,
Qırıb qurtarardı öz qoşununu.
Olmasa düşmənin tənəsi əngəl,
Dostların başını kəsərdi əvvəl.
Təqdir kamanına çatsaydı əli,
Ox atıb dostları qırardı, bəli.
Onun dediyini desəydi ürək,
Öz yoldaşlarını qırardı, gerçək.
Bu qoşun içində coşurdu Məcnun,
Istərdi ki, bassın o biri qoşun.
Burda axtarışa at səyirdərdi,
Ordakı qoşuna dua edərdi.
Öz tərəflərindən ölsə bir nəfər,

Onu öldürənin əlindən öpər.
Leyligil tərəfdən məhv olanlara
Göz yaşı tökərdi bu bəxti qara.
Bu yandan o yana nizə tutardı,
Düşmən nizəsinə duası vardı.
Bəzən öz qoşunu gələndə üstün
Atardı kamanı, oxu büsbütün.
Elə ki, yar tərəf qalib gələrdi
Şir kimi nərəsi dağlar dələrdi.
Bir nəfər soruşdu: "Niyə, ey cavan,
Döyüşdən çarx kimi kənar qaçırsan.
Biz sənin uğrunda can qoyuruq bil,
Düşmənlə dostluğun heç insaf deyil".
Dedi: "Sevgilimdir dediyin əğyar,
Mənim qılınclarla nə işim aşar.
Düşməni qanına qərq etmək olar,
Dostla vuruşmağın mənasımı var?
Döyüşdən su kimi qanlar çağlayır.
Canansa o tayda yara bağlayır.
Məşuqə verdikcə aşiqə nəfəs,
Aşiq də verməli ona bir əvəz.
Yar sürmə göndərir ayaq tozundan,
Mən ona daş atsam, qıyarmı vicdan?
Mənə bal vədəsi vermişdir o yar,
Mən sirkə göndərsəm layiqmi olar?
Yarın əli varsa o yanda əgər,
Kim canan tərəfi zəlil istəyər?
Ordadır istəyim, qəlbim, həvəsim,
Qəlbim hardadırsa orda nəfəsim.
Canana can vermək xoşdur əzəldən,
Canmı əsirgəyim mən o gözəldən?
Mən ki, öz canımdan keçmişəm belə,
Yazığım gələrmi sizlərə, söylə! "
Soruşan bir ona, bir yerə baxdı,
Göz yaşı torpağa sel kimi axdı.
Məcnunsa döyüşdən uzaq düşərək,
Tozların içində oynayırdı tək.

Nofəl qılıncını çəkib dörd yana,
Bir sərxoş fil kimi girib meydana,
Hər oxda bir nəfəs, bir can alardı,
Hər bir həmləsində cahan alardı.
Qan arxı çəkirdi gəzdiyi yerdə,
Qan yeyib-içməkdən doymuşdu yer də.
Qılınc oynadırdı şöhrət gəzənlər,
Axşam qaranlığı çökənə qədər.
Canan zülfü kimi qaraldı göylər,
Gündüzün üzünə töküldü ənbər.
Siyah tellərini düzdükcə gürcü,
Qaraldı get-gedə göylərin bürcü.
Bu zaman ayrıldı düşmən qoşunlar,
Döyüş meydanında yatışdı onlar.
Elə ki, o qara ilan büküldü,
Ağ nəfəsli Zöhhak-günəş də güldü.
Qalxdı hər pəhlivan, hər igid əsgər,
Zöhhak ilanına döndü nizələr,
Qoşunla dolmuşdu Leylinin yurdu,
O yerdə dağ kimi ordu dururdu.
Düşməni qarşıdan, arxadan səf-səf
Oxlara tutmuşdu Leyligil tərəf.
Nofəli qorxutdu o daşğın ordu,
O artıq, sülh üçün dayanıb durdu.
Öz adamlarından tapıb bir nəfər,
Tapşırdı: "Sülh üçün bir tədbir göstər.
De ki, qan tökməyə gəlməmişik biz,
Yalnız bir könüldür istədiyimiz.
Divanə bir gəncə söz vermişəm mən,
Yalnız bir gözəldir istəyim sizdən.
Öz dövlətimdən də keçirəm bu dəm,
Sizə xalvar-xalvar qızıl verirəm.
Məsləhət görsəniz bu sövdanı siz,
Qəlb açan bir cavab verməlisiniz.
Şəkər satmasanız bu yerdə bizə,
Sirkə də tökməyin istəyimizə.

Yaxşılıq gəlməsə əllərinizdən,
İntiqam almayın qılıncla bizdən..."
Elçi bu sözləri verincə xəbər,
Qızmış orduları geri çəkdilər.
Hamıya xoş gəldi bu gözəl dilək,
Ordular döyüşdən geri dönərək,
Barışıq nəğməsi çaldıqca, çənglər,
O qanlı döyüşdən qalmadı əsər.

**MƏCNUNUN NOFƏLƏ ACIQLANMASI**

Sülhün qoqusunu duyunca Məcnun
Kinlə qəzəbləndi ürəyi onun.
O igid Nofələ acıqlanaraq,
Rişxəndlə dedi ki: "Qəhrəmana bax!
Sən, ey qucaq-qucaq vədlər verən,
Yaman başa vurdun öz vədini sən.
Buydumu sözündə möhkəm durmağın?
Bir də at oynadıb qılınc vurmağın?
Danış, qəribliyə salma sorğumu,
Vəhşini ram edən əfsunun bumu?
Buydumu meydanda at oynatmağın?
Havada ox tutub kəmənd atmağın?
Zidmiş iradəmə sənin iradən,
Nə yaxşı bir hünər göstərmisən sən?!
Salam düşməniydi o canan mənə,
Indi sən döndərdin tamam düşmənə.
Vəfaya açılmış o qapıya sən
Min qıfıl vuraraq bağladın nədən?
Ey dost, köməyindən əlim üzüldü,
Işimi korladın, belim büküldü.
Bu dostluq telləri qırıldı nədən?
Çox şahlar yıxılmış bir süvaridən.
Qurda ox atdısa dağlarda çoban,
Gedib itə dəydi aldığı nişan.
Hünərin aləmə səs salan zaman
Əfsus ki, əhdini ayaqlayırsan.

Bu acı sövdaya düşməmişkən mən
Sənə bel bağlardım bəlkə ürəkdən.
Bu yazıq aşiqdən niyə vaz keçdin?
Əkmədiyin yeri nə üçün biçdin?
Sən ki, başlamışdın bu böyük işi,
Hünəri yarımçıq qoyarmı kişi?
Qaranlıq könlümə işıq verənsən,
Bu xəstə ömrümün dərmanı sənsən."
Döyüş qalxanını ataraq, əvvəl
Şirin dilə tutdu Məcnunu Nofəl;
Dedi: "Qoşunsuzam, köməksizlikdən
Siyasət işlədib sülhə girdim mən.
Qayıdıb yurdumdan qüvvət alaram,
Yenə qılıncımı işə salaram.
Qoşun toplayaraq qəbilələrdən,
Daşdan keçirərəm poladımı mən.
Qılıncla basmasam o qudurğanı".
Kor olsun Nofəlin qəlbi, vicdanı".
Sonra Mədinədən Bağdada qədər
Qoşun toplamağa getdi elçilər.
Nofəl hiddətindən yandı bir zaman,
Qoşun tələb etdi bir çox diyardan.
Nəhayət, topladı böyük bir ordu,
Dağlara döş gərib üz-üzə durdu.
Birinci hücumda sərhəddi aşdı,
Düşmənlər kor olub qorxudan çaşdı.

**NOFƏLİN İKİNCİ MÜHARİBƏSİ**

Bu söz gövhərini tapıb kəşf edən
Dastan qapısını açır sinədən:
Nofəlin başına toplaşan ordu
Heyrətə salmışdı böyük bir yurdu.
Nərədən torpağın bağrı söküldü,
Buqəbis zirvəsi yerə töküldü.
Onun nərəsindən titrəyən düşmən

Döyüş meydanında səf çəkdi həmən.
Qəbilə başçısı donuxub qaldı,
Nofəl ordusunun seyrinə daldı.
Gördü ki, nizələr almış hər yeri,
Ordu bulud kimi tutmuş göyləri
Təbil nərələri gəldikcə bəzən
Ölünün qəlbi də qopur yerindən.
Nofəl ordusunu görəndə düşmən,
Nə hərbə meyl etdi, nə qaçdı hərbdən.
Hücuma girişdi "bəxtə-bəxt" deyə,
Atını səyirtdi müharibəyə.
Ordular gəldikcə orda baş-başa,
Endi şimşək kimi qılınclar başa.
Qumları sel kimi apardıqca qan,
Əqiq göyərirdi sarı qumlardan,
Ürəklər yoruldu ciyər yarmaqdan.
Qılınclar utandı baş qoparmaqdan.
Nofəl qılınc çəkib qalxan tutaraq,
Hər hücum başında yıxırdı bir dağ.
Əъdahalar kimi qızıb meydanda,
Bir nəfəs kəsirdi o hər bir anda.
Şir kimi getdikcə Nofəl irəli,
Oxlara dönmüşdü sərt kirpikləri.
Hirsdən çatıldıqca qəzəbli qaşlar,
Toppuz zərbəsindən uçurdu başlar.
Gürzlü çomağını endirən zaman
Elburs dağı da uçardı, inan.
Hər kəsə bir qılınc vursaydı Nofəl,
Onu varaq kimi doğrardı əl-əl.
Məcnun da həvəslə hərbə gedirdi,
O həlak olmağa çox səy edirdi.
Döyüş meydanları qızışdığı vaxt
Tabut taxtasına dönmüşdü hər taxt.
Bir olsa yoldaşın, dostun əməli,
Daşdan su çıxardar onların əli.
Nifaq olan yerdə fəlakət də var,
Səadət günəşi birlikdən doğar.

O gün nofəlçilər qalib gəldilər,
Onların bəxtinə açıldı səhər.
Düşmən cəbhəsini yarıb sökdülər,
Baş-başa, leş-leşə vurub tökdülər.
Can verib öldükcə yaralananlar,
Ah çəkib sönürdü darda qalanlar.
Əsib kükrədikcə ölüm ruzgarı,
Leyligil tərəfin ağsaqqalları
Aman istədilər igid Nofəldən,
Yalvarıb dedilər: "Düşmüşük əldən.
Çəkmə qılıncını gəl indən belə,
Hamını ölmüş bil, əsir zənn elə.
Bizi qırmağından bir fayda varmı?
Igid basdığını boğazlayarmı?
Iki-üç nəfərik, olmuşu unut,
Əlinə ox alma, əlimizdən tut.
Gəl bu qiyaməti əlindən burax,
Qiyamət günü var... o dünyaya bax.
Düşmən silahlansa qarşında əgər,
Sən də qılınc vurub qüvvəni göstər.
Lakin, silah töksə qarşında düşmən,
O miskin düşmənlə gəl vuruşma sən.
Artıq tutmayırıq üzünə qalxan,
Gəl bağışla bizi sən, ey qəhrəman!
Qılıncla, nizəylə dindirmə bizi,
Görürsən qalxansız əllərimizi".
Nofəl bu naləni dinləyib o dəm,
Keçmiş günahlara çəkdi bir qələm.
Əmr etdi: "Gəlini gətirin ki, mən
Xoşluqla əl çəkim bu qəbilədən".
Leylinin atası, ürəyi qəmli,
Torpağa üz qoydu gözləri nəmli.
Yalvardı Nofələ: "Ey böyük insan,
Güvənir tacına bu Ərəbistan.
Dərdli bir qocayam, ürəyimdə qəm,
Səndən uzaq olsun, yaman gündəyəm.
Qorxaraq ərəbin tənələrindən,

Əcəm ləqəbini gəzdirirəm mən.
Başımın dərdinə, sövdasına bax,
Bəxtimdən görürəm mən bunu ancaq,
Xəcalət çəkirəm bu günahımdan,
Civə tək ərimək istərdim, inan.
Qızımı qarşına gətirsəm də, bil,
Quluna versəm də, əskiklik deyil.
Yenə fəxr edərəm, gəl inan ki, sən,
Boyun qaçırmaram sənin hökmündən.
Çöldə od yandırıb ocaq da çatsan,
Qızımı ud kimi oda da atsan,
Ya quyu dibinə tullasan onu.
Ya da qılınc çəkib vursan boynunu,
Bil ki, ağ olmaram üzünə yenə,
Can-başla hazıram hər bir əmrinə.
Baharda bir təzə gül olsam da mən,
Boyun qaçırmaram sənin əmrindən.
Ancaq, o dəliyə layiq deyil qız,
Dəliyə bir zəncir yaraşır yalnız.
Ay üzlü bir qıza sərsəm yararmı?
Çör-çöpün yanında od qalanarmı?
O, gicdir, mərd deyil, yoxdur sənəti,
Nə dünyası vardır, nə axirəti.
Dağları, daşları gəzir o sərsəm,
Inan, divanədir, dəlidir desəm.
Pis-pis adamlarla oturub durur,
Mənim adıma da min ləkə vurur.
Mərdə təmiz bir ad candan əfzəldir,
Ləkəli qalmaqdan ölüm gözəldir.
Ərəb torpağında küləklər belə
Qızımı salmışdır ağıza, dilə.
Leylinin adını o, dilə saldı,
Balam bu dünyadan min töhmət aldı.
Məcnuna tapşırsan cilovumu sən,
Mənə güləcəkdir hər yoldan ötən.
Bir nəhəng ağzında qəhr olub ölmək

Alçaq bir ömürdən xoş olsun gərək.
Bədnam olmağımı qoyma, amandır!
Qiyamət günü var... o, imtahandır.
Indi bu naləmə, dərdimə çatsan,
Dünyada xoşbəxt ol, sevin hər zaman.
Yoxsa, and içirəm bir allaha mən,
Əlimi çəkərəm ətəklərindən,
Ay üzlü balamın vurub boynunu,
Itin qabağına ataram onu.
Taki bu qeyrəti çəkməyim bir də,
Ölüb, öldürməyim durduğum yerdə.
Qoy mənə yer üzü lənətlər desin,
Qızımı divdənsə köpəklər yesin.
Insanı dinləsə azğın bir quduz,
Onun məlhəmi var, keçər, qorxusuz.
Lakin dil yarası ürəkdən getməz,
Ona min məlhəm də bir əsər etməz".
Nofəl dinlədikcə rəngi saraldı,
Söz tapa bilməyib cavabsız qaldı.
Qoca danışdıqca açıq, mərdana,
Nofəl yumşalaraq: "Qalx-dedi ona.
Bu gün bir sərkərdə olsam belə mən
Xoşluqla istərdim qızını səndən.
Indi ki, vermirsən, canın sağ olsun,
Mən zalım deyiləm, üzün ağ olsun.
Quru bir çörəklə, şor bir halvadan
Pisdir zorla gələn bir arvad, inan.
Dualar ardınca dolaşıram mən,
Belə cəfalardan bezaram, bilsən".
Nofələ dil açdı yaxın adamlar,
Dedilər: "Qocanın nə günahı var?
Məcnun xoş gəlməsin gözünə sənin,
Mənliyi alçaqdır o divanənin.
Bir qadın doğrudan sevsə də onu,
Fəlakət törədər bu eşqin sonu.
Havalı yaşayan sərsəm bir insan.
Nə xeyrə, nə şərə yarayar, inan.
Ona neyləsən də ağıla gəlməz,

Yoxdur iradəsi, durub dincəlməz.
Dünən biz onunçun döyüşən zaman
Qələbə istərdi düşmənə hər an.
Oxlara gərmişdik biz sinəmizi,
O da oxlayırdı bir yandan bizi.
Bu iş ağıllının işi deyildir,
Ona ağlamaq da, gülmək də birdir.
Bu gün yetirsək də canana onu,
Açıq görünür ki, matəmdir sonu.
Düz ölçüb biçməsən bu işi, ey mərd,
Biz zərər çəkirik, siz də xəcalət.
Adımız, sanımız bizə əfzəldir,
Bu işdən əl çəkmək daha gözəldir".
Nofəlin qəzəbi soyuyub söndü,
Qoşuna əmr edib, geriyə döndü.
Məcnun yaralandı bu bəd xəbərdən,
Min tikan sancıldı qəlbinə birdən.
"Ah, - dedi, - çatmışdı visal üçün vaxt,
Öldü, oyanmadı, oyanmadı baxt.
Bəxtimin vəfası olsaydı mana,
Özüm tək olardı dostum mərdana".
Gözündə yaş seli, qəlbində vulkan,
Nofəlin yanına gəldi pərişan.
Dedi: "Ey dostluğa qadirəm deyən,
Söz verib, sonradan sözünü yeyən,
Mənim ki, üzümə gülürdü səhər,
Rəvamı qəlbimdə sönsün ümidlər.
Nə üçün buraxdın ovumu əldən,
Biz ki, əl vermişdik, unutdunmu sən?
Susuzdum, apardın sən "Fərat" deyə,
İçməmiş odlara tapşırdın niyə?
Şəkərdən bir şirin şərbət qayırdın,
Ondan da içməmiş məni ayırdın.
Qarşıma açdınsa şirin süfrəni,
Sonra milçək kimi qovladın məni.
İpin ki, ucunda bu düyün vardı,
Ona dəyməsəydin yaxşı olardı".

Deyib bu sözləri getdi çaparaq,
Atının nalından odlar qoparaq.
Ona çox dedilər, çox yalvardılar
Ki: "Sənə bundan da yaxşı bir nigar -
Hörmətli, hünərli, dövlətli, mallı,
Bir gümüş sinəli; günəş camallı,
Işinə yarayan bir qız taparıq,
Bu yeri axtarıb soraqlaşarıq,
Ta işin onunla tamam düzəlsin,
Dövlət də qapına qayıdıb gəlsin".
Çox umud verdilər aşiqə bir-bir,
Könlünün düyümü açılmadı bir.
O çıxdı ortadan iz azdıraraq,
Qəlbi bulud kimi tutuldu ancaq.
Göz yaşı tökürdü o qəlbi xəstə,
O tiryək səpirdi zəhərin üstə..
Artıq öz mülkünə qayıtdı Nofəl,
Yetişcək yurduna hər şeydən əvvəl
Çağırtdı o cəfa görmüş Məcnunu
Ki, ürək verərək dincəltsin onu.
Axtaran çox oldu, tapan olmadı,
Artıq siyahidən silindi adı.
Bildilər, nə imiş bu səssiz gediş,
Onun tənəsinə səbəb nə imiş...

**MƏCNUNUN AHULARI AZAD ETMƏSİ**

Dinləyin bu ötən, sədəfli sazı,
Görün nələr deyir onun avazı:
Murada çatmamış o yaralı quş,
Qəlbi intizara, dərdə tutulmuş,
Nofəldən ayrılıb çapdı atını,
At açdı çöllərdə yel qanadını.
Nofəl, o əhdinə çıxdı vəfasız,
Məcnun oxuyurdu səhrada yalqız.
Hər kiçik təpəyə üz tutub bəzən,

Şikayət eylərdi öz taleindən.
Göz yaşı tökərək o yürüyürdü,
Uzaqdan qurulu bir tələ gördü.
Tələyə düşmüşdü bir-neçə ceyran,
Yazıqlar bağlıydı əldən ayaqdan.
Qəsdinə durmuşdu ovçu onların,
Qanını tökməyə o ceyranların.
Məcnun səyirtdi ki, yetsin köməyə,
Ovçu da dayandı: "Gələn var" deyə.
Dedi: "Tələ üstə çıxmışam birdən,
Adət qonağıyam, özün bilirsən.
Ahular başından götür táləni,
Onları azad et, sevindir məni.
Yazıq heyvanlara nə qəsdin vardır?
Onlar həyat üçün yaranmışlardır.
Gözləri göyçəkdir, baxışları şad.
Onlar da əzəldən yaranmış azad.
Necə qıyırsan ki, bir həmlədə sən
İki-üç qan töküb nəfəs kəsəsən.
Qurd olsa bir adam zatında əgər,
Bu qurd o ceyranın qanını tökər.
Yar gözü kimidir ahunun gözü,
İlk bahar gününə bənzəyir üzü.
Yar gözü eşqinə rəhm et ceyrana,
Bahar xatirinə gəl qıyma ona.
Boynunu vurma gəl, bivəfa deyil,
O şümal gərdənə ip rəva deyil.
O xallı boynundan gəl indi vaz keç,
Ona polad qılınc yaraşırmı heç?
O qara gözlərin sürməsi də var,
Rəvamı torpaqla örtülə onlar?
Gümüş həsəd çəkir o saf sinəyə,
Yanıb kabab olsun, kül olsun niyə?
Nazla bəslənmişdir şümal sağrılar.
Danış, layiqmidir ona ağrılar?
Ahu göbəyindən mişk alınar, bil,
Qanını tökməyin insafdan deyil.

O zərif ayaqlar bir xeyzərandır,
Onları incitmə, qıyma, amandır!
Yükə qatlaşmamış o incə kürək,
Yerə vursan onu o inciyəcək".
Ovçu bu öyüdü dinləyib daldı,
Donaraq barmağı ağzında qaldı.
Dedi: "Yoxsulluğa düşməsəydim mən,
Boyun qaçırmazdım bu sözlərindən.
Iki ay içində şikarım budur,
Külfətim bir buna göz tikib durur.
Ehtiyac içində qalan bir ovçu
Ovunu öldürsə olarmı suçu?
İstəsən, onların gəl qeydinə qal,
Onların canını məndən satın al".
Məcnun dinləyərək yoxsul ovçunu,
Atından tez düşüb çağırdı onu.
Ovçuya verərkən ceyran atını,
Açdı ceyranların qol-qanadını.
Ovçu tez minərək atı yol aldı,
Məcnun ceyranlarla səhrada qaldı.
Mərhəmətlə deyil, sevgiylə qəlbən
Öpdü ceyranların qara gözündən.
Bu yar gözü deyil, ona oxşardı,
O qara gözlərdən bir yadigardı.
Onlara mərhəmət diləyib haqdan,
Açıb xilas etdi qanlı duzaqdan.
Özü də çöllərdə fəryad çəkərək,
Ahular dalınca yüyürürdü tək.
Düşməni yoxsa da, silahı vardı,
Gül tək silahından yara alardı.
O isti qumların odlu qoynunda
Qazan tək qaynayıb coşurdu o da.
Havalar qızırdı çəkdiyi ahdan,
Əynini cırırdı çöldə hər tikan.
Gecənin üzünə zülmət gələndə,
Ayın pərdəsində gün gizlənəndə
Məcnun nalələrdən cana gəlmişdi,

İpək teli kimi çox incəlmişdi.
Yarın saçları tək qaraydı gecə,
Yol aşiq canı tək olmuşdu incə.
Məcnun ilan vurmuş kərtənkələ tək,
Yanıb qovrulurdu mağarada tək.
Yerdə qıvrılırdı bir ilan kimi,
Odlara qalanmış bir tikan kimi.
Sübhə dək gözləri yuxusuz qaldı.
Ömrü gecə kimi ahla qaraldı.

**MƏCNUNUN MARALI AZAD ETMƏSİ**

Çəkdi bayrağını gülüzlü səhər,
Yenə al şəfəqə boyandı göylər.
Bax, Çinin aynası parladı Çindən,
Həbəşin qaşları çatıldı birdən[88].
Paslı ayna kimi ürəyi tutqun,
Xəyal aynasını gəzdirən Məcnun
Oddan tüstü kimi qalxdı bu zaman,
Ənbər saçılırdı gül varlığından.
O, aşiq qəlbiylə dalıb xəyalə,
Gedirdi dilində şerlə nalə.
Pərişan gözləri yol süpürürdü,
Könlündən keçəni allah görürdü...
O birdən yetişdi şikar yerinə,
Qurulmuş tələyə rast gəldi yenə.
Gördü ki, tələyə düşmüş bir maral,
Boynunda zəncir var, alnında zaval.
Ovçu o gülüzlü maralı görcək,
Ona hücum çəkir qızmış aslan tək.
Istədi axıtsın günahsız bir qan,
Nə çıxar günahsız tökülən qandan?
Məcnun tez ovçunun yanına qaçdı,
Ona neştər kimi dilini açdı:
"Ey zalım iti tək yazığı tutan,
Aç qurduğun toru, zülmündən utan.

Qoy, bu tora düşmüş zavallı əsir
Gəzib, bir-iki gün şad yaşasın bir.
Gəl onu sən salma tor havasına,
Getsin öz tayıyla öz yuvasına.
Onu sevgilisi tapmasa əgər,
Bu gecə arxanca nə sözlər deyər?
Deyər: - Səni məndən alan ovçular
Ayrılıq dərdinə olsunlar düçar.
Qoy səni ovlayan mən günə düşsün,
O da yar gözündən sürgünə düşsün. -
Dərd duya bilirsə səndəki ürək,
Öz tamah dişini bu ovdan gəl çək.
Neylərdin qəfəsdə özün qalsaydın,
Maral ovçu olub, sən ov olsaydın?
Söylə taleinə şükr edirmisən
Ki, ov maral olmuş, ovçusu da sən?"
Ovçu nəsihəti dinləyib bu dəm
Dedi ki: "Bu qandan mən əl çəkirəm,
Vurmaram maralın buruq boynunu,
Ancaq, havayı da vermərəm onu.
Bu ovla dolanıb yaşayıram mən,
Satın al maralı məndən istəsən".
Alıb silahını, sazını Məcnun
Ovçuya uzadıb dedi: - Buyurun.
Ovçu silahı da, sazı da aldı,
Maral azad oldu, salamat qaldı.
Ata öz oğlunu əzizləyən tək,
Məcnun da maralı əzizləyərək,
Tutub sığalladı o dildarını,
Bağladı heyvanın yaralarını.
Onun gövdəsini çox tumarladı,
Maraldan daha tez özü ağladı.
Dedi: "Həsrət çəkən dağlar maralı,
Səndəmi tayından düşdün aralı?
Ey çöl qoşununun gözəl sarbanı,
Dağlar döşündəki çadırın hanı?
Xoş ətrin canandan gətirir xəbər,

Gözün sevgilimin gözünə bənzər.
Bu tordan ayağın qoy azad olsun,
Yetiş öz tayına, o da şad olsun.
Səndən iraq olsun düşmənin fəndi,
Boynuna keçməsin şahlar kəməndi.
Dişlərin keçməsin qızıl qapağa,
Yaraşır səndəki sədəf dodağa.
Oxların yayına yarıyan dərin
Öz paltarın olsa yaxşıdır sənin.
Zəhri əritsə də isti göz yaşın,
Axmasın üstünə torpağın, daşın.
Sən ey mərd sinəli, ucaboy maral,
Mən qəlbi yanmışın halına bir qal.
Bilirəm genişdir gəzdiyin hasar,
Hasardakı aydan bir xəbərin var.
Otladığın zaman o tərəfdə sən
Yara əhvalımı açıb deyərsən:
Düşmən qaxıncına qurban olan yar,
Əmrinə hazıram, nə istəyin var?
Biz ayrı düşəli əziyyətdəsən,
Sən də mənim kimi bu möhnətdəsən.
Bir qoca dost da yox imdada yetsin,
Bir ox da yoxdur ki, hədəfə getsin.
Ah! Sənin qoqunu verməsə külək,
Onun da adını çəkməyir ürək.
Xəyal da anmasa, duymasa səni,
Yoxdur varlığımda onun məskəni".
Məcnun ağlayaraq bu qəribliyə,
Dərdini bir deyil, yüz deyə-deyə,
Yazıq maralcığın açdı torunu,
Gözlərindən öpüb buraxdı onu.
Qaçdı səhralara tor görmüş maral,
Məcnun öz yoluna başladı dərhal.
Gecənin yolçusu yetişdi haman
Bir Yusif camalı aldı quyudan[89].
Ulduzlar içində o parladı tək,
Göy Misri Nil kimi coşmuşdu, gerçək.[90]

Gözü dağlı çölü mil-mil gəzərdi,
Nil rəngində axan Nilə bənzərdi.
Nə suya quş kimi dimdik vurardı,
Nə də ilan kimi dil çıxarardı.
Qıvrılıb qəlbindən vurulmuş kimi,
Ötməzdi qanadı sınmış quş kimi.
Alışıb yanardı beyni, damağı,
Sanki əriyirdi bir piltə yağı.
Şam kimi sönsə də o birdən-birə,
Yenə də qoymazdı yanını yerə.

**MƏCNUNUN QARĞA İLƏ SÖHBƏTİ**

Açdı gözlərini yuxudan səhər,
Sarı köynək geydi o mavi göylər.
Güldü o sarı gül, o göylər qızı,
Dünya başdan-başa geydi qırmızı.
Məcnun xəzan görmüş gül kimiydi, ah!
Gözündə ağlardı gülüzlü sabah.
Bu sonsuz sulara od düşən zaman
O da gəmisini çəkirdi sudan.
Günəşdə yandıqca əli, ayağı,
Nəfəsdən düşmüşdü günorta çağı.
Çılpaq qaldığından o, kölgələr tək
Oturdu bir ağac kölgəsində tək.
O hündür ağacın kölgəsində, bax,
Sular axışırdı şırıldayaraq.
Göy kimi, girdə bir hovuz ki, vardı,
Suyu kövsər kimi parıldayardı.
Onun dövrəsini almışdı otlar,
Yaşıl geyinmişdi o yerdə bahar.
Ciyəri istidən kababa dönən
O sudan doyunca içərək həmən,
Kar kimi, lal kimi dinib danışmaz,
Ayaq saxlayaraq dincəldi bir az.
O yaşıl çəmənə heyran qalmışdı,

O gözəl ağacı seyrə dalmışdı.
Budaqda qaraca bir qarğa vardı,
Gözü çıraq kimi işıq salardı;
Gözəllər saçı tək qaraydı rəngi,
Baxdıqca oxşardı qəlbi, ürəyi.
Saleh bir quş idi o yazıq qarğa,
Salehilər kimi geymişdi qara[91]
Sakitcə durmuşdu budaqda o quş,
Sanki mina üstə şəvə oturmuş.
Məcnun fikrə getdi görəndə onu,
Duydu qəlblərinin bir olduğunu.
"Sən, ey yas libaslı, aç, söylə barı,
Nədir əynindəki bu yas paltarı?
Nədəndir, gecənin rəngi var səndə?
Qara günlərəmi düşmüsən sən də?
Qəmə mən yanıram, alışansa sən,
Mənim əvəzimdə qara geymisən.
Ürəyin yanıqlı deyilsə bu dəm
Nədən qaralmısan, ey dərdli həmdəm?
Sinən yanmamışsa, zavallı qarğa,
Sinəsi dağlıdan qaçma uzağa.
Zənci rəngi yağır sənin rəngindən,
Bəlkə də, soyğunçu hindu kimisən.
Bəlkə də, mən şaham, sən mənə çətir,
De, nədən qarasan? Açıq söylə bir.
Canana rast gəlsən, ərz elə ki, mən
Onun həsrətiylə düşmüşəm əldən.
Mənim dadıma çat, yetiş amandır,
Dadıma yetməsən halım yamandır.
Demişdin, əlindən tutaram bir dəm,
Qorxuram bu həsrət gözümdə öləm.
Bir göz kor olarsa, ey nazlı nigar,
Tutiya verməyin nə mənası var.
Canavar quzunu aparsa əgər,
Çobanın hay-küyü nə fayda verər.
Sel ki, bir binanı dibdən uçurar,
Poladdan olsa da neyləsin divar.

Bir əkin yerini vursa quraqlıq,
Yağışın mənası qalarmı artıq?
Məcnun dil oxunu atır uzağa,
Budaqdan-budağa uçurdu qarğa.
Məcnun danışdıqca coşub daşırdı,
Qarğa da uçmağa hazırlaşırdı.
O söhbət açdısa əfsanələrdən,
Qarğa dərdlə uçdu durduğu yerdən.
Gecə qarğa kimi geyindi qara,
Yarasa göz açdı qaranlıqlara.
Göydə çıraq kimi yandı ulduzlar,
Qarğa gözü kimi parladı par-par.
Məcnun çıraq kimi söndü, qaraldı,
Sanki gözlərini qarğa apardı.
Yanan bir şam-kimi o sinə dəftər
Göz yaşı tökürdü səhərə qədər.

## QARININ MƏCNUNU LEYLİNİN QAPISINA APARMASI

O göylər pərisi günəş yananda,
Səhər pərdəsindən baş qaldıranda
Hər baxış bəzənib durdu bağ kimi,
Hər göz də parladı, bir çıraq kimi.
Məcnun da qaçırdı qarğa kimi tək,
Bir şam axtarırdı pərvanələr tək.
Basıb köç yolunda tikanlıqları,
Qaçırdı cananın yurduna sarı...
Canan qoqusunu havadan duydu,
Bir anlıq əlini köksünə qoydu.
Elə bil, canlandı ölmüş bir bədən,
Dayanmış bir ürək çarpdı yenidən.
Uzaqdan bir qarı göründü bu dəm,
Yanınca gəlirdi bir talei kəm.
Zəncir vurulmuşdu o divanəyə,
O da şadlanırdı, xoşbəxtəm deyə...

Qarı çox sürətlə addım atırdı,
Boynu zəncirlini çəkib dartırdı.
Məcnun o əsiri gördüyü zaman
Qarıya and verib dedi: "Bir dayan,
Kimdir yanındakı bu zəncirli kəs?
Neçin zəncirlidir bu divanə şəxs?"
Qadın cavab verdi: "Düzünü desəm,
Divanə deyildir, bu talei kəm,
Mən dulam, bu da bir kasıb insandır,
Bunun da, mənim də günümüz qandır.
Ah, bizi salmışdır yoxsulluq əldən,
Bunu zəncirlərə bağladım ki, mən
Əsir sifətində gəzdirim barı,
Gəzib dolandırım bu obaları,
Gəzək şəhər-şəhər, həm ölkə-ölkə,
Bir ovuc yem tapam evimə, bəlkə.
Bundan əlimizə düşənləri biz
İkicə hissəyə bölək tər-təmiz.
Bir toz da qalmasın haman ruzidən,
Nə tapsaq, bölüşək biz onları tən".
Məcnun, qol-qanadı sınmışlar kimi,
Yıxıldı qarının ayağına ki:
"Aç onun boynundan o zənciri sən,
Gəl mənim boynuma bağla əlinlən.
O divanə deyil, divanə mənəm,
Çünki mən layiqəm zəncirə bu dəm.
Hayana istəsən, al apar məni,
Üzü qaralıqla gəzdir ölkəni.
Bu işdən əlinə nə düşsə hər gün,
Yalnız sənin olsun onlar büsbütün".
Qadın bu şikarı görüncə həmən,
Nə qədər şad oldu bu təsadüfdən.
Atıb yoldaşını, çox razı qaldı,
Zənciri Məcnunun boynuna saldı.
Qadın zəncirlədi yazıq Məcnunu,
Boynuna ip salıb apardı onu.
Gəzdirdi aşiqi o diyar-diyar,

Bir yerdə dayanıb tutmadı qərar.
El yazıq aşiqi görüncə darda,
Gülənlər də oldu, ağlayanlar da.
Qafillər Məcnuna baxıb gülürdü,
Aqillər gözündən yaş tökülürdü.
Ayağında buxov, boynunda zəncir
Məcnun tənələrə dözürdü bir-bir.
Bir çadır yanına yetişdi birdən,
Od, alov parladı nəğmələrindən.
O "Leyli" dedikcə, daşlar yeyirdi,
Daş altda rəqs edib canan deyirdi.
Qadın yedəyində çəkdi Məcnunu,
Leyli qapısına gətirdi onu.
Çəmənin nəsimi ona dəyəndə
Dayandı sərv tək yaşıl çəməndə.
Aşiq o çəməndə ağladı zar-zar,
Sanki ilk baharda yağdı buludlar.
O, yerə baş döyüb deyirdi: "Canan,
Özündən ayrıyam, dərdinlə həmcan.
Zəncirdən, quyudan qaçdığım üçün
Yanında təqsirkar olmuşam bu gün.
Indisə zəncirdə sızlayır bədən,
Verdiyin cəzaya şadam ürəkdən.
Yanında çox oldu mənim günahım,
Üzürsüz gəlmişəm, ey qibləgahım.
Bil ki, hakimimsən, məhkumam sənə,
Öz bildiyin kimi cəza ver mənə.
Qılınc vurmağıma baxma, ey sənəm,
Sənin hüzurunda yenə əsirəm.
Atımı sürdümsə siz tərəfə mən,
Min yara almışam mən öz zərbəmdən.
Ayağım etdisə dünən bir günah.
Bu gün baş qoymuşam ayağına, ah!
Sizə ox atdısa bu sınmış əlim,
İndi zəncirlidir o da, gözəlim.
O zaman bir günah etdimsə əgər,
Bəsdir bu çəkdiyim ağır cəzalər.

Qıyma ki, bu cürə zəlil olum mən,
Bir dəfə canımı çıxar bədəndən.
Səndən özgəsinə meyl etsə ürək,
Gəl, məni xaç kimi çarmıxlara çək.
Ey vəfasızlığı vəfadan parlaq,
Xətadır yanında xətasız olmaq.
Qarşında xətasız dayanıb bu dəm,
Özümü xətaya düçar edirəm.
Bəlkə vəfa görəm bu yolla səndən,
Ya da atdığın ox keçə sinəmdən.
Nə qədər ki sağam salamımı sən
Alıb bir başıma əl çəkməyirsən.
Razıyam, gəl öldür məni, ey mələk,
Öldür ki, başıma əlin dəyəcək.
Bir qılınc endir ki, başıma, canan
Mən olum qapında kəsilən qurban.
Mən İsmayıl kimi saxlaram ədəb,
İncisəm, qoy olum İsmayılməzhəb[92].
Şam kimi alışıb yanır bədənim,
Qorxmaram başımı qoparsan mənim.
Bir şamın başını qoparanda biz,
O, baş ağrısından xoş olar şəksiz.
Ayağın altında can verib ölsəm,
Sənsiz yaşamaqdan bu xoşdur, nə qəm.
Madam ki bağlıdır yanına yolum,
İşim ah olacaq, qurbanın olum!
Başım ayrılmayır qəmdən, qüssədən,
Səninsə başını ağrıtmayım mən.
Istəsən başından dərd uzaq olsun,
Dərd mənəm, qoy ölüm, başın sağ olsun".
Deyərək, ox kimi qalxdı yerindən,
Tutub parçaladı zənciri birdən.
Qəmlərdən şadlanan o bəxti qara
Dağ vəhşisi kimi qaçdı dağlara.
Nəcdə çatan kimi inləyib durdu,
Özünə ox kimi sillələr vurdu.
Ondan soraq alıb getdi qohumlar

Görünməmiş bir hal gördülər onlar.
Atası, anası ağlayıb qəlbən,
Artıq əl üzdülər o divanədən.
Heç kəsə yovuşmaz görüb Məcnunu,
Yalnız özbaşına qoydular onu.
Gördülər yamandır onun bu halı,
Leylini axtarır darğın xəyalı.
Yanında başqa bir söz danışsalar,
Özünü döyərək tutmazdı qərar...

**İBN-SƏLAMIN DASTANI**

Məna dənizinin qəvvası insan
Səpmiş bu şəkəri dodaqlarından:
Nofəlin qələbə çaldığı gündə
Şadlandı Leylinin qəlbi köksündə.
Qəlbə işıq saçan o gözəl nigar
Dedi: "Sevin, Leyli, qalib çıxdı yar..."
Bu zaman atası gəldi vüqarla,
Güldü bığ altından o, iftixarla,
Öz əmmaməsini kəc qoyub haman,
Dil açıb dəm vurdu dilbazlığından:
"Bu gün hiylə töküb tor quraraq mən
Qurtardım yaxamı o divanədən.
Verdim cavabını dönməz bir üzlə,
Onu suya verdim quruca sözlə.
Bu tanrı vergisi dilimə görə
O allah qarğamış Nofəl bilmərrə
Əl çəkdi fikrindən, o xam xəyaldan,
Öz tamah dişini çəkdi visaldan.
Allaha şükür ki, qurtardıq ondan,
Onun da payını versin yaradan".
Leyli eşitdikcə bu hekayəti
Gözündə çağladı can şikayəti...
Çadırda gizləndi o dərdli pəri,
Qan sıxıb, qan tökdü ağlar gözləri.

Gözlərindən axan o qanlı yaşlar
Keçdiyi yollarda qoymadı qubar.
Bilincə itmişdir yenə o baxtsız,
Əlini, qolunu dişləyirdi qız.
Saf qan axıdırdı gözündən mələk,
Bu sudan özünə zinət verərək.
Nərgislə suvardı qız ərğəvanı[93],
Hovuza batırdı o, xeyzəranı.
Onun nə hal duyan bir kəsi vardı,
Nə bir dost dərdinə çarə tapardı.
Qapını, bacanı bağlayıb möhkəm,
Dustaq ilan kimi yaşardı sənəm.
Yalnız, qapısından əsən küləklər
Ətrindən hər yana verirdi xəbər.
Adlı adamlar da evlənək deyə,
Elçi göndərirdi hər gün Leyliyə.
Hamısı dəm vurub öz dövlətindən,
Ər olmaq istərdi ona hər yetən.
O dürrün dalınca hey mahal-mahal
Düşmüşdü ortaya minlərlə dəllal.
Birinin o bala iştahı vardı,
Başqası o taxta əl uzadardı.
Atası qızını tutub ürəkdə,
Onu inci kimi saxlardı bərkdə.
Kamala yetişmiş o gümüşbədən
Şüşəni gözlərdi daşdan, küləkdən.
Yüz min ehtiyatla yeyirdi dildar,
Qəlbini gizlincə, şərabı aşkar.
Şam kimi gülərək, qızarsa da qız,
Bu gülüş altında yanardı yalnız
Gül kimi iki lay kəmərli müdam
Ayağında nizə, əllərində şam.
Bütün möhnətlərə o dözə-dözə,
Çəkdiyi ağrını vurmazdı üzə.
Ulduzlar içində bir ay durmuşdu,
Çadrına yüz Zöhrə halqa vurmuşdu.

## LEYLİNİN İBN-SƏLAMA VERİLMƏSİ

Bir xəbər tutunca tez Ibn-Səlam
Tələsdi vədəyə versin sərəncam.
Şahlıq cəlalilə, dəbdəbəsilə
Keçirmək istədi Leylini ələ.
Çoxlu xəzinəylə elçi gəldilər.
Xalvarla qənd gəldi, batmanla ənbər.
Nafə müşkü ilə mədən ləlləri
Bəzədi büsbütün qumlu çölləri.
Geyinsin, bəzənsin deyə o dilbər,
İpəklə yükləndi gələn dəvələr.
Atlardan "ərəbi", "bəxti", "təkavər"[94]
Gətirdi ağıla sığmayan qədər
İnsan döyüşdürən qızıllar ki, var,
Qum kimi dağıdıb səpirdi onlar.
Qızılı qum kimi səpdikcə yenə,
Sanki qum tökürdü düşmən gözünə.
Nəydi o səxavət, nəydi o rəftar!
O böyük calala heyran qaldılar.
İki gün dincəldi o yol yorğunu,
Elçini çağırıb öyrətdi onu.
Elçinin cadulu bir dili vardı,
Daşı xəcalətdən yumuşaldardı.
Sözü Isa kimi can təzələrdi,
Ölülər yenidən dilə gələrdi.
Alıb Rum elindən, Çindən, Məkkədən,
Peşkəşlər gətirdi nadir şeylərdən.
Elçi xəzinəylə düşdü yollara,
Hamsını çatdırdı xəzinədara.
Öz şirin dilinin açarı ilə
Gizlin xəzinəni o açdı belə:
- Aslan ürəklidir bizim qəhrəman,
Ərəbin fəxridir, şənidir, inan.
Nəsəb sahibidir, adlı-sanlıdır,
Böyükdür, nəcibdir o çox şanlıdır.

Siz qan istəsəniz, qum kimi tökər.
Davadan-dalaşdan azad olaraq,
Onunla səadət taparsan ancaq.
Elçi bu sözləri dediyi zaman
Qızcığın atası qalmışdı heyran.
Sonra, məsələnin əslinə yetdi,
Qəbul etdiyini etiraf etdi,
Bu işi qızına o rəva gördü
Ayı əъdəhanın ağzına verdi.
Sabah günəş doğub şölə salanda,
Cəmşidin camını ələ alanda
Bəylik xələtini rus oğlu aldı,
Ərəb damadının çiyninə saldı
Gəlinin atası çıxdı eşiyə,
Çadırı bəzədi, bayramdır deyə.
O, qonaq çağırdı Ibn-Səlamı,
Şadlıq məclisində əyləşdi hamı.
O, keyf məclisini sevinclə qurdu,
Ona layiq olan bir zinət vurdu.
Ərəb qaydasınca onlar bir yerdə
Öncə sınan əhdi bağladı bir də.
Göylərə sovurdu pul tufanını
Süd həqqinə girov dedi canını.
Qızın otağında onlar bu səhər
Tünglərə nə qədər şəkər tökdülər.
O kiçik ağızlı, qaragün sənəm
Ətir yandırırdı ud kimi o dəm.
Ətir dağıdırdı ah çəkən qəlbi,
Göz yaşı tökürdü gülablar kimi.
Ləli od verirdi, bulağı da su,[95]
O, ənlik qayırır, gülab yayır bu.
Yarı çatmışdısa bu gün murada,
Muradsız qalmışdı özü dünyada.
Ağıza çatarkən düşüb sındı cam,
Qoğalı bişmişkən dönüb oldu xam.
Qaydadır, ayağa batar hər tikan,

Od ağız yandırar ağıza qoysan.
Kim ki, müxalifət göstərə bir az,
Heç kimin əmrinə o qulaq asmaz.
Öz qəbiləsinə asi olan şəxs
Onunla bir yerdə yaşaya bilməz.
Barmağın birini çalarsa ilan,
Barmaq kəsilməsə zəhərlənər can.
Təbə can dərmanı olmuş məhəbbət,
Ölümə səbəbdir hər müxəlifət.
Ruhu şənləndirən Leyli ki, vardı,
Ixtilaf üzündən canlar alardı.
Şahlıq çırağından alışıb yanan,
Çıraqla gəzirdi onu hər zaman.

**LEYLİNİN İBN-SƏLAMIN EViNƏ KÖÇMƏSİ**

Günəş səhər-səhər yuxudan durdu,
Çadrını göy rəngli gülşəndə qurdu.
Gecə səyyarəsi alışıb yandı,
Nil rəngli Dəcləyə tərəf yollandı.
Sevincək yerindən sıçradı damad,
Kəcavə bəzədi ürəyi çox şad.
Elə ki, əyləşdi kəcavədə qız,
Onu çox hörmətlə aparıb yalnız,
Taxtını, tacını tapşırdı ona,
Dedi, hakim olsun bu gözəl sona.
Keçdi iki-üç gün, həya üzündən
O mumu səbr ilə yumşaltdı, bilsən.
Xurma ağacına bir gün əl atdı,
Xurmalı budağa o əl uzatdı.
Lakin, o, Leylidən bir zərbə aldı,
Ağrıdan sustalıb yerində qaldı.
Qızın silləsindən o birdən-birə,
Cansız ölü kimi sərildi yerə.
Qız dedi: "Bir daha belə iş görsən,
Təqsiri məndə yox, özündə gör sən.

Mənim surətimi qurub bəzəyən
Böyük sənətkara and içirəm mən,
Qanımı töksə də sənin inadın,
Hasil olmayacaq məndən muradın".
Bu and təsir etdi Ibn-Səlama,
O da razılaşdı quru salama.
Bildi ki, sevməyir onu bu nigar,
Qəlbinin bambaşqa bir çırağı var.
Lakin o məğrurluq üzündən yenə,
Yox deyə bilmirdi öz ürəyinə.
On dörd günlük o ay, o nazik bədən
Bunu da salmışdı eşqiylə əldən.
Dedi: "Mən ki, düşdüm onun eşqinə,
Uzaqdan da görsəm, bu bəsdir mənə.
Quru bir baxışla şadlansam da mən,
Bu xoşdur, ömürlük yad düşməyimdən.
Dedi ki: - Qarşında çoxdur günahım,
Keç bu təqsirimdən, ey qibləgahım.
Quru tamaşana razıyam, inan,
Namərdəm çəkilsəm bu iqrarımdan".
O da ömr elədi, dözdü bu dərdə,
Başqa təmənnası olmadı bir də.
Həsrət içindəydi o bağ bəzəyi,
Yollarda qalmışdı gözü, ürəyi.
Bəlkə, xoş xəbərlə əsən bir külək
Məcnundan ona bir toz gətirəcək.
Ağlaya-ağlaya döyüb köksünə,
Çadırdan çıxardı yollar üstünə.
Bülbüldən yaralı bir səsi vardı,
O, sərxoşlar kimi addım atardı.
"Aşiqim hardadır" söylədikcə qız,
Öz incik ruhuyla yaşardı yalnız.
Nə səbri qalmışdı, nə də qərarı,
Dərddən axıtdıqca o göz yaşları,
Onun gizli sirri düşdü dillərə,
Eşqi günəş kimi güldü ellərə,

Üzülməz qəmlərin sarsıntısından
Ər, ata qorxusu qalxmış ortadan.
Sövda ki, soxulur insan ruhuna,
Ər, ata qorxusu neyləyər ona?

### LEYLİNİN ƏRƏ GETMƏSİNDƏN MƏCNUNUN XƏBƏR TUTMASI

Bağdad ellərinin söz yaradanı
Belə nəql eyləyir bizim dastanı:
Boyun zəncirini qırmış o dəli,
Yenicə ay görmüş başı zədəli[96],
Bağrı kabab olmuş, sərxoş xəyallı,
O xaraba kəndli, viran mahallı
Gəzirdi çölləri gözlərində qəm,
Dərd idi, ah idi qəlbinə həmdəm.
Yarından bir qoqu gətirsəydi yel,
Gülərdi yaz kimi ürəyi tel-tel.
Cananın can verən xoş qoqusundan
Ənbərə çalardı rəngi hər zaman.
Ruhu əyləndirən o xoş ənbərdən
Zövq alıb təsəlli tapardı hərdən.
Müğilan dibində o bəxti qara
Zəlil tək düşmüşdü yaş torpaqlara.
Xəyalı çaşaraq düşmüşdü əldən,
O seçə bilmirdi tikanı güldən.
Bu vaxt dəvə üstə bir nəfər insan
Keçdi gürzə kimi onun yanından.
O bədbəxt əsiri görüncə yolçu,
Dəvəni saxladı, dedi: "Nədir bu?"
Bağırdı bu zaman o bir nər kimi,
Səsləndi ətrafa qafillər kimi:
"Sən, ey bu varlıqdan xəbərsiz olan,
Bütpərəstlər kimi yaşayan insan,
Yazıqsan, o bütdən daha üz döndər,

Bütlərdə tapmazsan vəfadan əsər.
Bu yolda bir işıq yanmayacaqdır,
Yox bil o yarı ki, gözdən uzaqdır.
Bu işdən işsizlik özü əfzəldir,
O yardan yarsızlıq daha gözəldir.
Ona öz könlünü tapşıranda sən
Bilməzdin olacaq o sənə düşmən.
Düşmən sevgilindir, çıxdı vəfasız,
Dostluq peymanını sındırdı o qız.
Səni xırman kimi o verdi yelə,
Səni yad, etməyir bir zərrə belə.
Onu bir cavana ərə verdilər,
İndi gəlin oldu sən sevən dilbər.
Bir də öz ərini o rədd etmədi,
Ondan baş götürüb uzaq getmədi.
O indi keyf çəkir nəşə bağında,
Hər gecə dəmlənir ər qucağında.
Öpüşmək olmuşdur peşəsi artıq,
Sən onun dərdini çəkirsən, yazıq.
O, gözdən uzaqdır, könüldən iraq,
Sənəyi daşa çırp, o qızı burax.
O səni salmayır illərcə yada,
Gəl onu bir dəfə unut dünyada.
Qadın bir deyildir, minlər ilə var,
Lakin öz əhdini tez pozur onlar.
Əhdi-vəfa sözü yazıldığı dəm
Qadınlar adına çəkildi qələm.
Qadın, doğrudan da, səni çox sevər
Səndən yaxşısını tapana qədər.
Başqa birisinə olunca həmdəm,
Səni görmək belə istəməz bir dəm.
Qadında kişidən çoxdur ehtiras,
Ölsə də dünyada muradsız qalmaz.
Qadın düz oynamaz heç bir oyunu,
Çətindir hiylədən ayırmaq onu.
Qadınlar dərdini çox çəkdi insan,

Vəfa görünmədi heç bir qadından.
Bir kişi qadına bağlansa, inan,
Vəfasız bir qadın yaxşıdır ondan.
Qadın əyləncədir, saxtadır, qardaş,
Zahiri sülh olur, batini savaş.
Aləmə bəladır düşmən olsa o,
Ölümdür qan üçün onun dostluğu.
Bir işi gör, desən, əlini vurmaz,
Onu görmə, desən, kənarda durmaz.
Sən dərdlənən zaman sevinib gülər,
Sən şadlanan zaman o dərddən ölər.
Qadınların işi belədir, aşkar,
Pis arvadın uzun macərası var".
Bəd heybət ərəbin lağ-lağ sözündən
Məcnunun sinəsi od tutdu həmən.
Yenə ahlar çəkdi o birdən-birə,
Düşdü üzü qoylu quş kimi yerə.
O qədər döydü ki, başını daşa,
Qızardı gül kimi daş başdan-başa.
Libas parçalanmış, can parçalanmış,
Yıxıldı daşlığa o bağrı yanmış.
O əfsun oxuyan şaşırdı birdən,
Peşiman olmuşdu dediklərindən.
Dağdan çox uzağa getməmiş, yolçu
Gördü ki, təzədən huşa gəldi bu.
Dönüb min üzr ilə gəldi iləri,
Dedi: "Nahaq dedim mən bu sözləri.
Bir sözdü, uydurub dedim yalandan,
Gəl məni əfv elə, yanılar insan.
Bir zarafatımla incitdim səni,
Canımı verərəm, əfv etsən məni.
Pərdə dalındadır o canan indi,
Qırıqdır sən kimi onun da qəlbi.
Onunla öz tayı, öz əri belə,
Bir gecə baş-başa yatmamış hələ.
O qıza başqası kəsmişsə nigah,
Səndən üzməmişdir öz əlini, ah.
Yoxdur səndən özgə muradı, kamı,

Bir sənsən dünyada onun adamı,
Dəqiqə başına o gözəl canan
Səni xatırlayır, yad edir, inan.
Bir ildən artıqdır gəlin gedəli,
Möhrünü saxlayır vəfalı əli.
Min il keçsə belə, yenə də sənsiz
O qızdan bar yemək çətindir, şəksiz".
Yalançı yalanı dedikcə gerçək,
O iki üzlünü Məcnun görərək,
Azaldı qüssəsi, dərdi bir qədər,
Dözdü ağrılara canı bir təhər.
Başına vurduğu zərbədən yazıq
Qanadsız quş kimi olmuşdu artıq.
Ləl axırdı onun yaşlı gözündən,
Vəfa axtarırdı hər beyti, bilsən
İşinin nə sehri, nə sonu vardı,
Nə yarı bu dərddən xəbər tutardı.

**LEYLİNİN XƏYALINA MƏCNUN ŞİKAYƏT ETMƏSİ**

Belə bəzənmişdi o, nazik bədən,
Bu bəzəklə çıxdı o, kəcavədən:
Hörmətcil kişinin evindəki yar,
Min nəqqaş gözünü kor qoyan nigar
Ərinə bağlanıb qalsa da üzdən,
Dost deyib ağlardı könüldən, gözdən.
Məcnun bu işlərdən tutunca xəbər,
Dağıtdı qəlbini yeni qüssələr.
Pak düşüncələri artdıqca onun,
Birə min olmuşdu dərdi Məcnunun.
Qanadsız quş kimi sürünürdü, bax,
Quruca nəfəsi qalmışdı ancaq.
Axtarırdı yazıq, həyat suyunu,
Daima dörd gözlə gəzirdi onu.
O, canan yurduna üz tutub gəldi,

Həsrətdən tük kimi canı incəldi.
Küləklə söylədi dərdini ona:
"Sən, ey öz əriylə keyf çəkən sona,
Hanı o əhd edib oturduğumuz,
Bir deyib, bir gülüb, bir durduğumuz?
Hanı vəd etdiyin o şirin visal?
Sinəmə baş qoyan səndin, ya xəyal?
Hanı bu dostluqda vəfa görməyin?
Nə oldu vəfaya umud verməyin?
Bütün peymanları tərk edərək sən
Günahsız üzünü gizlədin məndən.
Tutaq, könül yoxdur vəfaya səndə,
Bəs noldu dostluğa verdiyin vədə?
Mən sənin yolunda keçərkən candan,
Sən quru vədələr verirsən, canan.
Eşqiyin yolunda can qoymuşam mən,
Özgənin eşqinə söz vermisən sən.
Bu qədər əhdini basarmı insan?
Qaçarmı dostunu xatırlamaqdan?
Görünür çox şadsan sən təzə yardan,
Köhnəni yadına salmırsan bir an.
Özgənin boynuna sarılsan belə,
Bari axtar bizi quru dil ilə.
Sənin bağın üçün gəncliyim getdi,
Hayıf ki, bağbanlıq əməyim itdi.
Bağda əmək qoydu göyərçin, ey yar,
Meyvə yetişəndə yedi qarğalar.
Ah, o lətif xurman, o şirin xurman
Məndən özgəsinə tikandır, tikan.
Ahım dağlar yıxan bir sərt küləkdir,
Barını yadlara verməyəcəkdir.
Əvvəlcə yar dedin sən mənə, ey qız,
Sonra zəlil kimi buraxdın yalnız.
Mən sənə yar deyib, könül verirkən,
Bilməzdim vəfasız olduğunu mən.
And içib, əhd edib məni aldatdın,

Dedin, sevgilinəm, unudub atdın,
Anda bax, nə qədər düz imiş andın!
Əhdə bax, sən özün o əhdi dandın.
Qeyrə könül verib həmdəm oldun sən,
Neçin utanmadın mənim gözümdən.
Yaşayan bir sənlə mən deyilik tək,
Zülmü ədalətə bərabər edək.
Başqa ariflər də yaşayır, bilsən,
Onlar gözəl seçir yaxşını pisdən.
Bilirlər nə qədər dərdim, qəmim var,
Mən sənə neylədim, sən mənə, ey yar?
Tutaq ki, bağlanmış gözlərim bir an,
Səni ki, başqası görür kənardan.
Əhd üçün bir vəfa gəzsələr əgər,
Sənə bir vəfasız ad verəcəklər.
Əhdini sındıran yaxşı adlanmaz,
Sən əhdi qırmaqdan gəl saqın bir az.
Gülzarın əhdini gül qırdı, canan,
Tikanla doldurdu bağrını zaman.
Şərab xalq üzündə həya qoymadı,
Onunçun həyasız söyləndi adı.
Gecə qırmasaydı ayın camını,
Qaranlıq almazdı onun damını.
Sənə nə ürəklə umud bağlayım,
Nə üzlə arxanca gülüb ağlayım?
Mən ömrü əhdimlə vermişəm başa,
Sənsə vurub çarpdın əhdini daşa.
Sən açmasan belə, könlümü birdən,
Mən səni unudan, atan deyiləm.
Əzabın başımdan aşsa da, gülüm,
Incisəm, gözümü qapasın ölüm.
Qəlbimə o qədər qəm verdin ki, sən,
Şüur da, həya da çıxır bədəndən.
Sənə dost deməyə məndə nə üz var,
Nə dilim vəfasız sözünə qıyar.
Acizəm o sənin xam sifətindən,

Bir də nə ad verim o surətə mən.
Verdiyin hər zülmə dözsə də bədən.
Canımın, ruhumun qidası sənsən.
Bu zülmün ömrümü alsa da dərhal,
Üzr istər səndəki o gözəl camal.
O camal qırsa da eli, obanı,
Halaldır o hüsnə hamının qanı.
Sən günəş üzlüsən, mənsə bir çıraq,
Qarşında sönməyim şərəf olacaq.
Ay şəkər olsa da, sən elə mahsan,
Vəzirin ikidir, bir özün şahsan.
Ipəkdə bir gülsən, xəzdə laləsən,
Üzüm şirəsindən çox ləzzətlisən.
Hüsnünə odun da rəqabəti var,
Baxdıqca onun da ağzı sulanar.
Gül, çiçək məsgəni olsa da hər bağ,
Camalın olmuşdur gülşənə çıraq.
Şahlığın geyimi atlassa əgər,
Yanağın yanında samana bənzər.
Qaşların incədir, oxşar xəyala,
Bayram axşamında bənzər hilala.
O qızıl gülüyün yanında, ey yar,
Ud, səndəl ağacı söyüdə oxşar.
Üzüyün müşk rəngli gözəl sultanı
Tutmuş Çin eliylə Həbəşistanı.
Nə olar, özün də o cəmala bax,
Nə qədər çətindir ondan ayrılmaq.
Canımı başına qurban demişəm,
Başqa bir tədbirim yoxdur, ey sənəm.
Cəfanı, zülmünü bunca çəkərək,
Vəfa umuduyla yaşayır ürək.
Səbr etməliyəm ki, bir görüm sonra
Ömür cilovunu çəkəcək hara..."

## ATASININ MƏCNUNUN GÖRÜŞÜNƏ GETMƏSİ

Fars nəslindən olan şirin dil dehqan
Belə xəbər verir ərəb halından:
Oğlunu itirmiş o yəqub qoca
Gözəl Yusifindən ayrı qalınca,
Məcnunun halını gördü pərişan,
Kəsdi umudunu ondan bir zaman.
Ah çəkib gözüylə odlar görürdü,
Yenə də umudla ömür sürürdü.
Onun gəzmədiyi çarə qalmadı,
Zənci yuyunmaqla çinli olmadı.[98]
Nə qədər dağıtdı yenə simü zər,
Bəxti yetirmədi ona bir nəzər.
Kəsdi umudunu dərdli oğlundan,
Bir də gözləmədi sağalmaq ondan.
Bir küncə qısılıb qaldı o baxtsız,
Bircə dörd künclünü gözlədi yalnız.
Qocalıq, zəiflik, bir də bədbaxtlıq,
Ona köç yolunu göstərdi artıq.
Dünyanın dərdindən o gəldi təngə,
Sıxılmış boğazı bənzədi çəngə.
Qorxdu ki, öldürsün bu əcəl onu,
Gəlib yadlar alsın onun yurdunu.
Xəstə tək əlinə bir əsa aldı,
Iki nəfər cavan yanına saldı.
Allah işıqladar, deyib, yolunu,
Yenə də gəzməyə çıxdı oğlunu.
Dağ ilə səhranı gəzib bir zaman,
Çölləri, qumları saldı ayaqdan.
Umudla əl açıb xeyli gəzdilər,
Heç yerdə tapmadı oğlundan əsər.
Nəhayət bir nəfər xəbər verdi ki,
Əzab evindədir sizin o itgi.
O bir yerdədir ki, xərabəzardır,

Baxdıqca qorxuncdur, sanki məzardır.
Qara bulud kimi o çirkin diyar
Neft kimi alışıb, tutuşub yanar.
Yenə yola düşdü zavallı qoca,
Bütün günü gəzdi yollar boyunca.
O bəxtsiz oğlunu görəndə birdən,
Oynadı qocanın qəlbi yerindən.
Məcnunda yox idi həyatdan əsər,
Varlığı dəriydi, bir də sümüklər.
Varlıq dünyasından düşmüşdü qaçaq,
Sövda yolundan da gəzirdi uzaq.
Xəyaldan asılmış çöpə bənzərdi,
Ölümdən qurtarmış bir tük qədərdi.
Yer üstdə it kimi çabalasa da,
Yer altdakindən də heçdi dünyada.
Qaynaqdan düşmüşdü həyat qazanı,
Ayaqdan düşmüşdü, huşsuzdu canı.
Yarılmış başından düşmüşdü papaq,
Yerdə ilan kimi hey qıvrılaraq,
Əl boyda dərini o tərki-vətən
Fitə tək tutmuşdu öz göbəyindən.
Ata sığalladı onun başını,
Saxlaya bilmədi öz göz yaşını.
Axıtdı sel kimi ciyər qanını,
Uçurdu könlünün xanımanını...
Açıldı Məcnunun bu dəm gözləri,
Qəlbə munis gördü o bir nəfəri.
Baxdı atasına o bəxti qara,
Lakin tanımayıb qaçdı kənara.
Bir adam özünü unutsa əgər,
Başqa bir insanı tanıyar məgər?
Dedi: "Sən nəçisən, de görüm kimsən?
Gəldiyin yollara qurban olum mən".
"Mən sənin atanam, ey ciyər param,
Nə vaxtdır, bir səni mən axtarıram".
Məcnun atasını tanıdı bu an.
Düşüb ayağına ağladı al qan.

Ata qucaqladı yazıq oğlunu,
O bunu öpürdü, bu isə onu.
Ah, tuta bilməyib bir yerdə qərar,
Min novhə çəkərək çox ağlaşdılar.
Atanın göz yaşı çay kimi axdı,
Sonra boy uzunu oğluna baxdı.
Gördü, ölü kimi o çıl-çılpaqdır.
Başı papaqsızdır, yalın ayaqdır.
Bir xələt götürüb öz heybəsindən,
Geydirdi oğluna, örtüldü bədən.
Başmaq da, papaq da verdi, müxtəsər,
Bəzədi təpədən dırnağa qədər.
Sonra da atalıq nəsihətiylə,
Ona öyüd verdi öz adətiylə.
Dedi ki: "Ey ruhum, bu yuxudan qalx,
Cüt atlı zəmanə tələsir, bir bax.
Bu yolun hər otu qılıncdır, oğlum,
Gəl, çəkin bu yoldan, qurbanın olum.
Yediyin zərbələr çox asan deyil,
Tutaq ki, sən dözdün bir ay, ya bir il.
Yenə ox atacaq rəhmsiz fələk,
O, sənin qanını açıq tökəcək.
Tutaq bir neçə gün yenə dözdün sən,
Lakin bu yerlərdə can verib ölsən,
Canavardan tutmuş pələngə qədər
Sənin bədəninlə doyar vəhşilər.
Qürbətdə ölmə gəl, nə varmış bunda?
It olmaq yaxşıdır ana yurdunda.
Baş götürüb qaçdın vəhşi çöllərə,
Qocaldın, çatmadı əlin bir yerə.
Əzablar çəkməyin mənası varmı?
Daima zillətə dözmək olarmı?
O sular yatağı çaylağa bir bax,
Seldən xarab olmuş gördüyün çaylaq.
O sellər axıdan dağa qıl nəzər,
Onu da zəlzələ dağıdıb tökər.
Bu zillət, bu əzab pəncəsində sən

Dəmirdən də olsan çürüyəcəksən.
Getdi ömrüm-günüm sənin dərdinlə,
Ram olub bir zaman atanı dinlə.
Baş getdi, cilovun bərkdir, ey insan,
Alışdı ürəyim, sən yenə xamsan.
Çöldə ləhləməkdən bir dəfə əl çək,
Vəhşilər yanında kim at sürəcək?
Divlər yatağına gəl olma məhrəm,
Qaçma zəmanədən, ey talei kəm.
Başından bir dağıt bu qayğıları,
Özünü xəyalla gəl aldat, barı.
Bir arzuyla yaşa, o, puç olsa da,
Arzuyla şadlanar aqil dünyada.
Yalan da, doğru da olsa hər dilək,
Bari, bir nəfəsə bəzəkdir, bəzək.
Əvvəl sən rahatca nəfəs al ki, bir,
Sonrakı nəfəsin gör necə gəlir.
Səadət qapını açmasa bu gün,
Kəsmə umudunu ondan büsbütün.
Çoxları buğdanı saxlanc etdilər,
Qazanc görmədilər bir arpa qədər.
Ömrün ixtiyarı öz əlindəykən,
Işini gör, qurtar hamıdan erkən.
Sabah cilovunu tutanda əcəl
Bir də üzr istəmə bu dünyadan gəl.
Dediyin şərbəti verməzlər sana,
Bil ki, yaratdığın düşər payına.
Qadın nə toxusa əyninə keçər,
Kişi əkdiyini toplayıb biçər.
Bu gün bir üzərlik yandır ki, sən də
Duyasan iyini bəlkə öləndə.
Ölüm dəhşətini qabaqca sına,
Axırda dözəsən hər ağrısına.
Ölümü kim duysa ölümdən qabaq,
Ölüm pəncəsindən xilas olacaq.
Baş vaxtından əvvəl ucalsa əgər,
Özü təpəsinə sillə endirər.

Səfər xəyalilə gülən bir dodaq
Öz bişirdiyindən pay aparacaq.
Adamsız qalmışdır meydanın, bir dur,
Yetər divanəlik gəl sakit otur.
Hər kəsin bir könül həmdəmi olar,
Hər çəkilən dərdin bir sonu da var.
Söz yox ki, ucadır insanlıq səndə,
Lakin it də yaşar, ölər vətəndə.
Əgər insansansa, insanlığı sev.
Bir div olsan belə, anla ki, hər dev
Bir insan şəklində görünmək istər,
Divdənsə dərs alıb adamlıq göstər.
Ah, oğul, insansan, şərəflisən sən,
Özünü divlərə taymı edirsən?
Azdır yoldaşlığım bu yolda sənə.
Canım yedəyindən gen qaçma yenə.
Gəl mənə yoldaş ol, həmcinsin mənəm,
Bari, təsəlli ver qəlbimə bir dəm.
Bu gecə sən məndən üz döndərsən, ah!
Bil ki, gec olacaq axtarsan sabah.
Sözlərim gəlirsə qəlbinə ağır,
Bu da, bil, fələyin qəzasındandır.
Qaçma, yaxına gəl, iş gör əlinlə,
Zamanın hökmünü bir yaxşı dinlə.
Mən ömrü bitirdim, sən şad ol yazıq,
Şərabı sən iç ki, mən məstəm artıq.
Ölürəm, ömrümü çatdırdım başa,
Qəm öldürdü məni, sənsə şad yaşa.
Inan ki, göylərə sovruldu külüm,
Günəşim saralır, yaxındır ölüm.
Günəş axşam oldu, hardasan səhər
Oğlum, mən ölürəm, bir kömək göstər.
Oğul, gəl, atayın pis gününə çat,
Gəl, canı çıxmamış ona əl uzat.
Mən əldən, ayaqdan düşməzdən əvvəl
Sönmüş ocağımı qızdırmağa gəl.
Yerimdən qoparsa məni ruzigar,

Gəl mənim yerimdə özün tut qərar.
Qoy ölüm əmrilə canımı alsın,
Bari, bir oğulsa yurdumda qalsın.
Ölüm səfərinə çıxsa bədənim,
Bilim ki, yerimdə adam var mənim.
Ölüm yasdığımda baxmasan mənə,
Nə dosta xoş gələr, nə də düşmənə.
Kənardan-kənara çıxar bir nəfər,
Mənim yığdığımı qapıb qəsb edər.
Rəvamı dünyada mən talei kəm,
Oğlum ola-ola kimsəsiz öləm?
Artıq çalınmışdır köç təblim, inan,
Indi köç yoluna hazırlaşır can.
Qorxuram, köçməyə tələsiyəm mən,
Köçümü tərpədəm sən gəlməmişkən.
Məzarım üstünə sən baş qoyasan,
O vaxt ağlayasan, bərk ağlayasan.
Tüstüyə dönsə də o gün nəfəsin,
Mənə nə faydası o ağlar səsin?
Qəmindən dünyalar yansa da, düzü,
Bir də gülməyəcək bəxtimin üzü".

**MƏCNUNUN ATASINA CAVABI**

Oğul atasına çox qulaq asdı,
Onun hər sözünü qəlbinə yazdı.
Istədi iki gün səbr edib dözsün.
Bu sövda yolundan o ayaq üzsün.
Eşqə tövbə demək istədi, fəqət.
Tövbə qulağını çəkdi məhəbbət.
Məhəbbət fili də qoyar piyada,
Ona diz çökənlər mərddir dünyada.
Bu, keçə şiridir, o, meşə şiri,
Bu, həmişə tikər, yırtar o biri.
Eşqin kamanından ox atsa bəşər,
Onun öz əlini o, şil-küt eylər.

Məcnun toplayaraq öz qüvvətini,
Dinləyib atanın nəsihətini,
Dedi: "Ey nəfəsi ruhuma qüvvət,
Sənsən müşgülümü düzəldən, əlbət.
Sözün, nəsihətin dimağımdadır,
Bax, qulluq halqan da qulağımdadır.
Gözəl nəsihətin qəlbə çıraqdır,
Kim boyun qaçırsa, bəxtdən uzaqdır.
Mən qulaq asardım bu sözlərinə,
Neyləyim, əlimdən gəlməyir yenə.
Mənə ağıl dərsi oxumaqla sən
Nə üçün eşqimin üstə gülürsən.
Məhəbbət oylağı könlümçün, inan,
Bir qara pula da dəyməz bu cahan!
Tale puç eyləmiş məni dünyada,
Eşidib bildiyim düşməyir yada.
Bütün hafizəmi sovurub yellər,
Yoxdur xatirimdə nə səs, nə xəbər.
Bu gün soruşma ki, nə yedim dünən.
Bu sual da çıxar puç hafizəmdən,
Bu saat gördüyüm işi də sorma,
Cavabsız qalarsan, özünü yorma.
Bilirəm, oğlunam, sən də atamsan,
Adın da qalmamış yadımda, inan.
Bir atam çıxmamış yadımdan bu gün,
Huşumun özü də itmiş büsbütün.
Öz adım da çıxmış yadımdan bu dəm,
Bilmirəm məşuqəm, yoxsa aşiqəm.
Bir ildırım kimi qəlbim odlandı,
Qəlbimin odundan, canım da yandı.
Ayrıldım dünyanın nemətlərindən,
Çöllərin otuyla keçinirəm mən.
Zəmanə adlanan bu boş dəyirman
Boşalmış deyirəm, dən ilə sudan.
Mən öz vəhşətimdən itgin düşmüşəm.
Vəhşilər insana olarmı həmdəm?
Vəhşiylə dost olsa insan dünyada,

Vəhşi adətincə ömr edər o da.
Mən milçək toxunmuş qovun kimiyəm,
Kəs məni, at gedim, saxlama bir dəm.
Yoxsa bir toz qopsa üstümdən əgər,
O tozum bostanı xəstələndirər,
Çiçəyi kənarda tutun uşaqdan,
Yoxsa zəhərlənər uşaqdakı qan.
Yalnız xərabəyə meylim var mənim,
Qoy xərabə olsun yerim, məskənim.
Zənn et ki, zəmində bitmədi bir kol,
Atdığın bir toxum puç oldu bir yol.
Bildiyin bir sözü oxumamış bil,
Zənn et ki, əkdiyin heç oğul deyil.
Gəl bir məzar düzəlt, sözümü dinlə,
Ölmüş bir aşiqi dəfn et əlinlə,
Ağlının üstünə qələm çəkilən
Divanə bir gəncdən əlini üz sən.
Deyirsən yaxındır sənin köç yolun,
Köçünü bağlamış bu bədbəxt oğlun.
Xəzanım çatacaq sən ölənədək,
Bil ki, səndən qabaq köçüm gedəcək.
Sən ölsən üstündə dirilər ağlar,
Mən çoxdan ölmüşəm, əlimdə nə var?"

## ATASININ MƏCNUNLA VİDALAŞMASI

Atası görüncə dərdli oğlunu,
Eşqin girdabında boğulduğunu,
Kəsdi umudunu ondan büsbütün;
O qızdırma sapı düşmüşdü düyün...
Dedi: "Ey ciyərim, ciyər neştərim,
Ey boyun zəncirim, ey taci-sərim,
Əlacsız dərdini duydum ürəkdən,
Səndən də əl üzdüm, özümdən də mən.
Atan əldən düşdü, insafa gəl sən,
Gəl tut məhəbbətlə onun əlindən,

Qalx, sarıl boynumdan, qurbanın olum,
Üzüm göz yaşınla islansın, oğlum.
Səfər qüslüm olsun o göz yaşları,
Səfər beşiyində dinc yatım, barı.
Ayrılıq dəmidir, halıma yan bir,
Gözümə sürmə yox, mil çəkilmişdir.
Naz vaxtı deyildir, qucaqlaşaq gəl,
Səndən tuşə alım səfərdən əvvəl[100]
Köçümü yığmışam dünyadan bu dəm,
Başqa bir aləmə köçüb düşmüşəm.
Sənin fikrindən də deyiləm uzaq,
Ölürəm, dərdinlə ölürəm, ancaq
Çox əziz olsan da gözüm kimi sən,
Atanı bir daha görməyəcəksən.
Əlvida, səfərə hazıram artıq,
Gedər-gəlməzədir bu son ayrılıq.
Əlvida, ayrılıq zamanı yetdi,
Biz gecikib qaldıq, karvansa getdi".
Qurtardı atanın vida sözləri,
Oğluyla görüşüb qayıtdı geri.
Pərişan atanın üzündə kədər,
Ölümcül, evinə gəldi bir təhər.
Zəiflik üzündən o iki-üç gün
Qüssəylə keçindi vücudu ölgün.
Birdən baş qaldırdı pusqudan əcəl,
O öldü murada çatmazdan əvvəl.
Onun səma quşu çıxdı qəfəsdən,
Sidqin budağında o tutdu məskən
Göylərdən törəyən göylərə yetdi,
Torpaqdan olan da torpağa getdi.
Asudə odur ki, ay tək hər zaman
Bu yandan çıxaraq, batsın o yandan.
Bağlanıb qalmasın qüssə evinə,
Şimşək tək parlayıb o sönsün yenə.
Beş günlük dünyanın mənzilində sən
Çox rahatlanma ki, zillət çəkəsən.
Qoy bilsin bu kənddə mənzil tikənlər

Yoxdur bu aləmdə dinclikdən əsər.
Ölməz can qurtaran bu daş hasardan
Onunçun ölmüşdür bu dünya, inan.
Mələk surətində bir divdir aləm.
Səni məhv etməyə çalışır hər dəm
Dolmuşdur dünyanın kasası qandan,
O qan da süzülür öz bağrımızdan.
Dünyada həmdəmin olsa da hər kəs,
Ömründə şad olub sifəti gülməz,
Bu divlər yatağı yer deyil, inan,
Sel yolu tutmuşdur, qalx bu yataqdan.
Dünyanın ağzı bir xurmaya oxşar,
Əfsus, öpüşündə acı tikan var.
Sərvini bitirmə bu çəməndə sən
Suyu duz, otu da qılıncdır, bilsən.
Bəsdir bu dünyadan yediyimiz qəm,
Çoxmu qamçısını vuracaq aləm?
Aləmi şad keçir, bil, aləm budur,
Çəkmə dünya qəmi, əsil qəm budur.
Əliuzun olsa bir oğru əgər,
Girib xəzinədən gövhərlər çəkər.
Xəzinəni atıb, kim yesə torpaq,
O, ağıllı deyil, ilandır, ancaq[101].
Yaşa ki, dünyaya işıq verəsən,
Torpağa göz tikmə ilan kimi sən.
Ömürdən bərk yapış, ömürdür məqsəd,
Ömürsüz dünya da boş qalır, əlbət.
Yaxşı-yaman gündə gümüş çox yarar,
Min gəmi ləngəri onunla sınar.
Əlində saxlama, quyu tək, varı,
Dəyirman daşı tək üyüd onları.
Aldığın hər şeyi payla dünyada,
Belə abad olub bizim dünya da
Hərdən bir əl iyi qayırsan da sən,
Ox da yon hazırla, dünyada bəzən.
Yüksüz bir adamdan alınarmı bac?
Xaraba bir yerdən alınmaz xərac.

Boş-bikar oturma heç yerdə bir an,
Bari əl-qolunu oynat yalandan.
Heç yerdə qəflətlə gəl tutma qərar,
Hərdən bir bağırıb hay-küy də qopar.
Əli boş insanlar qəm çəkər, bişək,
Beldən şikəst olsun gücsüz bir eşşək.
Səninlə cıdıra çıxanlara bax,
Yarı yolda qalan bir sənsən ancaq.
O Kəyan şahları, o peyğəmbərlər
Dünyanı qullara qoyub getdilər.
Gör bu qövm kimdir, kim idi onlar,
Gör kimin yerində kim tutdu qərar.
Yaxşılıq etməsən əgər insana,
Böyüklük şərəfi verilməz sana.
Yaxşılıq eyləyib, qorx yamanlıqdan,
Yaxşılıq gətirər yaxşılıq hər an.
Sənə pislik edən özündən küssün,
Çünki öz canına qıymış o düşgün.
Quyuya salsan da yaxşılığı, bil,
Yenə qayıdacaq, o itən deyil.
Hər yaxşı-yamana qoca dünyada
Gələr fələklərdən bir əksi-səda.
Kim dağa sirrini söyləsə əgər,
Dağ eşitdiyini geriyə verər.
Qalxıb ucalsan da sonsuz göylərə,
Ağlı başında ol, düşün bir kərə.
Heç kəs bu fələkdən baş çıxarmamış,
Heç kəs bu kitabı sona varmamış.
Araba, mancanaq daşını heç kəs
Fələk divarına söykəyə bilməz,
Çünki o torpaqdan, yerdən uzaqdır,
Yerin tənəsindən pak duracaqdır.
Dünya karxanadır, xor baxma barı,
Bu dibsiz quyuya düşdü çoxları.
Dərindir, çuxurdur dediyim quyu,
Sən oyuncaq yeri zənn etmə bunu.
Bil ki, bu quyudan çəkilməsən sən,

İpin buraxılsa daima əldən,
Bu sallaxanadan qurtulmaq olmaz,
Bari bu hikməti dərk elə bir az.
Harda bir abadlıq görsən bərqərar,
Ilki də, sonu da xaraba olar.
Daim xaraba da olsa bir diyar,
Bil ki, abadlıqdan onda nişan var.
İstər xarab olsun, istərsə abad,
Daimi binövrə qoymamış ustad.

## ATASININ ÖLÜMÜNDƏN MƏCNUNUN XƏBƏR TUTMASI

Bir gün, təsadüfən, doğanda səhər
Şikara gedirdi çölə bir nəfər.
Məcnun Nəcd dağına çıxıb durmuşdu,
Tacda inci kimi tək oturmuşdu.
Yolçu yol üstündə şirə göz atdı,
Qılınc tək dilini ona uzatdı.
Yasa batmış kimi soruşdu ondan:
"Ey evdən, eşikdən didərgin insan,
Leylidir gəzdiyin dünyada ancaq,
Bir öz ətrafından almırsan soraq.
Yadından çıxmışdır atayla ana.
Həyasız adamsan, eyb olsun sana.
Sənin tək bir oğul girsin yerlərə.
Naxələf olmaqdan əl çək bir kərə.
Tutaq ki, ömrünün cavan vaxtı sən
Qaçdın öz atandan, o kimsəsizdən
Indi ki, ölmüşdür o yazıq atan.
Nolar xatırlasan, onu bir zaman.
Olmazmı, gedəsən ziyarətinə,
O ata haqqının son möhnətinə?
Sığınıb qəbrinin pənahına sən,
O incik ruhundan üzr istəyəsən?"
Məcnun, xəbərçinin bu sözlərindən

Sızlayıb çəng kimi büküldü birdən,
Dərdlənib, yerlərə çırpdı özünü,
Dönüb silləlәdi o, üz-gözünü.
Kəsildi büsbütün səbri, qərarı,
Qaçdı atasının qəbrinə sarı.
Qəbrin şüşəsinə bir nəzər atdı,
Elə bil bağrına almazlar batdı.
Huşsuz, o türbəyə yıxıldı birdən,
Basdı öz bağrına onu dörd yerdən.
Onun pak ruhuna ağladı zar-zar,
Axan göz yaşıyla islandı məzar.
Gah qəbri qucayıb huşsuz durardı,
Gah dərddən başına qum sovurardı.
Gündüzki dustağın çatdı gecəsi,
Çoxaldı xəstənin can isitməsi.
Bütün ömrü boyu o naxoş bədən
Qəmlər əsiriydi ilk nəfəsindən.
Qorxunun əsiri olsa bir nəfər,
Halı yetimlikdə nə ola bilər.
Ah! O yetim ürək, o dərdli dustaq
Köməksiz, arxasız, yetim qalaraq,
Qıvrılıb torpağa düşdü bir zaman,
Öz müsahibindən axtardı nişan.
Lakin, tapmayınca öz qəmxarını,
Kəsmədi ömrünün qəm ruzgarını.
Ağladı, gözündən qan axıdaraq,
Tamam qızıl qana bulandı torpaq.
Dedi: "Yazıq atam, de hardasan sən?
Oğluna tacını göstərməyirsən.
Ey mənim qəmimə, yasıma həmdəm,
Bu dərdi mən kimə şərh edim bu dəm.
Üzünü torpaqda sən gizlədərək,
Oğulsuz qalmağı istədin, demək.
Mən ki, atasızlıq bilməzdim bir dəm,
Sınadım, nə qədər acıymış bu qəm.
Of!. Könlüm naləsiz, sakit durarmı?
Bir də səndən özgə köməyim varmı?

Yarım da sən idin, yavərim də sən,
Könlüm güc alardı daima səndən.
Oğluna daima yollar açaraq,
Bir səndin dərdimə yananım ancaq.
Sənsiz ki, zillətdə yaşayacağam,
Əfsus, səndən sonra yenə də sağam!
Uzaq düşməyimi başıma qaxma,
Çoxdur xəcalətim, olmuşa baxma.
Hər nəsihətini eylədikcə yad,
Ruhumdan ucalır ah ilə fəryad.
Mənim xoş yerişli atlım şən ikən,
Dönmüşdüm başı bərk ayğırına mən.
Qızıl bir sırğaydın qulağımda sən,
Qapı halqası tək uzaqdım səndən.
Sən mülayim idin, mən dəliqanlı,
Mən soyuqqanlıydım, sən isti qanlı.
Sözlə oxşamadım qəlbini bir an,
Yanında bir gecə yatmadım, aman!
Sən mənim ucumdan dözdün yüz dərdə,
Mənsə xəyal kimi gəzdim çöllərdə.
Mənim yatağımı çırpardın hərdən,
Mənsə ayrılmazdım yenə çöllərdən.
Sən şadlıq büsatı qurardın mana,
Mənsə yıxılardım daşlar qoynuna.
Sən dua elədin, təsir etmədi,
Mən də ağac əkdim, meyvə bitmədi.
Can dostum sənsənmiş, andıqca, inan,
Bil ki, dərd əlindən bağrım olur qan.
Axır libasıma göz qaram hər dəm,[102]
Bu yolla kor olub, qara geyirəm.
Ah, ata, peşmanam tutduqlarımdan,
Bir dərdim min oldu, beləymiş dövran.
Yersiz incitmişəm, atacan, səni
Əhvalım çox pisdir, bağışla məni.
Səni incitmişəm bu dünyada, ah!
Bizdən sorulmasın bu ağır günah.
Sən, ey ulduzumu işıqlandıran,

Sənin əlindədir əlacım inan!
Sən razı qalmasan oğlundan əgər,
Allah da oğluna cəzalar verər.
"Ciyərim" deyərdin mənə bir zaman,
Indi o ciyərə sən ox vurursan.
Doğrudan ciyərin yarandımsa mən,
Gəl kabab bişirmə öz ciyərindən.
Bir də ciyərindən axırsa bu qan,
Sən niyə torpağın qucağındasan.
Ciyərim qanını axıdaraq sən
Yenə də: "Ciyərim sənsən" deyirsən.
Səni yandırdımsa, ey taci-sərim,
Alışıb od tutdu öz ciyərlərim.
Əgər sənə qarşı günahkar oldum
Özüm öz cəzama giriftar oldum.
Qulaq asmadımsa sözlərinə mən,
Qulağım buruldu sənin zərbəndən".
Məcnun ah çəkərdi aşdıqca dərdi,
Gününü gecə tək qara edərdi.
Gecə sallayardı qara bir bayraq,
Ağlamaq təbili susmazdı ancaq.
Sədəf tək arxası qaralmış gecə
Ayla və balıqla pəncələşincə,
Balıq sədəfindən qızışdı haman,
Bütün dürrləri tökdü ağzından.
Məcnun sədəf rəngli iki gözündən.
Ətrafa incilər səpirdi, bilsən.
O qəbrin üstündə səhərə qədər,
Oxudu qəlbyaxan, acı novhələr.
Türbəylə birləşdi o da türbə tək,
Bu iki mənzildə vurdu bir ürək.
Qəbrə üz sürtürdü o yanıqciyər,
Bu zaman gün çıxdı, açıldı səhər.
Səhərin carçısı səslənən zaman
Şəfəq bayrağını qaldırdı dağdan.
Kimyagər - səhərin böyük iksiri,
Qızıla döndərdi nəfəslə yeri.

Torpaqda sürünən o yazıq insan
Qalxıb Nəcdə getdi yenə pərişan.
Yenə ağlayırdı gözlərində qəm,
Onun varlığını sarmışdı matəm.
Əzabla qatlanıb tale deyənə,
Yüz min çətinliklə yaşardı yenə.
Bir könül şamını gəzirdi təkcə...
Gecəsi gündüzdü, gündüzü gecə.

## MƏCNUN VƏHŞİLƏR ARASINDA

Əfsanə yaradan bir sahib hünər
Bu qəmli dastanı belə nəql edər:
O yatağı səhra, o balıncı dağ,
Bu saxsı evdəki o solğun zanbaq
Ata matəmini çatdırıb başa,
Yenə də üz tutub, qaçdı dağ-daşa.
O, vəhşi çölləri bir gün tərk etdi,
Yarının yurduna üz tutub getdi.
Gördü ki, vəfanın çəkdiyi qələm
Leylini Məcnunla yazmışdır bahəm.
Eşdi dırnağıyla yerin layını,
Özünü saxlayıb pozdu tayın.
Görənlər dedi ki: "Bu necə işdir?
O iki rəqəmdən biri getmişdir".
Dedi ki: "Birini pozsa da qədər,
Bir ad ikimizə kifayət edər.
Aşiqi axtarıb gəzsə bir insan,
Onun yarını da qoy tapsın ondan".
Bu vaxt soruşdular, dedilər: "Nədən
O itmiş ortadan, itməmisən sən?"
Dedi: "Yaxşı düşməz mənimçin artıq,
Mən özüm məğz olam, o isə qabıq.
Mən dostun örtüsü olsam da ancaq,
Xoşdur o məğz üstdə bir qabıq olmaq".
Deyib, o yerlərdə tutmadı qərar,

Gah yolla gedirdi, gah yoldan kənar.
O, aşiqlər kimi dilində qəzəl
Gəzirdi bir təbib, bir mehriban əl.
Insan adətindən əl götürərək,
Ipini qırmışdı o, vəhşilər tək.
Çöl vəhşisi kimi o, zaman-zaman
Yeyib yaşayırdı yaşıl otlardan.
O, tordan, vəhşidən qorxmurdu bir dəm,
Vəhşilər olmuşdu Məcnuna həmdəm:
Ona yetişməsin deyə bir zaval,
Keşikdə durardı şir ilə maral.
Çöldə nə qədər ki, vəhşilər vardı,
Onun qulluğunda hazır durardı.
Aslanı, maralı, tülkünü, qurdu
Yığıb yol üstündə ordugah qurdu.
Hamsı qulluğunda durmuşdu sayaq,
O da şah olmuşdu Süleyman sayaq.
Şahin qanadından günlüyü vardı,
Nəşinə qaraquş kölgə salardı.
O qədər böyükdü ondakı şahlıq,
Vəhşilər vəhşətdən çıxmışdı artıq.
Qoyun qurd belinə yatıb qalırdı,
Maral şir üstünə ayaq alırdı.
Düzəlmişdi itlə dovşan arası,
Şir südü əmirdi ahu balası.
Məcnun yol gedirdi əlində canı.
Vəhşiylə dolmuşdu onun dörd yanı.
Yatacağı yeri tülkü görərdi,
Ona quyruğuyla yer süpürərdi.
Ahu sığallardı yanaqlarını,
Qoynuna alardı ayaqlarını.
Onun cüyür kimi həmdəmi vardı,
Maral sağrısına o, baş qoyardı.
Başının üstündə şir diz çökərək,
Keşikçi durmuşdu qılınc çəkərək.
Canavar olmuşdu ona pasiban,
Canını edərdi yolunda qurban.

Vəhşidən doğulmuş yırtıcı pələng
Öz təbiətini eyləmişdi tərk.
Çöl heyvanlarından iki-üç qatar
Onun ətrafında tutmuşdu qərar.
Vəhşilər içində tək oturmuşdu.
Elə bil, qoşunlu bir şah durmuşdu.
Qorxaraq ordakı yırtıcılardan,
Onun yaxınına gəlməzdi insan.
Izinsiz gəlsəydi ora bir nəfər,
Didib parçalardı onu vəhşilər.
Izinlə gəlsəydi yanına hər kəs,
Vəhşi heyvanlardan çıxmazdı bir səs,
Istər qohum olsun, istərsə tanış
Yaxına gəlməzdi izin almamış.
Gedirdi vəhşilər yanınca hər an,
Sanki sürüsüylə gedirdi çoban.
Vəhşilər mülkündə tutmuşdu qərar,
Vəhşiylə dost olan, vəhşi də olar.
Yanına ahular çox toplanardı,
Qəribə, çox şıltaq bir ahu vardı:
Oynağan və zirək bir ahuydu bu,
Sağrısı çox hamvar, ucaydı boynu.
O çox xoş gələrdi bizim Məcnuna,
Ayrıca bir qayğı bəslərdi ona.
Yanına çəkərək o yoldaşını,
Tutub sığallardı onun başını.
Hər gün o gözləri öpməyi vardı,
O gözlər Leylini xatırladardı.
Camaat qalmışdı bu işə heyran,
Onun vəhşilərlə dost olmağından.
Kimin ki, sövdası, eşqi solmazdı,
Məcnunu görməmiş sakit olmazdı.
Hər gün bir diyardan gələn yolçular
Onun ətrafında tutardı qərar.
Tutduğu orucu sındırsın, deyə,
Yeməklər gələrdi ona hədiyyə.

Xeyməgah quraraq şir dərisindən,
İgidlər qəlbini üzərdi bilsən.
Yemi vəhşilərə paylardı bütün,
Özüsə bir tikə yeyərdi hər gün.
Vəhşi heyvanlara o, il uzunu
O qədər verdi ki, öz ruzusunu,
Ruzi verən bilib onu hər heyvan,
Səcdəyə durardı gördüyü zaman.
Ondan ayrılmazdı bir dəm vəhşilər,
Gəlib yem alardı hər axşam, səhər.
Bir eli aldadar verilən ehsan,
Ehsana qul olar hər azad insan.

**HEKAYƏ**

Qədimdə belə bir rəvayət varmış
Ki, Mərv ölkəsində bir şah yaşarmış.
Bir neçə köpəyi zəncirləyərək,
Bəndlərdə saxlardı onları div tək.
Itlərdə əъdaha qüvvəti vardı,
Dəvənin boynunu qopararlardı.
Acıqlanan zaman şah bir nəfərə,
Atarmış yazığı quduz itlərə.
Şahın qəzəbinə düşsəydi hər kəs,
Köpəklər dağıdıb yeyərdi dinməz.
Şahın yaxın olan adamlarından
Ağıllı, kamallı bir nəfər cavan
Qorxdu ki, dostları qıran bu cəllad
Günlərin birində olsun ona yad,
Onun ahusunu öz vərdişiylə
Sınaqdan keçirsin köpək dişiylə.
İtlərdən qorxaraq, min həyəcanla
O gedib dostlaşdı it saxlayanla.
İtlərin yanına gəlcək hər kərə,
Bir qoyun atardı vəhşi itlərə.
Bu yolda bəsləndi, saxlandı itlər,
O gəncdə qalmadı qorxudan əsər.

O açıq əllini görən hər köpək
Ona qul olmuşdu, boyun bükərək.
Bir gün, acıqlandı şah o cavana,
Üzünü, gözünü turşutdu ona.
Cəllada əmr etdi haman zülümkar:
"Bu gənci bu saat itlərə apar!"
O itməcazlılar itlik etdilər,
İt pay qapan kimi alıb getdilər.
Gəncin əl-qolunu bağlayıb haman,
İtlərə atdılar onu kənardan.
O dəmirpəncəli, o pələng itlər
Əvvəlcə cavana hücum etdilər.
Ancaq, tanıyınca baxıb durdular,
Quyruq bulayaraq boyun burdular.
Hamsı yerə yatdı üzləri üstə,
Yatdılar baş qoyub dizləri üstə.
Gəncə dayə kimi oldular, bilsən.
Bir gün gəlib keçdi bunun üstündən,
Üzünü göstərdi ağ səhər yenə,
Boyandı üfüqlər qızıl rənginə.
Şah peşiman oldu öz tutduğundan,
Yaxın nədimlərə söylədi bu an
"Dünən o günahsız ahucuğu mən
Səhv edib itlərə verdim əlimdən.
Bir baxın, görün ki, o quduz itlər
Gəncin vücudundan qoydumu əsər?"
Itləri saxlayan gəldi çaparaq,
Dedi ki: "Ey şahım, sən sirrə bir bax,
Bu gənc - insan deyil, mələkdir, mələk.
Onu sayəsində saxlayır fələk.
Qalx, gəl, bir ondakı işığa bax sən,
Tanrı sənətini bəlkə görəsən.
Itlərin ağzında sağ oturmuşdur.
Onların ağzına möhür vurmuşdur.
O əъdahaüzlü canavar itlər
Onun tükünə də verməmiş zərər".
Şah əmr eylədi ki: "Dayanmaq olmaz,

O əldən getmişi tez edin xilas".
İtlərin yanından, yol məmurları
Gənci gətirdilər saraya sarı.
Şah heyran qaldı ki, o igid cavan
Necə can qorumuş o quduzlardan.
Ağlaya-ağlaya göz yaşı tökdü,
Ondan üzr istəyib, diz üstə çökdü.
Dedi ki: "Aç, söylə sən, ey qəhrəman,
Necə can qurtardın o quduzlardan".
Gənc dedi: "Əvvəlcə çəkinib səndən,
Tikələr atmışdım o itlərə mən.
Etdiyim yaxşılıq getmədi hədər,
Itlər öz ağzını möhürlədilər.
Lakin qulluq etdim düz on il sənə,
Axırda bu cürə haq verdin mənə.
Sən məni itlərə atdınsa əgər,
Yaxşı ki, dost yeyən deyilmiş itlər.
Dostluğu səndə yox, itdə gördüm mən,
It bilən hörməti ayaqladın sən.
It sənə dost olar, bir sümük atsan,
Namərd qədir bilməz, olsan da qurban".
Şah heyran qaldı ki, bu nə hekmətdir,
Bildi ki, səadət - insaniyyətdir.
Qəflət yuxusundan ayıldı birdən,
Əl çəkdi itlikdən, itpərəstlikdən.
Bunu söyləməkdən bir məqsədim var:
Səxavət qələdir, o, can qoruyar.
Məcnun bəslədikcə o heyvanları,
Çəkdi dövrəsinə bir can hasarı.
Hasar ətrafında gəzən hər heyvan
Məcnunun işinə yarardı hər an.
Bir yerdə dursa da, qalxsa da əgər,
Yanından getməzdi dostu vəhşilər.
Məcnuna bənzəsən insanlıqda sən.
Dünyada nə qüssə, nə dərd çəkərsən.
Xəlifə də yesə süfrəndə nemət.
Yeməyi səndənsə, qulundur, əlbət.

**MƏCNUNUN ULDÜZLARA ŞİKAYƏTİ**

Gecə parlayırdı bir gündüz kimi,
Göylər tər-təzəydi yaşıl düz kimi.
Qızıl həmailin şəddələrindən
Qızıl geyinmişdi göy üzü, bilsən.
Səyyarə ədəblə əl bağlayaraq,
Üfüqün fərşinə döyürdü ayaq.
Uzaqdan lahövlə vəla deyərək,[103]
Divə qılıncını çəkmişdi şimşək.
Gecənin nafəsi fələkdə yandı,
Ayın gövhərindən yer işıqlandı.
Göydə parladıqca nafəylə gövhər,
Ətirlə, bəzəklə doldu üfüqlər.
Fələk çərx üstündə tutmuşdu qərar.
Qütbün qələsinə çəkmişdi hasar.
Fərqəd öz atını çapırdı yenə,[104]
Gəmisi çatmışdı Şətt sahilinə.
Fələk hər addımda büsat açırdı
Gecəyə yüz cürə ulduz saçırdı.
Pərvin al və sarı ipək tutaraq,[105]
Qızıl sancağına çəkirdi bayraq.
Ay sarı ipəkdən tutmuşdu halə,
Rübəndi bənzərdi onun xəyalə.
Ulduzlar girmişdi başqa sifətə,
Min bir yaraşığa, min bir zinətə.
Elə bil ki, şahın öz kamanından
Möhrə atılmışdı aya bu zaman.
Ütarid süzərək göydə gəzərdi,
Fəzaya sancılmış oxa bənzərdi.
Yəhərinin qaşı Zöhrəydi, gerçək.
Gözəl görünürdü onun alnı tək.
Onun qılıncı tək günəş də parlaq,
Gecə örtülüydü, gündüzsə çılpaq.
Mərrix də gözündən qəzəb tökərdi,
Düşmənin gözünə millər çəkərdi.

Onun üzüyünü Bürcis saxlardı,
Onda dünyaların talei vardı.
Onun qılıncını itilər Keyvan,
Belindən bir bilöv asmışdı əlan.
Şahın bu cəlalı heç də solmasın.
Dünya camalından məhrum olmasın.
Bu şah qapısında tapdın məqami,
Şənin nə yüksəkdir sənin, Nizami!
Bürclər, mənzillər dairəsindən
Fələk zəlzələyə düşmüşdü, bilsən.
Həməl bürcü ayın dodaqlarından
Haşiyə tikmişdi göyə bu zaman.
Dərya öküzü tək, o öküz bürcü
Gövhər boğazlıydı, dişləri inci.
Kəmər bağlamışdı Cevza iki qat,
Qoşa payalıydı əyləşdiyi taxt.
Həqə gəlin kimi girib duvağa,
Durmuşdu Hənəylə qulaq-qulağa.
Qayçı dırnağını uzadıb Xərçəng,
Vəhşi dırnağını tuturdu, gerçək,
Nəsrə bir tərəfdə səpirdi gövhər,
Tərfə də bir yanda dağıdırdı zər.
Cəbhə budaqları yanırdı düm ağ,
Şölə saçmadaydı ondan yüz çırağ.
Qəlbüləsəd belə Əsəd bürcündən
Ud alovu kimi yanırdı, bilsən.
Əzra kənar durmaz gözəl Sərfədən,
Sünbülə atmırdı sərfəsiz bir dən.
Əvva güvənərək beş qılıncına,
İtini qovurdu şirlə yan-yana.
"Yetim süfrəsinə" xeyirxahlar tək,
Qüfr, tullamışdı altı pay çörək.[106]
Mizan öz dilindən alov saçmışdı,
Çox bilmişlər kimi o, dil açmışdı.
Əklil bağışlamış Qəlbəyə bir tac,
Əqrəb də kamana vermişdi xərac.
Nəayim xərcini öyrənsin deyə,

Bəldə çalışırdı iki-üç əllə.
Cədi baş kəsməyin sirrin bilərək,
Başını kəsmişdi keçi başı tək.
Ağzını yumuşdu Zabeh qorxaraq,
Səd cilovlamışdı Əxbiyəni, bax.
Yemək iştahında olmasaydı Bəl,
Duaya açmazdı səhər vaxtı əl.
Dəlv də günəşin gileylərindən
Ağzına su alıb susmuşdu birdən,
Altına qızıldan iki xət salmış
Ki, bu qabaqdadır, o dalda qalmış.
Bir qatar dəvəylə o Rəşa, Xatun
Kəcavə etmişdi bətnini Hutun.
Bürcləri dolduran göy cisimləri
Ulduzlar yoluyla gedir iləri.
Bax Bətnülhəməlin dörd ayağına,
Bağlanmış havanın üç bucağına.
Əyyuqun zoruna, gücünə bax bir,
Tay-tuşdan tac qapıb, bir baş yüksəlir.
Sacayaq adlanan ulduz da bu an
Göyün qazanına pay verir haman.
Şeri yəmənli tək nədənsə, bilməm,
Şersiz rəqs edir yerində bu dəm.
Məbsutə çıraq tək yaxmış özünü,
Məqbuzə çıxarmış qarğa gözünü.
Səyyaf duman rəngli qılıncla durmuş,
Qılıncı Aslanın boynunu vurmuş.
Yalqız adam kimi Fərd adlı ildız
Cənubun üstündə parlayır yalqız.
Sərir üç ulduzla bir məclis qurmuş,
Dördüncü fələyin altında durmuş.
Simak ulduzları cərgəylə köçür,
Ramehdən Əzələ karvanla keçir.
Qoşa qanad açmış uçucu Nəsrin,
Uçurdu üstündə göy adlı qəsrin.
Atını Nəş ilə çapırdı Qarı,
Qarının Nəşsiz gəlməz qərarı.

Suha ulduzu da görərdi uzaq,
Bütün qonşuları geri qoyaraq.
Səhər çağının da Qurd nəfəsi var,[107]
Yusif tək quyunun dibində parlar,
Fələkdə rəqs edən o səyyarələr
Nəş qızlarına salmışdı nəzər...
Məcnunun qəlbində gizli bir maraq,
Oyunbaz fələyi seyrə dalaraq,
Zöhrə ulduzuna dil açdı qəlbən:
"Ey sənə taleim etimad edən,
Gecənin alnında işıq yandıran,
Səadət bəxtini işıqlandıran,
Xoşbəxtlik yolunun sənsən məşəli,
Sənsən aşiqlərin sövda əməli.
Hər əməl açarı səndədir, yəqin,
Şərbəti səndədir hər piyalənin.
Şahlıq üzüyünün bir qaşısan sən.
Murad sarayının gözəli sənsən.
Səndən yaranmışdır incə hisslər,
Gözəl təbiətin yaranmış ənbər.
Var olan lütfündən ehsan ver bizə,
Bir umud qapısı aç üzümüzə.
Canıma dərmandır sevdiyim dilbər,
Sən yetir canandan mənə bir xəbər".
Üfüqdən göründü yenə Müştəri,
Bu oldu Məcnunun ona sözləri:
"Sən ey səadətin ulduzu sənəm,
Vədəsi, iqrarı daima möhkəm,
Sən ey baxışları bizə ruh verən,
Dünyanı adınla fəth elədin sən.
Ey umud məktubu yazan Müştəri,
Səndəndir ölkənin fəthi, zəfəri.
Bu aləm sayəndə tutmuşdur qərar,
Dünyanı yaşadan bir qüdrətin var.
Sən, ey taleimin şəni-şöhrəti,
Səndədir qəlbimin bütün qüvvəti.
Gəl vəfa gözüylə üzümə bir bax,

Mənim bu dərdimə çarə taparaq,
Gəl mərdlik əlini mənə də yetir,
Bu qara talei üstümdən götür.
Ah! Bir xəbər yetir mənə dostumdan,
Bir gül itirmişdir, fərz et, gülüstan".
Gördü ki, buxardan olan ulduzlar,
Qaçışıb tutmayır fələkdə qərar.
Bildi ki, xəyalın səfası çoxdur.
Amma ki, dərdinə dəvası yoxdur.
Üz tutub yalvardı aşiq bir daha,
Hər dərdin çarəsi böyük allaha.
Dedi: "Ey qapısı son sığınacaq,
Sənsən umud yerim dünyada ancaq.
Zöhrə, Müştəri tək sənin qulun var,
Adınla başlanır aləmdə adlar.
Hamıdan ucadır elmin, hikmətin,
Axar çeşməsisən sən səxavətin.
Sən, ey hər müşkülün açarı olan.
Səxavət ağası, dərdlərə dərman,
Səninlə yüksəlir hər böyük dilək,
Acizə, məzluma bir sənsən kömək.
Qarşında qul kimi bəndələrik biz,
Yoxdur səndən özgə ağamız, şəksiz.
Sən ey yeddi göyü yaradan qüdrət,
Hamımız bir sənin bəndənik, əlbət.
Kainat adlanır qurduğun əsər,
Sənin əlaltındır altı cəhətlər.
Sən o varlıqsan ki, kəc baxsa insan,
Bir dəmdə kor olar gözləri, inan.
Qulundur gövhəri pak olan bəşər,
Sənsiz olan başa torpaq səpilər.
Sən, ey torpağıma su verən allah,
Mənim bu halıma nəzər yetir, ah!
Mərhəmət sayəni kəsmə üstümdən,
Bil ki, bir acizəm, bir qəribəm mən.
Tanrılıq lütfündən mənə də göndər.
Qaranlıq gecəmi gündüzə döndər.

Günümü vəfayla mübarək elə,
Bəxtim kor olmasın bu gündən belə".
Məcnun mətləbini dedikcə göyə,
Yatdı bu sözləri o deyə-deyə.
Onun gözlərinə bir yuxu gəldi,
Bəxtinin ağacı göyə yüksəldi.
O yaşıl budaqdan bir quş uçaraq,
Məcnunun yanına gəldi qaçaraq,
Tacının üstündə düşərək haman,
Gövhər səpələdi o quş ağzından.
Elə ki, röyadan Məcnun oyandı,
Gün çıxdı, üfüqlər ala boyandı.
Aşiqin üzünə güldükcə səhər,
Oxşadı ruhunu gülgün şəfəqlər.
Məcnun o quş kimi qanad açmışdı,
Röya xəyalına şəfəq saçmışdı.
Aşiqin üzünə gülməsə visal,
Ona təsəllidir yuxuyla xəyal...

## LEYLİNİN MƏKTUBUNUN MƏCNUNA YETİŞMƏSİ

Parladı aləmə günəşin üzü,
Ondan aydın olsun hamının gözü.
Behiştdən doğmuşdu o gözəl səhər,
Isa nəfəsliydi əsən küləklər...
Işi düz gətirən hər məsud insan,
Sağ əli üstündə qalxdı yuxudan.
Tale usanmışdı acıqdan o vaxt,
Qayıdıb gəlmişdi gec olsa da vaxt.,.
Öz qəlbini əkib, ciyərni biçən,
Min bir məşəqqətin suyundan içən
Məcnun vəhşilərlə dağda durmuşdu
Onların içində tək oturmuşdu.
Səhradan kənarda, nəzərdən uzaq
Qalxdı dağa tərəf tünd bir tozanaq.

O toz pərdəsinin ardınca gələn
Bir atlı üzünü göstərdi birdən.
Bir nur parçasıydı o gələn insan,
Bir az yaxınlaşıb düşdü atından.
Məcnun duydu onun dost olduğunu,
Nəcib bir insana oxşatdı onu.
Baxıb yanındakı o vəhşilərə,
Işarə etdi ki, yatsınlar yerə.
Özüsə atlının yanına qoşdu,
Mehriban bir dillə belə soruşdu:
"Ey Yəmən ulduzu, bu nə gəlişdir?
Mən hara, sən hara, nə xeyir işdir?
Nə qədər olsa da siman mehriban,
Bu çöl vəhşiləri uzaqdır ondan.
Çatıdan qorxuram, ilan sancmış tək.
Əъdaha sancmışdır canımı, gerçək.
Bayaq hərzə-hərzə yalan danışan
Sinəmin üstünə sancdı bir tikan.
O dəmir tikandan çox ağrıdım mən,
Hələ mismar qalxır mənim sinəmdən.
Mətaın beləsə, yolunla düz keç,
Yaxşısı budur ki, ağız açma heç".
Yolçu mehribandı, qəlbi də kövrək,
Onun ayağına düşdü kölgə tək.
Dedi: "Ey dünyanın əşrəfi insan,
Vəhşilər dizinə baş qoyub yatan,
Ahular qəlbini vermişdir sana,
Aslanlar yolunda durur mərdana.
Bir qərib aşiqə sevgilisindən
Xoş xəbər gətirən bir insanam mən.
Sənə deyiləsi sözlərim vardır,
Gizli saxladığım bir yadigardır.
Açıb söyləyərəm, icazən olsa,
Yoxsa ağzımı da açmaram əsla".
Aşiq bu sözlərdən ürəklənərək,
Dedi: "Nəyin varsa, aç söylə görək"
Yolçu söylədi ki: - Tək qalan aşiq,

Bəxtinin tünd atı ram olan aşiq,
Dünən bir obadan keçirdim yalqız,
Yol üstdə durmuşdu ayüzlü bir qız.
Ay nədir, gün kimi üzü parlardı,
Qara bir ipəkdən niqabı vardı...
O, bağ sərvi kimi deyildi barsız,
Qapısız bir behişt bağıydı o qız.
Dinəndə bal dilli o gözəl nigar,
Lal olub yuxuya gedərdi sular,
Ahu gözləriylə baxsa o canan,
Dovşan yuxusuna gedərdi aslan...
Boyu "əlif" kimi, ağzı "mim" kimi,
Qıvrılmışdı saçı onun "cim" kimi.
Deyirdi: - Adımdır mənim də bu "cam"[108],
Dünyanı göstərir özündə bu cam.
Qoşa nərgiz kimi gözləri xumar,
Sanki bir bulaqda bitmişdi onlar.
Qaşları çatmaydı, həm də tamaşa,
Təkəm söyləyirdi, olsa da qoşa.
Könül ovlamağa bir sehr açardı,
Reyhan nəfəsindən ətir saçardı.
Xülasə, nə deyim, o gözəl bədən
Doğulmuş nəfəsdən, yaranmış gözdən.
Lakin, məhəbbətin üzündən bir az
Saralıb solmuşdu haman sərvinaz.
Kamana dönmüşdü o gözəl pəri,
Solğun yanağında yaş inciləri...
Xeyzaran biləyi bir neyə bənzər,
Ərqəvən yanağı xeyriyə bənzər.
Xeyri sarı deyil, bəlkə də zərdir,
O ney qamış deyil, bir ney-şəkərdir.
O göz qələsinin üstündə fələk
Kəmənd oynadırdı rəqsə gələrək.
Sultan ilə Ayaz müttəfiq olmuş,
Keşikçi məst idi, sərkərdə bihuş.
Dostuna can-başla umud bağlardı,
Ərindən qorxaraq pünhan ağlardı.

Gülab süzüldükcə kirpiklərindən,
Ay işıq səpirdi günəşə, bilsən.
Oxşatma dedikcə, daima ağlar,
Duydum ki, qəlbində bir məqsədi var.
Dedim ki: "Nə üçün ağlayırsan sən,
De, kimin həsrəti keçir qəlbindən.
Acı bir gülüşlə o bal dodaqlar
Dedi: "Ey yarama duz səpən dildar,
Bir zaman Leyliydim, indisə nakam,
Məcnundan min dəfə artıq məcnunam.
Bəxtinin ulduzu batan aşiqdən
Min dəfə şiddətli divanəyəm mən.
O hədəf oldusa bu dərdə, yasa,
Bir qadın deyildir o, heç olmasa.
Sövda yollarında göstərir hünər,
Kimsədən nə qorxar, nə də çəkinər.
O deyil mən kimi zillət dustağı.
Istədiyi yeri gəzir ayağı...
Zavallı mənəm ki, ürəyimdə qəm,
Dərdimi heç kəsə aça bilmirəm.
Qorxuram, əhvalım pərişan ola,
Yaxşı adım belə çox yaman ola.
Zəhəri bal kimi içirəm bu dəm,
Cəhənnəm odunu otla örtürəm.
Bir yandan əlimdən itirdiyim yar,
Bir yandan üstümə tökülən əğyar,
Bu iki dəstənin əlindən, inan,
Bəlalər çəkirəm hər zaman, hər an.
Ərlə vuruşmağa yox cəsarətim,
Atamdan keçməyə yoxdur qüdrətim.
Eşq ürək verir ki, sən də qanad aç,
Bu qarğa-quzğundan kəklik kimi qaç.
Ad ilə namussa: "tərpənmə"- deyər,
Tək uçan kəkliyi qızıl quş eyər...
Bir qadın nə qədər cəsur olsa da,
Yenə də qadındır adı dünyada.
Cəsarət olsa da qadın qəlbində,

O, aslan olsa da qadındır yenə.
Qurtara bilmədim bu qüssələrdən,
Yenə qəm çəkməyə boyun əydim mən.
Lakin, ciyərim qan, vaxtım gecədir,
Kim bilir, yarımın halı necədir?
Kimin kitabını oxuyur mənsiz?
Ömrü necə keçir yurdsuz, vətənsiz?
Kim bilir, baş alıb hara qaçmışdır?
O, hansı sarayda süfrə açmışdır?
Hansı bir insana olmuş o həmdəm?
Kimlərə yar deyib, əylənir bu dəm?
Yolçu, bir az dayan mümkün olarsa,
Ondan bir xəbər ver, xəbərin varsa"
Qızdan eşitdikcə mən bu sözləri,
Barəndə bildiyim hər bir xəbəri
Hər sözü, qəlbimə nəqş edib, durdum,
Elə bil ki, muma bir möhür vurdum.
Dedim: "o divanə qərib bir quşdur,
Tayından, tuşundan uzaq uçmuşdur.
Maraldır, cüyürdür indi dostları,
Bir də səhraların başsız ruzgarı.
Eşqin o yazığın ağlını aldı,
Ata ölümü də nəfəsdən saldı.
Tikan, tikan üstdən batır qəlbinə,
Işdən işə düşüb dərd çəkir yenə.
Gah sənin dərdindən hekayət eylər,
Gah da göz yaşından şikayət eylər.
Bəzən atasına mərsiyə başlar,
Səsindən dil açıb danışır daşlar".
Sonra da o ayın hüzurunda mən,
Səndən eşitdiyim qəsidələrdən
Iki-üç beytini dedim avazla,
Leyli də ah çəkdi min bir niyazla.
Yerində titrəyib, ağardı düm ağ,
Dedim qız öləcək, gözündən iraq.
Sonrasa başını qaldırdı yenə,
Ah çəkdi, sarılıq çökdü rənginə.

Hönkürüb fəryadla ağladı yalqız,
Atanı novhəylə xatırladı qız.
Sənin bu dərdindən deyib o mələk
Yanırdı ürəyi od püskürərək.
Ağladı, sızladı o vəfalı yar
Sonra da and verdi mənə o nigar:
"Sən, ey qəlbi təmiz xeyirxah insan,
Mən bir yıxılmışam, yapış qolumdan.
Ömür keçirdiyim bu düşərgəhdən
Yolun düşən zaman zəhmət çək də sən
Mənim o xeyməmə yaxın gəl bir an,
(Göstərdi xeyməni mənə uzaqdan).
Bəlkə öz halımdan mən yana-yana
Bir məktub düzəldib tapşıram sana.
Bəlkə, o məktubu sən götürəsən
Mənim can dostuma tez yetirəsən".
Deyib bu sözləri, getdi o sənəm,
Mən də öz yoluma düzəldim o dəm.
Verdiyi nişanla mən dünən getdim,
O vəfa evini ziyarət etdim.
Gördüm qara paltar geyinmiş o yar,
Məktubu öpərək verdi o nigar.
Qəm möhrü vurmuşdu məktubuna qız,
Kitabın mənası sondadır yalnız.
Yolçu ehtiramla öpdü məktubu,
Sonra da Məcnuna tapşırdı onu.
Məcnun o məktuba baxıb hıçqırdı,
Başqa nə varsa da hamsını cırdı.
Qıvrıldı, ruhuna dünya dar kimi,
Yüz dəfə fırlandı o pərgar kimi.
Sərxoş tək torpağa yıxıldı birdən,
O məktub əlində düşmüşdü əldən...
Elə ki, ayılıb gəldi qüvvətə,
Qəlbindən yol verdi o şikayətə.

## LEYLİNİN MƏKTUBUNU MƏCNUNUN OXUMASI

Məcnun o məktuba tez əl apardı,
Məktubun başında bu sözlər vardı:
"Əqlə dayaq olan, ömrə can verən
Bir şahın adıyla başlayıram mən.
Ondan dərs almayan kamal qalmamış,
Odur dilsizlərin dililə tanış.
Ondan ruzi tapır quşlar, balıqlar,
Işığı, zülməti bölən sənətkar
Göyü ulduzlarla işıqlandırmış,
Yerdə insan adlı günəş yandırmış.
O - calal sahibi əzəliyyətdir,
O - ölmək bilməyən əbədiyyətdir.
Ondan həyat alır bütün canlılar,
Həyatdan qiymətli xəzinəmi var?
Ağlın işığıyla bəzədi canı,
Bunlar da bəzədi bütün dünyanı.
Su kimi gövhərlər saçdı əlləri,
Sövdadan söz açdı onun dilləri.
Bu ipək məktubu oxu, gör nədir?
Bir qəm düşgünündən, dərd əhlindəndir.
Yəni bu hasarda həbs olan məndən
Sənədir ki, uçdun qırıq qəfəsdən
Necəsən, ey əhdi qədim olan yar?
Ey yeddi beşikdə yuva salan yar,
Ey dostluq mülkünə bir xəzinədar,
Məhəbbət işığı səndən alır, yar.
Sən, ey əqiq kimi daşda oturan,
Dağları qanıyla boyayıb duran,
Ey zülmətdə qalan Xızır suyu, sən
Ilk səhər şəminin pərvanəsisən.
Sən, ey vəhşilərin qəlbinə həmdəm,
Pərişan şurinlə dolmuş bu aləm.
Ey mənim tənəmə hədəf olan yar,

Sənlə qiyamətə bir yolumuz var.
Mən verdim könlümü sənin eşqinə,
Sən də sevgimizə sadiqsən yenə.
Bildir, işin nədir, de, nə haldasan?
De, kimi sevirsən, nə xəyaldasan?
Sənin bəxtin kimi uzağam səndən,
Biz ayrı olsaq da, səninkiyəm mən.
Aldanmış ərimi sevmirəm, haşa,
Bir gecə yatmamış mənlə baş-başa.
Dürrüm deşilməmiş, ərisəm də mən,
Bir almas dəyməmiş o dürrə həmən.
Qapısı möhürlü durur xəzinəm,
Bağ qönçəsi kimi bağlıdır bu dəm.
Doğrudur, ərimin calalı vardır,
Sənsiz olan calal xərabəzardır.
Süsənə oxşayıb dursa da bir az,
Sarımsaq yarpağı ələ alınmaz.
Xiyar da saralıb turunca dönər,
Onun şəkli belə turunc görünər,
Dadı da turş olar, turunc dadı tək,
Lakin, turunc dadı verəmməz bişək.
Istərdim, dünyada sağ başım olsun,
Sən kimi bir yuva yoldaşım olsun.
Yolundan kim qaçsa çöl eşşəyi tək,
Meydini belində gətirsin eşşək.
Hicrana düşdüksə bu dünyada, ah!
Söylə ey sevgilim, məndə nə günah!
Ah, səni duymayan soyuq bir ürək
Bəlalar içində ağlasın gərək.
Hər kim ox qaldırıb qıysa canına,
Sağ əli quruyub düşsün yanına.
Bir tükün gözümdə dünyaya dəyər,
Xoşdur hər tikanın gülüstan qədər.
Xızır ətəyidir qaldığın məskən,
Xızır suyu kimi dərmanım ol sən.
Mən ayam, sən də bir günəşsən, inan,
Mən səndən alıram işığı hər an.

Səndən geri qaldım, əfv et məni gəl,
Bilirsən nə idi yolumda əngəl.
Atayın vəfatı incitdi məni,
Ölmüş vücudumdan cırdım kəfəni.
Elə zənn etdim ki, atamdır ölən,
Didib parçaladım üzümü birdən.
Gözümə gül kimi millər çəkərək,
Göy etdim donumu bənəfşələr tək.
Eşqinə sadiqəm, yolunda dustaq,
Dərdinə şərikəm, qəminə ortaq.
Yanına gəlməyim olmadı mümkün,
Başqa şərtlərisə görmüşəm bütün:
Vücudum ayrısa sənin yanından,
Ruhum ayrılmamış yanından bir an.
Dərdindən, qəmindən mən xəbərdaram;
Çarə axtarıram onlara müdam.
Ikicə günlükdür bu düşərgəmiz,
Yola getməliyik zəmanəylə biz.
Sənə camal verən, rəng verən bu ev
Darısqal olsa da, gəl onu sən sev.
Günlərin yenəmi boş keçəcəkdir?
Bir az sakit ol ki, ömür gödəkdir.
Dünyada səbr elə hər şeydən əvvəl
Iradə mülkünün hakimi ol gəl.
Bəsdir, az dərd çəkib şikayət eylə,
Cəfaya dözməyi gəl adət eylə.
Mən də sən gündəyəm, ey talei kəm,
Lakin qədəmimi tutmuşam möhkəm.
Gözünü bağlasa yaxşıdır insan -
Onun göz yaşına gülürsə düşman.
Düşməni şad edib güldürürsə qəm,
Ağıllı dərd çəkib, olarmı dilqəm?
Nə olur, bir az da sevinib şad ol,
Bu dərddən, qüssədən, qəmdən azad ol.
Bu dünya dəyişib dönür əzəldən,
O, alt-üst olsa da, gəl darıxma sən.
Kəndlinin dənini udsa da torpaq,

Yenidən göyərir, sən buna gəl bax.
Xurma ağacında bu gün tikan var,
Sabah yetişəcək şirin xurmalar.
Qönçə tikanlıqda olsa da əgər,
Açılacaq güldən bir müъdə verər.
Qəlbini sıxma ki, sən kimsəsizsən,
Mən kiməm, adamın deyilmiyəm mən?
Heç kəs köməksizəm, deməsin gərək,
Köməksiz olana allahdır kömək.
Yanma şimşək kimi atasızlıqdan,
Bulutlu gözündə qopmasın tufan.
Ata ölmüşsə də, oğul çağ olsun,
Mədən qırılmışsa, gövhər sağ olsun".
Məcnun bu məktubu oxuyan zaman
Çıxdı qönçə kimi öz qabığından...
"Ay allah"dan başqa dinmədi artıq,
Bir anlıq özünə gəlmədi yazıq.
Sonra huşa gəlcək öz adətilə
Bir neçə saatlıq ağladı yenə.
Qasidi ordaca saxlayıb bir an,
Gah əlindən öpdü, gah ayağından.
Dedi: "Nə kağızım, nə qələmim var,
Cavab gözləyəcək məndən o nigar".
Açdı heybəsini qasid belindən,
Heybənin içini tökərək birdən,
Yazı şeylərini göstərdi ona,
Sonra qaydasınca verdi Məcnuna.
Məcnun ki, qələmi aldı əlinə,
Min bir nüktə vurub, nəqş açdı yenə.
Qəlbində gizlənmiş hər dərdi, qəmi
Söz boyunbağına düzdü qələmi
Məktubun başını bağladı sonra,
Qasidə tapşırıb "Qaç" dedi ona.
Qasid də məktubu alıb apardı,
Yel kimi Leylinin yanına vardı.
Məktubu açaraq oxuyanda qız,
Onun göz yaşıyla islandı kağız.

## MƏCNUNUN MƏKTUBUNU LEYLİNİN OXUMASI

Məktub başlanmışdı böyük allahla
Misilsiz, əvəzsiz o padişahla.
Batinə, zahirə bələd qüdrətlə,
Sərt daşa gövhərlər verən hikmətlə.
Göydə ulduzları qoruyub güdən,
Ulduz karvanına başçılıq edən,
Hər qəlbi dostluqla işıqlandıran,
Gecənin qəlbində işıq yandıran,
Baharı su ilə doyuzduranla,
Bütün möhtaclara kömək duranla.
Sonra, öz dərdini açıb dərindən:
Deyirdi kül olmuş ciyərlərindən:
"Bu məktub sənədir, ey üzü mahım,
Sənsən bu dünyada son qərargahım...
Yox-yox, bu, qanına qərq olan məndən
Öz qanını satan sənədir, bilsən.
Daşlar arasında qalmış bir açar
Sən tək xəzinəyə necə yol açar.
Canan, ayağıyın torpağıyam mən,
Bəs kimin suyusan bu saflıqla sən?
Mən ki, alçalıram qədəmlərinə,
Kimin ətəyindən tutursan yenə?
Mən sənin dərdini gizli çəkirəm,
Bəs kimin qəmidir sən çəkdiyin qəm?
Çiynimdə çəkdiyim bu yük sənindir,
Kimin sırğasını taxmısan, de bir?
Sən, ey astanası mehrabım sənəm,
Camalın olmuşdur cahanda Kəbəm.
Ey yüz min sinəyə mərhəm afitab,
Sərabda incisən, şüşədə şərab.
Ey könlüm evini qarət edən yar,
Sən tacsan, rəqibim oldu tacidar.
Ey yadlar əlinə düşmüş xəzinə,

Səndən ilan çatar dostlar əlinə.
Ey cənnət bağı tək açarsız olan,
Fələk behişti tək gizli gülüstan,
Sən, ey müşkülümü açan xilaskar,
Sövdamı güldürən bir sənsən, ey yar.
Bu ud meşəndəndir, onu qırma, dur,
O sənin baltanla həlak olmuşdur.
Görürsən torpağam, gəl məni bəslə,
Gönlümün tozunu gəl sil həvəslə.
Bahara dönərəm bəsləsən məni,
Pis baxsan, dərdlərə salaram səni.
Torpağa mərhəmət xeyirdir, inan,
Lütf etsən gül verər, zülm etsən tikan.
Düşdüm ayağına başımda vüqar.
Gəl məni sərgərdan buraxma, ey yar.
Elə yol demə ki, inciyim səndən,
Elə su vermə ki, yerə töküm mən.
Üzdə hesabın da öz mənası var,
Onsuz həyalılar həyasızlaşar.
Qulun tanınmışam dünyada, dilbər,
Düşmənin olaram, rədd etsən əgər.
Itə qurd silahı verilsə, artıq,
Başını qaldırıb edər aslanlıq.
Xəzinə tapşırsan hər gədaya sən,
Bir dünya xətalar çıxar əlindən.
Bu qulluq yolunda yük çəkir belim,
Ağalıq rütbəni saxla, sevgilim!
Bil ki, sayılıram sənə mən süpər,
Əgər yerə atsan, olaram xəncər.
Gəl, öz silahını sən daşa vurma,
Bir də öz ordunla üz-üzə durma.
Vursan öz əlinlə canına neştər,
Bil ki sağlam canın azara düşər.
Dostluq, mehribanlıq göstərsən, ey yar,
Gəlib qulun olar azad adamlar.
İncitmə aldığın qulu özündən,
Qoy sürmə qapmasın sənin gözündən.

Ağada olmasa belə bir tədbir,
Bil ki, öz quluna sahib deyildir.
Başqa bir insanda olsa bu hünər,
Çoxunu özünə pulsuz qul eylər.
Gəl mənim beynimi alovlandırma.
Heç kəsin başında alov yandırma.
Hər canda bir qəzəb saxlanır, inan,
Bir div aşinası olur hər insan.
Bil ki, sənin divin çıxarsa yerdən,
Başqa div qarşıya atılar birdən.
Mən tikan dərirəm, gülünü sən dər,
Sən də gəl birlikdə olaq bəxtəvər.
Yenəmi əyləncən olacağam mən?
Nədən, bir gün məni şad etməyirsən?
Soyuq nəfəsimlə çəkdiyim ahdan
Havanın beynində toz donar, inan.
Sən, ey yad qoltuğa sığınan dilbər,
Qəlbinə çox yatır o seçdiyin ər...
Sən buz lövhəsinə yazdın adımı.
Qırıb yerə tökdün qol-qanadımı.
Dediyin sözləri yaxşı düşün bir,
Yox, onlar heç deyil, heçdən də heçdir.
Sən bağışlamadın atıma bir nal,
Ancaq yüz nal atdın oduma dərhal.
Sən etdin günümü gecə tək qara,
Acıdın sonra da bu yaralara.
Səninçin qəlbimi mən vurdum daşa,
Sənsə öz vəfanı vurmadın başa.
Ey gönül ovçusu, vermədin aman,
Can gedir, nə zaman dost olacaqsan?
Budur, bax, vurduğun dil yaraları,
Mən yanıb qurtardım, sənsə coş barı.
Yox, yox, uzundilli istəsə əgər,
Yaranı canından tərk edə bilər.
Süsən uzundilli olmaq üzündən
Qılıncın başına sancıldı, bilsən.
Doğrudan qeydimə qalırsa bir yar,

Eşqi sifətindən aşikar olar.
Mənim bu günümdə söylə, görüm sən:
Mənə nə yaxşılıq gəlmiş əlindən?
Yoxsa, budurmu ki, əhdi unutdun,
Bir yadın qoynunda sən qərar tutdun.
Mənlə dil oyunu oynayan nigar,
Eşqinin gülünü dərir ki, əğyar.
Söylə, aşiqsənsə ahın hanı bəs?
Mənə uyğundurmu səndəki nəfəs?
Yox-yox, eşqimizə sən gəlmədin tuş,
Səndəki eşq yox, sültanlıq olmuş.
Sən, sənin dərdinə alıcı olan
Bu yazıq aşiqi unutdun, canan.
Mənsə göz tikmişəm üzünə müdam.
Sənin astanana mən baş qoymuşam.
Qürələr ataraq sizin məhləyə,
Fal açdım, üzünü bir görüm deyə.
Üzünü görənlər xoşbəxt oldu, bil,
Onlar mənim kimi pis gündə deyil.
Kimin ki, sən kimi gövhəri vardır,
Dərddən azad olan bir bəxtiyardır.
Bülbüllər olsa da bağın zinəti,
Əncirlər olmuşdur qarğa qisməti.
Bağban ürəyindən su içsə də nar,
Axırda xəstələr qisməti olar.
Əzəldən bu dünya belədir, göz aç,
Xəznə yer altında, sən isə möhtac...
Bilmirəm, gül rəngli ləl nə zaman
Eşiyə çıxacaq daşın bağrından.
Nə zaman o qəmər durub qaçacaq,
Əъdaha ağzından uzaqlaşacaq.
Artıq arı uçub, balı qalmışdır,
Ay gedib, beşiyi lap boşalmışdır.
Xəzinə açılıb, hər xəzinədar
Çəkilib qalmışdır hasardan kənar.
Çünki xəsis dehqan bağdan getmişdir,
Bülbül də qarğanı həmdəm etmişdir.

Bağda ipəyini tökmüşdür güllər,
Zəncilər qoymayır xurmadan əsər.
Cövhər bəhrəsizdir toz aynasından,
Xəzinə qalmışdır, ölmüşdür ilan.
O qələ xatunu çıxmış qələdən,
Lakin o qələdən uzaqdayam mən.
Sənin çırağından düşdümsə uzaq,
Pərvanən qalmasın işıqdan iraq.
Mən dərddən ölsəm də, rəqib sağ olsun.
Qoy Ibn-Səlamın kefi çağ olsun...
Halımın səndədir yaxşı-yamanı,
Bu verdiyin dərdin sənsən dərmanı.
Düzdür, dəmirdəndir hasarın sənin,
Sədəf içindədir mirvarın sənin.
O qıvrım saçların zəncirdir, nədir?
Xəzinən əъdaha ətəyindədir.
Özün də aşiqsən, bilirsən, ey yar,
Sevən ürəklərdə qısqanclıq olar.
Sənin üzərinə qonsa bir milçək,
Canımda yüz həvəs oynayır, gerçək.
Yer üstə bir milçək qonarsa əgər,
Həqiqi aşiqə qartal görünər.
Bir qarışqa kimi can atıram mən.
Milçəyi qovmağa şəkər üstündən.
Ah, mənim günümdə bir kişi vardı,
Mayası olmadan qazanc sayardı;
Dərilməmiş gülə həsrət çəkərdi,
Alınmamış dürrə keşik çəkərdi.
Oyunbazlıq deyil, eşqdir bunlar,
Mənim də başımda bu xəyallar var.
Necə ağlamayım dərdindən bəzən,
Bu yaman günümdən sən xəbərsizsən.
Qəlbimdən daş kimi asıldı dərd, qəm,
Bildiyindən artıq bir divanəyəm.
Eşqinlə mənliyim oldu tarimar,
Bu yolu mənliksiz qurtarmaq olar,
Qəlb belə tutmasa ilk məhəbbəti,

Dəyməz bir arpaya onun qiyməti.
Umudum qalmamış, ey nazlı canan,
Bir öpüş almağa gül dodağından.
Zülfündən ənbərlər saçdığın zaman,
Ağzını nafə tək açdığın zaman
Səhər nəsimindən ətir göndərsən,
Işlərim düzələr, ey nazik bədən.
Camalın bağından, ey gözəl sənəm,
Röyada bir xurma dərmək istərəm.
Badəni içməyə, ey nazlı nigar,
Könlümdə sönməyən bir ehtiras var.
Verdiyin al şərab ruh verər cana,
Mənə bu neməti qıysa zamana.
Sən əlində şərab mənlə durmusan,
Sənin şərabından, sərxoşam inan.
O gül dodağından, əlindən müdam,
Gah şarab, gah da ki, öpüş alıram,
O incə dodaqlar, yolsuz dodaqlar
Tutarmı başqa bir məclisdə qərar?
Onda əqiq rəngli, bal şəhdi vardır,
Ah, onu əmən şəxs nə bəxtiyardır!
Bəzən şəhd əmirəm dodaqlarından,
Bəzən gül dərirəm yanaqlarından.
Gah sığallayıram gözəl çənəni,
Gah ləbin şəkəri dirildir məni.
Bütün bu sözlərim, bil, əfsanədir;
Sənlə danışmağa bir bəhanədir.
Inan ki, bunlardan mən çox uzağam,
Safdır arzularım nə qədər sağam.
Tamah ayağına zəncir vurmuşam,
Sənin xəyalinlə yalnız dilxoşam.
Yanında min gecə otursam əgər,
Gözüm görməsə də səndən bir əsər,
Eşqin ki, daima bir yadigardır,
Sənin camalınla nə işim vardır?
Uğrunda çəkdiyim hər əzab xoşdur,
Əzabın eşqimə həmdəm olmuşdur.

Tək eşqin göstərsə mənə özünü,
Görməsəm də olar sənin üzünü.
Qoy eşqin sirrimçin dönsün əğyara.
Könlümə şəfadır vurduğun yara.
Qoy heç tapılmasın yarama məlhəm,
Sən salamat qalsan, nə qüssə, nə qəm!
Qoy, məni zillətə salsa da hicran,
Sən ondan uzaq ol, sevimli canan!
Düşsə də eşşəyim mənim ayaqdan,
Sənin ərəb atın var olsun, canan!
Pis tale gizlədi üzünü məndən,
Daima xoşbəxt ol bu dünyada sən!
Bir baş əyilməsə əmrinə bir gün,
Görüm ayağının altına düşsün!"

## MƏCNUNUN DAYISI SƏLİM AMİRİNİN MƏCNUNU GÖRMƏYƏ GƏLMƏSİ

Bəli, söz sərrafı o vaxtdan bəri
Düzmüş söz sapına bu inciləri:
Məcnunun aqil bir dayısı vardı,
Aşiqin halını yaxşı duyardı.
Hünər sahibiydi o halalzada,
Dadmışdı yaxşını, pisi dünyada.
Ona deyirdilər Səlim Amiri,
Samiri kimiydi ağlı, tədbiri.
Yaralı Məcnunun oydu məlhəmi,
Başından getməzdi aşiqin qəmi.
Hər ay əl tutardı yazıq Məcnuna,
Yemək də, paltar da verərdi ona.
Bir gün o qəribin dalınca yenə
Düşdü səhraların dərinliyinə.
Qovdu çöldən-çölə öz dəvəsini,
Dağ-daşı dolandı dəli div kimi.
Gördü ki, tayfadan, zəncirdən kənar,
Bir dağın dibində o tutmuş qərar.

İki-üç vəhşi də bürümüş onu,
Gəlib gedənlərin kəsmiş yolunu.
Qorxdu vəhşilərdən yorğun müsafir,
Uzaqdan-uzağa salam verdi bir.
Məcnun o salamı eşidən zaman:
"De, kimsən, nəçisən?" soruşdu ondan.
O sa cavab verdi: "Amiriyəm mən,
Yumruqlar yemişəm pis zəmanədən.
Sənin öz dayınam, dərk elə, bala,
Üzün möhtac deyil qara bir xala.
Sən də həbəşilər kimisən bu gün,
Üzün xal olmuşdur sənin büsbütün".
Məcnun tanıyaraq, dedi: "Yaxın gəl".
Onunla diz-dizə oturub, əvvəl
Olandan, keçəndən xəbərlər tutdu,
Söhbət şirin keçdi, dərdi unutdu.
Səlim qəbristanda kəfənsiz qalan
O çılpaq aşiqi gördüyü zaman
Bir əyin paltarı aldı yükündən,
Məcnuna verərək söylədi: "Bil sən,
Bu paltar halaldır, gey indən belə,
Halalzadə kimi davran mənimlə".
"Yox, mənim canımdan paltar uzaqdır,
Geyinsəm bədənim od tutacaqdır.
Zənn et ki, libasa mən meyil saldım,
Sonrasa cıraraq, yenə lüt qaldım".
Səlim çox əlləşdi orda, müxtəsər,
Paltarı geydirdi ona bir təhər.
Sonra heybəsini açıb tökərək,
Gətirdi Məcnuna ət ilə çörək.
Nə qədər dil töküb yalvardısa da,
Məcnun bir tikə də yemədi əsla.
Yeməzdi, içməzdi Məcnun bir kərə,
Nə tapsa verərdi o vəhşilərə.
Səlim soruşdu ki: "Ey bağrı qan, sən
Danış, gecə-gündüz bəs nə yeyirsən?
Adam ki, yeməklə, içməklə yaşar,

Danış, adamsansa, nə xörəyin var?"
Dedi ki: "Ey adı qəlbim tək Səlim,
Hər sözü, söhbəti, salamı həlim,
Könlümü doyuran yeməklər deyil,
Səhər çağlarının nəsimidir bil.
Budur, ac qalmaqdan canım sönmüşdür,
Yemək qüdrətim də heçə dönmüşdür.
Yarın qoqusunu gətirən külək
Mənə həm su olur, həm də ki, çörək.
Hər gecə daşların üzərindəyəm,
Ağ gün görməmişəm bu yerdə bir dəm.
Aclıqdan saralıb lap keçinirkən,
Ağacdan kitirgə qoparıram mən,
Gah da göz tikirəm ota, ələfə,
O da həftədə yox, ayda bir dəfə.
Yeməkdən əlimi üzmüşəm müdam,
Yemək qayğısından tamam azadam.
Boğazdan getməyir yediyim mənim,
Udanda, inciyir bütün bədənim.
Bu arıq canımla keçinirəm ac,
Canımda yeməyə yoxdur ehtiyac...
Lakin, buraxmaram ruzini əldən,
Yeyənlər tapılar, yeməsəm də mən.
Bir nemət yeyəndə aslanla maral,
Onlar çeynədikcə doyuram dərhal".
Səlim anladı ki, o mərd, o qoçaq
Çörəksiz, ot ilə dolanır ancaq.
Gülmədi aşiqin o xörəyinə,
Dəyib toxunmadı onun qəlbinə.
Dedi ki: - Dünyada yemək üzündən
Çox quşlar tələyə düşmüşdür, bilsən.
Nə qədər dən dərdi çəksə bir insan,
Onunçün o qədər dərd verər zaman.
Kim qənaət etsə ota, sənin tək,
O öz aləminin şahıdır, gerçək.

## HEKAYƏ

Bir gün adlı-sanlı şahlardan biri
Gəzib dolaşırdı uzaq bir yeri.
Bir zahid evinə yetmişdi o şah,
Zahid o dünyaya tutmuşdu pənah...
Şah heyrət etdi ki, nə üçün, nədən
Xərabə olmuşdur zahidə məskən?
Şah sual etdi ki: "Deyin mənə bir,
Bu kişi yol üstdə durub neyləyir?
Nə yeyir, nə içir, sənəti nədir?
Kimdir, haralıdır, şöhrəti nədir?
Dedilər: "Bir məşhur zahiddir, ancaq,
Ömr edir yuxudan, eməkdən uzaq
Qatlaşır zillətə, zəhmətə bir-bir
Bütün insanlardan uzaq çəkilir"
Şah, onun halından olcaq xəbərdar,
Zahidin yanına at çapırtdılar
Qapıçı getdi ki, xəbər yetirsin,
Şahın hüzuruna onu gətirsin.
Dedi: "Ey dünyadan əlini üzən
Niçin xoşlanırsan bu xərabədən?
Burda nə yoldaşın, nə yeməyin var
Niçin mağarada tutmusan qərar?"
Ceyran ovlağından dərilib gələn
Bir çəngə quru ot götürüb həmən,
Zahid cavab verdi: "Budur xörəyim,
Bundan qüvvət alır mənim ürəyim".
Qapıçı şah kimi süzdü gözünü:
"Bəlaya salmısan - dedi, - özünü.
Yazıq, bizim şaha xidmət eyləsən,
Bir də ot yeməzsən bu çöllərdə sən".
Zahid cavab verdi: "Sözün əbəsdir,
Bu ot bir gülqənddir, mənə bu bəsdir.
Bu otun sirrini bilsən, ey insan,
Şahın qulluğundan azad olarsan".

Onu dinlədikcə şah, birdən-birə
Qızışıb atından sıçradı yerə.
Döşəndi zahidin önünə xaqan,
Öpdü o müqəddəs ayaqlarından.
"Azadlıq əzizdir, - dedi, - daima,
Budur sözlərində gizlənən məna".
Məcnun bu nağıldan sevinib durdu,
Açıq bir ürəklə şadkam oturdu.
Azacıq dostlara könül verərək,
Hamının halını soruşdu tək-tək.
Aşiqi ağlamaq tutdu o zaman,
Sorub əhval tutdu öz anasından:
"Necədir qanadı qırılmış o quş?
O da mı ayrılıq dustağı olmuş?
Yanında qaradır üzüm əzəldən,
Qara bir quluyam öz anamın mən.
Söylə, o, sağdırmı, necədir bu dəm?
Üzünü görməyi arzu edirəm".
Səlim hiss etdi ki, o qəlbi qırıq,
Ana həsrətilə can verir artıq.
Onun gövhərini boyadı qana,
Evdən anasını gətirdi ona.
Ana öz oğluna boylandı bir az,
Elə bil qəlbini doğradı almaz.
Gördü ki, qızıl gül solub saralmış,
Aynanın üzünü sarı pas almış.
Bir vaxt əlif kimi duran qaməti
Nun kimi bükmüşdür eşqin möhnəti.
Onu görən kimi titrədi həmən,
Dondu əl-ayağı onun qəmindən.
Gah göz yaşlarıyla yudu üzünü,
Gah yolub saçını, döydü özünü.
Sonra sığalladı onun canını,
Öpüb qucaqladı can dərmanını.
Canına əl çəkib, yazıq ağladı,
Oğul yarasını ana bağladı.
Tozlanmış başını yuyub islatdı,

Yorğun ayağından tikan çıxartdı.
Məhəbbət üzündən zavallı ana
Əlindən gələni göstərdi ona.
Dedi ki: "Can bala, bu nədir, de bir?
Oyunsa, oyunun yeri deyildir.
Əcəl qılıncını çəkdiyi anda
Yenə də sərxoşsan sən biyabanda.
Atan şikayətli getdi əlindən,
Məni də ölmüş bil yaxınlarda sən...
Qalx, evinə qayıt, bir anla bunu,
Sahibsiz buraxma gəl öz yurdunu.
Hətta bu gördüyün quşlar, vəhşilər
Çıxır yuvasından axşama qədər.
Elə ki, axşamın üzü görünür,
Hər quş yuvasına üz tutub dönür.
Xalqdan nə vaxtadək gizlənəcəksən?
Çöllərdə yuxusuz ömr edəcəksən?
Uzat ayağını öz evində gəl,
Bir-iki gün sonra gələcək əcəl.
Yetər, çöldə qalıb, dünyanı atmaq,
Qarışqa, ilanla baş-başa yatmaq.
Fərz et ki, canını ilanlar çalmış,
Qarışqa başında yurd-yuva salmış.
Can çınğıl deyildir, bir ayağa dur,
Canına qəsd etmə, gəl sakit otur.
Qəm yeyib, qəlbini çox incitmə bir,
Ürəyin daş deyil, canın da dəmir".
Məcnun anasının nalələrindən
Yandı alov kimi qızışdı birdən.
"Başımın tacıdır ayağın sənin,
Incimi bəsləmiş sənin sədəfin.
Sənin toxumunun məğziyəm, ana,
Ayaq torpağın da cənnətdir mana.
Min möhnət çəkmişəm bu sövdada mən,
Bu dəfə keçmişdir işim çarədən.
Ağlıma nə yol var, nə də çarə var,
Bil ki, mən deyiləm burda günahkar.

İşim bəd gətirdi, yesəm də min qəm,
İnan ki, baisi özüm deyiləm.
Bu bəlalı sövda, bəlalı hicran
Özümdən asılı deyildir, inan.
Ana, olacağın çarəsi varmı?
Peşiman olmaqdan fayda olarmı?
Ah, ana, can atıb deyirəm ki, mən.
Mənim bu can quşum çıxsın qəfəsdən.
Gəl bir də danışma bu məsələni,
Ikinci qəfəsə salarsan məni.
Evə getməyimdən gəl danışma, ah,
Evdə ölməyim də olar bir günah.
De, kimə lazımdır evdə ölməyim?
Xoşdur bu səhrada ömür sürməyim.
Vəhşilər yanında nəğmələr demək,
Evdə qəm yeməkdən xoş olsun gərək.
Fərz et ki, mən kimi zəif bir bədən
Evə qayıtmış da, getmiş yenidən...
Deyirsən xanəni tərk etmək olmaz,
Yox, mənim bu nərdim xanəyə sığmaz.
Evə özün qayıt, sözlərimə bax,
Məni öz dərdimlə gəl rahat burax".
Deyib, kölgə kimi sərildi nalan,
Öpdü anasının ayaqlarından.
Yerə saldığından ana sözünü,
Onun ayağına sürtdü üzünü.
Məcnun vidalaşıb qaldı çöllərdə,
Anası qayıtdı, dözmədi dərdə.
Ömrünü tapşırdı o, ruzigara,
O da üz döndərdi soyuq məzara.
Köçür bu dünyadan nə qədər canlar,
Budurmu dünyadan bizə etibar?
Yoxdur bu dünyanın vəfası inan,
Heç kəsə dost deyil başdan binadan.
Vəfasız ruzigar bilməm nədəndir,
Əkinçilər kimi toxum səpəndir?

Əvvəl səpər yerə can toxumunu,
Əkin yetişdimi, tez biçər onu.
Hər gecə yandırar yeni bir çırağ,
Çəkər sinəsinə tüstüdən bir dağ.
Sonra da yel üflər ona hər səhər,
Özü yaqdığını özü söndürər.
Qəlbə dağlar çəkən tilsimli fələk
Bizlə çıraq kimi oynayır, gerçək.
Fələk düyünləsə hər bir ayağı,
Hayana getsə də açılmaz bağı.
Dörd atdan piyada qalsan sən, əgər,
Bu düyün o zaman açıla bilər[109].
Ol canın sapı tək düyünsüz, amma,
Qızdırma sapı tək düyünlü olma.
"Ud" düyün vurmaqda məşhur olsa da,
Sən düyün açmaqda müşk ol dünyada.

## ANASININ ÖLÜMÜNDƏN MƏCNUNUN XƏBƏR TUTMASI

Çərxin şəhsüvarı atlandı birdən,
Meydanı zəbt etdi həriflərindən.
Günəş ki, dünyadan bir qorxu duydu,
Şərab şüşəsini tağ üstə qoydu.
Sübhün üsyanından göylər söküldü.
Şüşə parçalandı şərab töküldü.
Məcnun dil verərək qəsidəsinə,
Yalnızlıq təblini çalırdı yenə.
Gecəli-gündüzlü nə vaxtdan bəri,
Dilindən düşməzdi qəsidələri.
Xəbəri yoxdu ki, anası yazıq,
Dünyadan yığışıb köçmüşdür artıq.
Səlimin qəlbindən ahlar yüksəldi,
O, qəmgin aşiqin yanına gəldi.
Paltar, yemək verdi çox ehtiyatla,
Sonra da dil açdı ona fəryadla:
"O bəlalər görmüş zavallı qarı

Ölüb tərk elədi bu ruzigarı.
O da öz köçünü sürdü dünyadan,
Öldü atan kimi səndən nigaran".
Məcnun bu matəmi eşidib durdu,
Ah çəkib, of deyib, başına vurdu.
Səhər çəngi kimi inlədi səsi,
Qırıldı daşlarda könül şüşəsi.
Ata-anasını anaraq yenə,
Üz tutdu onların qoşa qəbrinə.
Fəryadlar qoparıb diz üstə çökdü,
Hər iki məzara göz yaşı tökdü.
Gah buna, gah ona üz sürtdü, ancaq,
Ölmüşə dərmandan kar olmayacaq.
Qohumlar tutunca səsindən xəbər,
Qaçıb qəbilədən bir-bir gəldilər.
Məcnunu torpağa düşmüş gördülər,
Canında az idi həyatdan əsər.
Onun ayağına yığılıb həmən,
Qanlı yaş tökdülər onlar gözündən.
Ayılsın, deyərək, Məcnun bir təhər,
Ona gülab suyu çilərdi gözlər.
O hissiz aşiqsə ayılan zaman
Dualar etdilər ona hər yandan.
Evə aparmağa çox çalışdılar,
Dedilər, vətəndə tutsun o qərar.
Lakin, bir ah çəkdi o bəxti qara,
Yenə öz köçünü sürdü dağlara.
Ürəyi - dərd evi, ciyərləri - qan,
Çöllərdə gəzirdi yenə pərişan.
Ardınca düşmüşdü vəhşi heyvanlar,
Həmdəm olmamışdı ona insanlar.
Şərrində bir xeyir görmədiyindən,
Öz canamazını atdı kilsədən...
Ömür yol gedirdi, sanki bir şimşək,
Məcnun əl üzürdü ondan bulut tək.
Madam ki bu həyat baqi deyildir,
Min il də, bir an da yaşasan birdir.

Həyatda ölümün nişanəsi var,
Onun işvəsinə insanmı uyar?
Ey ölüm sirrindən qafil dolanan,
Ey bu həqiqətdən xəbərsiz insan,
Ölüm səfərinə yığışmadan sən
Çoxmu öz ömrünə güvənəcəksən?
Məgər dərk etməyir zəif düşüncən
Ki, sən bu dünyada nəçisən, nəsən?
Bu yer kütləsində zərrələr ki, var,
Müəyyən ölçüyə sahibdir onlar.
Ancaq, Qaf gövdəli dağ önündə, bil,
Onların qiyməti əlif də deyil.
Bu geniş tarlada, ey məğrur insan,
Sən kiçik bir budaq, yarpaq boydasan.
Başıyın üstəki fələyə bax sən,
Gör nə görünürsən ona nisbətən.
Bu geniş aləmə açsan gözünü,
Heç kimi görərsən burda özünü.
Sənin düşüncəndə bir həqiqət var,
Müəyyən ölçüdə tutmusan qərar.
Lakin bu dünyanın qarşısında, bil,
Sənin en-uzunun zərrə də deyil.
Alçaqlıq həddini aşdığın yerdə
Dünyada "mən varam" deməzsən bir də.
Torpağın qoynuna gəl sığın ancaq,
Qoy örtsün eybini o qara torpaq.
Iki-üç pas atmış mıxın var, bir bax,
Onu da zəkatla yığmısan ancaq.
Bir neçə qızıla güvənib dəm-dəm,
Deyirsən: "Dünyanın ağası mənəm".
Nə qədər möhtacsan dünya əhlinə,
Işin ahüvayla keçəcək yenə.
Ucalar dünyada başın, ey insan,
Qurtarsan dünyanın ehtiyacından!
Hələ də dünyada xalq minnətindən
Yaxanı qurtara bilməmisən sən.
Gəl, yad süfrəsindən it kimi əl çək,

Özgə süfrəsinə baxma pişik tək.
Məşəl tək əliyin müzdüylə dolan,
Şam kimi, sən də öz xəzinənlə yan.
Sən də Nizami tək aləmə tanın,
Sən də ağası ol şahın, sultanın.

## LEYLİNİN MƏCNUNA SİFARİŞİ

Leyli qəfəsdəki o gözəl deyil,
Tikilən qələlər xanımıdır, bil.
Məcnundan gəldikcə acı xəbərlər,
Yeyirdi qəlbini min qəm, min kədər.
O da aşiqi tək olmuşdu diltəng,
Məhbəsdə qalmışdı can çəkişərək.
Düyünlü bir sapın halqasında qız
Zəncirsiz dustağa düşmüşdü yalqız.
Onun dörd yanında gözətçi vardı,
Dürrün ətəyini almaz qırardı.
Taki o bir gecə qaçmasın yenə
Bütpərəst əhlinin büt məbədinə.
Əri canfişanlıq edib Leyliyə,
Xoş üz göstərərdi, şad olsun deyə.
Leylinin qəlbisə tutqun, pərişan,
Soyuq qarşılardı onu hər zaman.
Süfrədə yox idi milçəkdən bir iz,
Gecə qərarmışdı, ev gözətçisiz.
Leyli aşiqini anıb ürəkdən,
Qapıdan eşiyə sıçradı birdən.
Düşmənlər yolundan bir ağac kənar
Bir yol üzərində oturdu ağlar.
Istərdi bu yoldan keçən bir nəfər
Ona aşiqindən versin bir xəbər.
Bu dəmdə dərdlərə çarə göstərən
Bir ağ saçlı qoca göründü birdən.
Qoca Xızır kimi iti gedərdi,
Yol axtaranlara yol göstərərdi,

Soruşdu qocadan o dustaq nigar:
"Fələyin işindən nə xəbərin var?
O vəhşət çölündə vəhşiyə həmdəm
Kimin xəyaliylə yaşayır bu dəm?"
Qoca söylədi ki: "Ayüzlüm, inan,
Sənsiz quyudadır Yusif hər zaman.
O tufanlı dəniz qoparmış haray,
Uca zirvəsini itirmiş o ay.
Car çəkir hicrana düşəndən bəri,
Səhralar qoynunda keçir günləri.
Hər iki addımda: "Leyli can" deyir,
Hər yerdə: "Leyli gəl, gəl aman" deyir.
Ürəyi hicranla sitəmlə dolu,
Bir Leyli yoludur Məcnunun yolu..."
Leyli dinlədikcə bu sədaqəti,
Nalədən nal oldu sərv qaməti.
Qoşa nərgizləri ağladı birdən,
Əqiqlə sulandı o ağ yasəmən.
Leyli söylədi ki: "Günahkar mənəm,
Bil, mənim qəmimdir o çəkdiyi qəm.
Mən də bu qüssədən deyiləm kənar,
Ancaq, dərd çəkməkdə bir fərqimiz var:
Məcnun dağ başında ah çəkir bu dəm,
Mən quyu dibində nalə çəkirəm".
Sonra, qulağından bir neçə gövhər
Alaraq, qocaya verdi o dilbər.
Dedi: "Bunları al, qayıt təzədən
Onunla yenə də həmnəfəs ol sən.
Onu uzaq yoldan yanıma gətir,
Doyunca seyr edim o aşiqi bir.
Sən onu götürüb gəldiyin zaman
Filan nişanəli yerdə saxlarsan.
Sonra da gəl mənə xəbər ver bunu,
Gizlincə seyr edəm, bəlkə, Məcnunu.
Görüm nə soyu var, nə rəngi vardır?
Görüm ki, nə qədər o vəfadardır?
Bəlkə də, söz qoşub dediklərindən

İki-üç beytinə qulaq asam mən.
Bəlkə, düyünümü aça nəfəsi,
Bəlkə, şəfa verə dərdimə səsi".
Qoca, dürrləri götürüb həmən,
Ayrıldı saf qalmış haman dürrdən.
Bir dəst paltar alıb yoluna vardı,
O çılpaq qalmışa libas apardı.
Əsdi külək kimi o dağdan-dağa,
Baxdı abadlığa, xarabalığa.
Yenə də tapmadı aşiqdən əsər,
Ondan iki-üç gün tutmadı xəbər.
Sonra, dağ dibində taparaq onu,
Torpağa yıxılmış gördü Məcnunu.
Onun dövrəsində vəhşi heyvanlar,
Dayanıb olmuşdu bir xəzinədar.
Qocanı gördükdə Məcnun uzaqdan,
Südə uşaq kimi meyl etdi bu an.
Sonra, acıqlandı yırtıcılara,
Baş uzatmasınlar ona bir daha.
Yanından gedincə o yırtıcılar,
Təşəkkür elədi ona ixtiyar.
Əvvəl öz başını torpağa vurdu,
Sonra üzr istəyib, belə buyurdu:
"Səninlə olmuşdur eşq mülkü qaim,
Nə qədər eşq var, sən də ol daim.
Günəş çeşməsindən Xızır kimi iç,
Isgəndər kimi də üfüqləri keç.
O Leyli - o dünya gözəli dilbər
Sənin dostluğunda candan da keçər.
Bil, salam göndərir sənə o nigar,
Adını duayla anıb xatırlar.
Çoxdandır görməmiş sənin üzünü,
Bir də eşitməmiş şirin sözünü.
Səndən nigarandır gülüzlü sənəm,
Görüşmək istəyir səninlə bir dəm.
Sən də sevgilinlə görüşsən bir an,
Hicran qəfəsindən azad olarsan.

Bir-iki nəşəli qəzəl deyərsən,
O sövda bazarı qızar yenidən.
Meşə tək dolaşıq bir xurmalıq var,
Ordaki xoş rəngli gözəl ağaclar
Göyün zirvəsinə qalxıb baş vurur,
Onların altında göy çəmən durur,
Baharın o yerə dönüb gələcək,
Işiyin açarı ordadır, gerçək".
Sonra da paltarı o qoca əllər
And verib geydirdi ona bir təhər.
Razılıq kəməri bağlayıb həmən.
Məcnun xilas oldu müxalifətdən.
Qocanın izilə tərpəndi artıq,
Dirilik suyunu tapmışdı yazıq.
Fəratdan qaçarmı susuz bir ürək?
Davaya çıxarmı ətirlə külək?
Vəhşi heyvanlar da cərgələnərək,
Düşdü arxasınca şah ordusu tək.
Iqbal itaətdə, bəxt də fərmanda,
Görüşmək yerinə gəldi o anda.
Bir xurma altında o tutdu qərar,
Dayandı vəhşilər azacıq kənar.
Qoca da Leyliyə gətirdi xəbər,
Gördüyü işləri dedi müxtəsər.
Çadırda əyləşmiş o gözəl pəri
Açdı mələk kimi uçuş şəhpəri.
Məcnundan on addım durub aralı,
Yeriyə bilmədi o dağ maralı.
Qocaya dedi ki, "Ey nəcib insan,
Getməyə qalmadı qüvvətim, inan.
Mən ki, yandırmışam ürəyimdə şam,
Yenə yaxınlaşsam, tamam yanaram.
Mənim ərim vardır, yatsa da bu dəm,
Allahın gözündən uzaq deyiləm.
Doğrudur, sevmirəm onu ürəkdən,
Lakin haramzadə deyiləm ki, mən.
Yenə yaxınlaşsam, bu ölüm olar,

Sövda məzhəbində günah sayılar.
Ayıblı sözlərin yazılmasından
Yaxşıdır, bir dəftər ağ qalsa, inan.
Idrakla üz-üzə gələrsəm əgər,
Məni qızartmasın tutduğum işlər.
Kamal bir aşiqdir, ilqarı tamdır,
Bundan çox istəmək ona haramdır.
Qoy şerlə desin o şirindillim,
Şerlə oxşasın məni sevgilim.
O şəkərdillidən rica ediniz:
Bir qəzəl söyləsin, qulaq asaq biz".
Qoca bu baharın yanından qalxdı,
O biri baharın halına baxdı.
Gördü ki, sərilmiş o yenə yerə,
Huş başdan dağılıb, uçmuş göylərə.
Ürəkdən ah çəkib "Heyf olsun" dedi,
Ona göz yaşından su da çilədi.
Məcnun huşa gəlib ayılan zaman
Bir az xoşlanaraq sordu qocadan:
"Söylə, bir ey qoca, nə bahardır bu?
Saçdı üstümüzə ənbər qoqusu.
Bu qoqu novbahar qoqusu deyil,
Canan saçlarının qoqusudur, bil.
Qəlbə layla çalır bu qoqu, inan,
Bu gözəl qoquya canım da qurban!"
Qoca bir imtahan açmaq istədi:
"Kənardan boylanmaq günahdır, - dedi. -
Söylə, çağırılmamış gələrmi o yar?
Gəlib qucağına girərmi nigar?
Cananı görməmiş bu haldasan sən,
Nə hala düşərsən üzünü görsən?"
Məcnun cavab verdi: "Mehriban qoca,
Gəl bu hadisəni düşünmə bunca.
Şərabın ətrindən sərxoşam bu dəm,
Şərabı əlimdə tuta bilmərəm".
Sonrasa bir şirin, bir xoş nəfəslə
Bir neçə beyt dedi qəmli bir səslə.

## MƏCNUNUN QƏZƏL OXUMAĞI

"Canan, hardayıq biz, de hardasan sən?
Biz ki, səninkiyik, sən kiminkisən?
Yoxsulluq mülkünün yolçusuyuq biz,
Buyurun, dost olaq, layıq görsəniz.
Bizik can sataraq yoxsulluq alan,
Xəzləri dağıdıb palasda qalan.
Zamanın qeydindən azadıq, azad,
Qəm bizimlə şaddır, biz qəm ilə şad.
Ciyərimiz susuz, suya qərq olan
Şəbkoruq, günəşə yoldaşıq, inan.
Azdıq yolumuzu, qismətdir bu da,
Kənddən qovulsaq da, bizik kəndxuda.
Möhrəsiz və gözsüz oyun çıxardar,
Ayaqsız, miniksiz çapmağımız var[110].
Bir sənin qəminlə yüklənirik biz,
Qəm ki, səninkidir, yoxdur qəmimiz.
Olsaq da aləmdə süst tərpənənlər,
Buradan keçməkdə bizdədir hünər.
Deyirsən, qəmindən xar olub ölüm,
Hələ qəm yeməklə məşğulam, gülüm!
Çox çəkməz, sevgilim, vaxtı gələndə,
Öz köçmək təblimi çalaram mən də.
Sən, ey hər işində əyyar olan yar,
Aşiqin olmuşdur səndən də əyyar.
Əyyar boğazını sıxırsa əgər,
Özünü düşməndən əvvəl öldürər,
Bir kəs ki, özünün qanından qorxmaz,
Öldürər nə yaxşı, nə pisə baxmaz.
Sürüdən qorxarsa əgər canavar,
O üstündə keçə, palas da saxlar.
Gəlməmiş getməyin, de, nə adətdir?
Əkməmiş biçməyin nə qiyamətdir?
Mənə: "Gecən xeyir" söyləmə, canan,
Sənsiz xoş keçərmi gecəmiz bir an?

Uyuşmaz qədəmin canımla mənim,
Iki can saxlaya bilməz bədənim.
Əlinlə canımı almadıqca sən,
Qurtara bilməzsən bu bəhanədən.
Min minnət yükünü çəkir bu bədən,
Sənsə azad eylə onu bu işdən.
Bundan daha yaxşı bir can ver mana,
Uğurlu bir işə ayaq bassana!
Sənin dodağından gəlməyən bir can
Canımda yerləşməz, çıxar dodaqdan.
Dodağın olarsa can xəzinəsi,
Kəsilməz dünyadan o canın səsi.
Bilirəm, qarşında çox qulların var,
Heç biri mən kimi baş əyməz, ey yar.
Sənin varlığınla mən də azadam,
Daima xoşbəxtəm, daima şadam.
Camalın düşərsə könlümdən uzaq,
Könlüm viran olar gözündən iraq.
Bu gündən mən sənəm, sən isə mənsən,
Bir könül yurdudur bu iki bədən.
O da sənin könlün qoy olsun, dilbər,
Yoxdur öz könlümdə həyatdan əsər.
Bir könlüm, yüz canım olmasa əgər,
Səninlə yaşamaq olmaz, ey səhər.
Sap birdir, səni öz sapıma düzsəm,
Bir can olmalıyıq ikimiz hər dəm.
Bil ki, vahid olsa bizim sikkəmiz,
Ikilik nəqşini qaralarıq biz.
Gözəl sikkəli hər badamın bil ki,
Bədəni bir olur, məğzisə iki.
Mən sənəm, başqa şey nə varsa, canan,
Bir başmaq tayıdır düşmüş ayaqdan.
Səndən işıq alır bütün varlığım,
Yoxdur səndən özgə bəxtiyarlığım.
Söylə, bu məqamda nəçidir bədən?
Adını sikkənə nəqş eyləyəsən.
Sənə qurbanlığa baş layıq deyil,

Bayrağın altına sığınmaz o, bil.
Arada tərpənən quru bir candır,
O da mənim deyil, sənə mehmandır.
Sən məndən azadsan, ey pərizadə,
Sərvdən daha çox ol sən azadə.
Mən bir kimsəsizəm, hər xidmətinə
Kəmər bağlamışam gül kimi yenə
Məhləyin küləyi əsdikcə səhər,
Can verib, könlümün pasını silər.
Mumya arasında əzgin bir bədən
Dincəldiyi kimi, dincəlirəm mən.
Itüzlü olsa da gözətçin müdam,
Sən olan küçənin yol torpağıyam.
It saxlamağını çox bəyənirəm,
Odur ki, onlara olmuşam həmdəm;
Yəni yanımdakı bu yırtıcılar
Itdir, hamısının it dırnağı var.
Mən yoxsul olsam da, varlısan, ey yar,
Mən tamam xaliyəm, sənin xalın var.
Sən qızıl içində olursan hər dəm,
Xalxalın qızıldır, xalın da dirəm.
Dirəmə bənzəyən xalını görcək,
Aldım xalxalını dirəmlə, gerçək.
Bir növbahar üçün bulut ağladı,
Məcnun da ağlayıb qara bağladı.
Hindli qaraulda dayanıb, gəzər,
Məcnun da yanında hinduya bənzər.
Çərx gözəllik alar ayın üzündən,
Məcnun da fal açar üzünlə bəzən
Bülbül gül eşqiylə dolanar bağı,
Məcnun da olmuşdur hicran dustağı.
El, oba ləl üçün mədənə gedir,
Məcnun da səninçin cana qəsd edir.
Sən meyil göstərsən mənə, ey nigar,
Bir allah bilir ki, bu çox xoş olar.
Aydınlıq gecədə səninlə qoşa
Duraydıq gülşəndə, verib baş-başa.

Səninlə yanaşı əyləşəydim mən,
Qədəh qaldıraydıq qədəh üstündən
Basaydım bağrıma saz kimi səni,
Olaydı qucağım ləlin mədəni.
Nərgiz gözlərindən olaydım xumar.
Məst olub saçını hörəydim, ey yar.
Kaman qaşlarını qulağa qədər
Əlimlə çəkəydim, ey nazlı dilbər.
Döşündəki nara sığınaydım mən,
Əlimlə tutaydım alma çənəndən.
Gah bir alma kimi əzib narını,
Gah da dişləyəydim alma barını.
Dağıdıb döşünə saçlarını mən
O qulaq sırğanı çəkəydim, bəzən.
Gah varaqlanaydı əynində paltar,
Bədihə deyəydim xurmana, ey yar.
Bənəfşə düzəydim gül üzünə mən,
Gah da gül dərəydim o bənəfşədən.
Gah səni qoynumda yerləşdirəydim,
Gah qəm məktubunu sənə verəydim.
Ilahi, qalmazdı möhnətdən əsər,
Həqiqət olsaydı bu düşüncələr.
Qulağa xoş gəlir çaldığım hava,
Lakin ortalıqda tel qırılmasa.
Başımı qovğaya salma bu qədər,
Inan ki, varlığım məhv olub gedər.
Sən olduğun yerə çağırma məni,
Xoşdur bu seçdiyim sövda məskəni.
Burda nə düşmən var, nə də əğyar var,
Bizim işimizə qarışmaz onlar.
Burda əyləşsək də, qalsaq da əgər,
Bizə irad tutmaz bunu bir nəfər.
Yanımda iki-üç dilsiz heyvan var,
Yaxşını, yamanı unutmuş onlar.
Quyunun dibində tək olsaq da biz,
Yalnızlıq özü də gözəldir, şəksiz.
Əlindən tutanın olmasa bir az,

Ayağından tutub çəkən də olmaz.
Burda olmasa da bir dostun sənin,
Arxanca sallanıb gəlməz düşmənin.
Nə var can qorxusu olan o yerdə?
O yaman üzlərə sən baxma bir də.
Burdadır abadlıq, şadlıq hasarı.
Sən də gəl bu yerdə bir şadlan barı.
Nə qədər ki, sağam, yaxın gəl, ey yar,
Hər vaxtın işi var, işin vaxtı var.
Çeşməni gün kimi göstərmə, aman,
Sərab tək aldatma məni uzaqdan.
Hüsnündən su içmək istərkən ürək,
Oldum parça-parça sənin xalın tək.
Xızırın çeşməsi səndədir, dilbər,
O həyat suyundan mənə də göndər.
Təsəlli vermədən arpa boyda sən,
Mənə xalvar-xalvar qan içdirirsən.
Sənsiz qəm yesəm də, ey nazlı sənəm,
Səninlə şərab da içə bilərəm.
Yəqin, yadındadır, bir məsəl də var:
Dovşan yügürdüyü qədər də yatar.
Nə olar, sevgilim, şərab gətirsən.
Yenə mi qanlı su içməliyəm mən?
Şərab məclisində nuş olur cana,
Halaldır behiştdə şərab insana.
Saqi, dəryanı da əlindən içsəm
Ondan bir udum da qoymaram bu dəm.
Içsəm sağlığına, getmərəm huşdan,
O zəhər olsa da, nuş olar, inan.
Qoy sərxoşun olsun aşiqin indi,
Sən də qədəh qaldır sərxoşlar kimi.
Şərabı içməzlər xumar olmadan,
Səhər şərabı da içilməz pünhan.
Bağ tacı axtaran o sultan belə,
Gəzir xəzinəni şəbçiraq ilə.
Qaranlıq gecədə xəzinə gəzən
Əziyyət çəksə də, oğrudur, bilsək.

Çıraqsız bir evi soruşsan: nədir?
O bir bağ da olsa həbsxanədir.
Sənin qəm nərdində uduzdu könlüm
Bir əl də atıram, qurbanın olum.
Xoşdur, sərxoş olub, ey nazlı dilbər,
Qıvrım saçlarını öpsəydim əgər
Ya sərxoş halımda tutub telindən
Yavaşca məclisə gətirəydim mən
Bir nalə çəkəydim hər addım başı,
Bir təpik vuraydı mənə hər naşı
Yarəb, o dünyanı yaxan gözəllə
Mənə belə bir gün sən qismət eylə!"
Məcnun bu sözləri deyərək əlan,
Çöllərə üz qoydu ürəyində qan
Pərişan ürəyi qəmlərlə dolu
Qayıtdı çadıra o sərv boylu

## BAĞDADLI SƏLAMIN MƏCNUNUN QÖRÜŞÜNƏ GETMƏSİ

Deyir söz ustası, onu dinlə sən:
Bağdad şəhərinin əhalisindən
Vardı səxavətli, gözəl bir insan,
Camal sahibiydi o aşiq oğlan.
Bəlalər seylinə düşüb dünyada,
Eşqin silləsini dadmışdı o da.
Başından aşsa da məhəbbət dərdi,
Hər dərdə qatlaşıb qəmə dözərdi.
Dünya söyləyirdi adına Səlam,
Bəxt isə vermişdi o gəncə səlam.
O, eşq aləmində mərd dayanardı,
Şer oxumağa çox eşqi vardı.
Qeysin inci saçan o şerləri
Aləmə yayılıb düşəndən bəri
"Dərd əhli" deyirdi ona insanlar,
Onun pak təbinə heyran olanlar.

Dərdlilər eşitcək onun səsini,
Sürərdi yanına öz dəvəsini.
Ad qoydu Məcnunun eşqi dünyada,
Şəhərlər dolaşıb çatdı Bağdada.
Onun hər şerini gözəllər belə,
Deyirdi səs-səsə aşiqlər ilə.
Səlam düşündü ki, Bağdaddan getsin,
O qəmgin aşiqi ziyarət etsin.
Dəvəni yükləyib yola düzəldi,
Çaparaq bir ucsuz səhraya gəldi.
Qovdu dəvəsini bir neçə ağac,
Axtardı aşiqi o yamac-yamac.
Səlam yol uzunu soraq alaraq,
Məcnunu bir yerdə tapdı çıl-çılpaq.
Yenə dörd yanında vəhşi durmuşdu,
Boyunbağı kimi halqa vurmuşdu,
Şövq ilə inləyən o zəifbədən
Əsirlik duyurdu haman həlqədən.
Məcnun hiss etdi ki, o gözəl cavan
Yanına gəlmişdir uzaq bir yoldan,
Verdi vəhşilərə belə bir qərar:
Bütün qılıncları qına qoysunlar.
Səlam da aşiqi gördüyü zaman
Ona səlam verdi ürəkdən, candan.
Xoş gəldi səlamı onun Məcnuna,
Ürəkdən yaxınlıq göstərdi ona.
Onu cavabıyla xoşhal eylədi,
Hardan gəldiyini sual eylədi.
Gənc dedi: "Səninçin dolaşıram mən,
Çölə düşməyimin səbəbi sənsən.
Bağdad şəhərindən bura gəlmişəm,
Ta görüb üzünü şadlanım bir dəm.
Bağdadda rahətcə yaşardım, düzü,
Heç vaxt görməmişdim mən səfər üzü.
Gözəl sözlərinə çox həvəsim var,
Onunçün qürbəti etdim ixtiyar.
Dünya işıq alır camalından, ah,

Səni görməyimə yol verdi allah.
Bu qalan ömrümü, ey qərib həmdəm,
Səndən başqasıyla sürməyəcəyəm.
Ayaq torpağını öpə-öpə mən
Boyun qaçırmaram heç bir əmrindən.
Sənsiz çıxmayacaq mənim nəfəsim,
Yanından gələcək daima səsim.
Yazdığın hər şeri oxuyub müdam,
Əzbərdən öyrənib yadda saxlaram.
Gözəl sözlərini dedikcə əzbər,
Könlümün qəmləri dağılıb gedər.
Mən də çəkinmərəm heç bir bəladən,
Məni öz könlünlə tanış eylə sən,
Oxu sözlərindən, dinləyim hərdən,
Hesab et məni də bu vəhşilərdən.
Mən kimi bir gəncin qul olmağından
Sənə heç bir zərər toxunmaz, inan.
Sövda qəfəsində dustaq bir quşam,
Eşqin ağrısını mən də duymuşam".
Gülüb hilal kimi onun üzünə,
Məcnun cavab verdi onun sözünə:
"Ey nazla, nemətlə bəslənmiş insan,
Bu yol qorxuludur, qayıt bu yoldan.
Kişi olsan belə, tayım deyilsən,
Yüzdə bir qəmimi yeməmisən sən.
Yalnız vəhşilərdir könlümə həmdəm,
Mən öz qeydimə də qalan deyiləm.
Bəsdir bu səhrada düşdüyüm dara,
Yaramın üstündən gəl vurma yara.
Bil ki, bambaşqadır bizim dərdimiz,
Uyuşa bilmərik səninlə hərgiz.
Sənə söhbətimin nə faydası var?
Mənim söhbətimdən divlər də qaçar.
Hər gün bir mənzildə yatıb qalıram,
Hər gecə bir yerdə mən yurd salıram.
Mən artıq vəhşiyəm, sən isə insan,
Xoşdur öz cinsini gəzib tapasan.

Bil ki, dəmir kimi olsan da möhkəm,
Səni də əridər ahımdakı qəm.
Su kimi canımı oxşasan da sən,
Yanğıma bir gecə dözə bilməzsən.
Görürsən əliboş müflisəm bu dəm,
Qonaq qalmağını rəva görmürəm.
Yazıqlıq səsidir cahanda səsim,
Bir mənəm, bir də ki, sövda nəfəsim.
Olmazsan mənimlə bu yerdə həmdəm,
Sən sevdiyin cana mən qəsd edirəm.
Öz paltar bəndimi boşaltdıqca mən,
Sən öz kəmərini düzəltməkdəsən.
Şələmi çiynimdən atıram bu an,
Sənsə başqasıyla qucaqlaşırsan.
Mənə dost olmaqdan ümidini kəs,
Mən büt sındıranam, sənsə bütpərəst.
Get, mənim məskənim xarabalıqdır,
Məndən dost nəfəsi ummaq artıqdır.
Bilirəm, yol gəlib zəhmət çəkmisən.
Sənin qulun olum, zillət çəkmisən.
Indi ki, sən məni gördün pərişan,
Allaha tapşırıb qayıt bu başdan.
Xoşluqla getməsən bu yerdən əgər,
Zorla qaçırdacaq səni zillətlər".
O sözlər etmədi Səlama əsər,
Qəbula keçmədi o nəsihətlər.
Dedi: "Yalvarıram, halıma bir yan,
Gəl suyu gizlətmə susuz qalandan.
Izin ver, qiblənə baş əyim bir az,
Məhəbbət adlansın qıldığım namaz.
Yolum səhv olarsa səcdədə bir dəm,
Yenə səcdə qılıb üzür istərəm".
Səlam çox yalvarıb yaxardı yenə,
Məcnun razılaşdı onun əhdinə.
Səlam süfrəsini açıb tökərək,
Çıxardı qarşıya halvayla çörək.
Dedi ki: "Dostluğa göstərək həvəs,

Gəl mehriban olaq çörəyimi kəs.
Qəlb açan olsa da bu yeməməyin,
Bu bir-iki löqmə lazımdır yəqin.
Hərçəndi kişinin kişiliyi var,
Canının qüvvəti yeməklə olar".
Məcnun cavab verdi: "Öz bədənimdən
Yemək yeyənləri öldürmüşəm mən.
Kim ki, öz canının qeydinə qalır,
Çörəklə halvadan o, qüvvət alır.
Mən öz varlığımdan düşmüşəm uzaq,
Məni öldürəmməz bu ac yaşamaq".
Səlam anladı ki, o talei kəm
Yeməksiz, yuxusuz dolaşıb hər dəm,
Hər yana üz tutub gəzir fərari,
Bir yerdə durmayır səbri, qərari.
Qəlbi inciməsin, sınmasın deyə,
Dedi: "Sür ömrünü qəm yeyə-yeyə.
Fələyin dövranı bir yerdə qalmaz,
Ürəyin daima pərişan olmaz.
Hər anda bir varaq açıb bükərək.
Çox iti fırlanır bu çərxi-fələk.
Cahanda göz yumub açana qədər
Yuz nəcat qapısı açıla bilər.
Heç də qəmgin olma çəkdiyin qəmdən,
Taki yer tapdağı olmayasan sən.
Indiki dərdinin sonu xoş olar,
Bir gün ağlamağın gülməyi də var.
Mən də sənin kimi ürəyim dağlı.
Könüldən xəstəydim, ayaqdan bağlı,
Allahın köməyi sayəsində mən
Qurtardım canımı o dərddən, qəmdən.
Nəhayət bir sükut qaplayar səni,
Sən də unudarsan bu vaqiəni.
Bu sövda şöləsi nə mehribandır,
Gənclik atəşinin alovundandır.
Kişidən cavanlıq gəlib keçəcək,
Bu odlu kürənin odu sönəcək".

Məcnun o aqili dinləyib qəlbən,
Yerdən durmadısa, oynadı yerdən.
Dedi: "Zənn etmə ki, mən bir sərxoşam,
Ya hava-həvəsə məftun olmuşam.
Eşqin şahənşahı mənəm cahanda,
Xəcalət çəkmirəm bundan bir an da.
Qüsl ilə canımı təmizlədim mən,
Torpağın, şəhvətin bəhanəsindən.
Nəfsin çirkabından can qurtararaq,
Həvəs bazarını dağıtmışam, bax.
Ömrümün mənası eşqdir müdam,
Məhəbbət bir oddur, mənsə bir "ud"am.
Məhəbbət evimi tutduğu zaman
Mən də öz köçümü çəkdim ortadan.
Ömrümü hesaba alanmı vardır!
Mən yoxam, var olan yalnız o yardır.
Nə vaxt ki, göylərdən ulduz azalar,
Mənim də eşqimin qəmi az olar.
Çöllərin qumları sayılsa əgər,
Mənim də könlümün eşqi silinər.
Indi ki, həmsöhbət oldun mənimlə,
Gəl, ayıb sözünü gətirmə dilə.
Boyuna, halına nəzər sal da sən,
Gəl əl çək vurduğun bu tənələrdən.
Çəkdi o sərkərdə yaxşı bir məsəl;
Saxla öz işinin ölçüsünü gəl.
Bil ki, qızışaram soyuqluq etsən,
Yalnız qisas alıb yumşalaram mən.
Sən məni dilinlə incitsən əgər
Getməz dostluğumuz axıra qədər.
Könül qəzəbindən qızışan zaman
Həya da, ismət də qalxar ortadan".
Məcnun, bu sözləri ədəblə dedi.
Hərifə astaca tənbeh eylədi.
Hərif də Məcnunu tanıdı əlan
Xəta çıxarmadı bir də ağzından.
Heç kəslə qaydasız danışma ki, sən,

Axırda utanıb üzr istəyəsən.
Kamanın boşsa da, bərksə də əgər,
Ehtiyatsız çəksən bəla gətirər.
Boş olsa məlamət gətirər kaman,
Bərk olsa xəcalət gətirər kaman.
Bağlı bir qıfılı açmaq istəsən,
Əvvəlcə sınaqdan keçir onu sən.
Harda quyu varsa, ipsiz iş olmaz,
Ayaqsız bir yol da başa vurulmaz.
Məcnun ilə Səlam bağlayıb ilqar,
Bir neçə günlüyə yoldaş oldular,
Şirin qəzəllərin axırdı səsi -
Məcnunun qonağa buydu töhfəsi.
Məcnun şerləri dedikcə bənd-bənd,
Onları döşünə yığırdı o mərd.
Çox zəif düşmüşdü Məcnun bu zaman,
Büsbütün qalmışdı yeyib yatmaqdan.
Səlamsa bunlara heç dözməyirdi,
Yeməkdən yatmaqdan əl üzməyirdi.
Elə ki, buxçası boşaldı, yenə
Qayıtmaq istədi o öz evinə.
Axır vidalaşıb atdı Məcnunu,
Vəhşilər içində tək qoydu onu.
Bağdada üz tutub yola düzəldi,
Yadında bir neçə qəsidə gəldi.
Harda bir qəsidə çıxsa ağzından,
Bütün dinləyənlər olurdu heyran.

## MƏCNUNUN ƏZƏMƏTİ HAQQINDA

Məcnunu sərsəri zənn etmə ki, sən.
Deyildi gördüyün divanələrdən.
Oruclu, namazlı, nurlu bir çıraq,
Əqlə yad deyildi, ədəbdən uzaq,
Vaxtının ən böyük bir alimiydi,
Aləmi şərh edən Loqman kimiydi.

Gizli mənalara o yol açardı,
Qəlbində göylərin min sirri vardı.
Qızıl sikkəsi tək hər sözü gözəl,
Lələ bənzəyərdi dediyi qəzəl.
Dəlinin ağlına bələddir hər kəs,
Ondan bu incilər saçıla bilməz.
Dünyanın qeydini tamam ataraq,
Qeydsiz bir həyat sürürdü ancaq.
Onda ölüm fikri aşıb daşırdı,
Köç tədarükünə hazırlaşırdı.
Deyirdi: "Can evim alışır dərddən,
Ölüm qurtaracaq məni möhnətdən".
Kim ki, düz gəlməsə dünyayla, inan,
Çətin can qurtarar bu dar dünyadan.
Dünyanı dörd əllə tutsa bir nəfər,
Çətinliklə köçüb dünyadan gedər.
Məcnun yol yoldaşı gəzmədən bir an,
Açırdı zənciri öz varlığından.
Taki can ovuna çıxsa yaradan,
"Gətir" dediyi vaxt, desin: "Budur can".
Ömür gəmisində can qorxusu var,
Bu qorxu ucundan geyməzdi paltar.
Xörəyi olmuşdu acı tikələr,
Yeməzdi dünyada o heç bir bəhər.
Dünyadan əl üzüb, düşmüşdü uzaq,
Leyli bəhanəydi bu yolda ancaq.
Nə vaxt ki, arzusu bir yol vurardı,
Dünyadan qaçacaq yeri də vardı.
Onun da qəlbində yaşardı dilək,
Qında saxlayırdı onu qılınc tək.
Visal gəzməyirdi bizim pərizad,
Taki... eşqin evi yaşasın abad.
Bir alim ustaddan soruşdum ki, mən:
Aşiqin halını şərh et bizə sən.
Onu ki, visalə çağırırdı yar,
Möhlət verməyinin nə mənası var?
Neçin muradına yetmədi o da?

Ömründən otuz il o verdi bada?
Dedi ki: - Yetsəydi murada bir an,
Əbədi çıxardı nəşə canından.
Uymadı bir anlıq kefə dünyada,
Otuz il nəşəni verMədi bada.
Bir qədəh alsaydım o şərabdan mən,
Təmənnam qalmazdı iki aləmdən.

**ZEYDLƏ ZEYNƏBİN SEVGİSİ HAQQINDA**

Başqa bir aşiq də o zaman varmış,
O da bu dərd ilə zəncir qırarmış.
Dağ kimi durmuşdu ürəyində dərd,
Yazığı dağlara salmışdı möhnət.
Onu qurtarmışdı dəlilik, bilsən,
Bu divdən törəmiş cinsi-bəşərdən.
Təmiz bir gənc idi, vardı hünəri,
Dürrə bənzəyirdi xoş qəzəlləri.
Eşqin acısını dadıb dünyada,
Başını qoymuşdu bu yolda o da.
Öz adı Zeyd idi, sövda gəzərdi,
Xisləti Əmr ilə Zeydə bənzərdi.
Könül yuvasını zülmət sarmışdı,
Onun var-yoxunu eşq aparmışdı.
Əmisi qızına o vurulmuşdu,
Qız da bu oğlana aşiq olmuşdu.
Onların qəlbi də, fikri də birdi,
Onlar bir-birini candan sevirdi.
O gözəl camallı, o qəşəng nigar,
O divanə üçün tutmazdı qərar.
Oğlan da sevərdi öz cananını,
Bir tükdən asılı qalmışdı canı.
Qız ay camallıydı özü də xoşram,
Təmiz xilqətliydi o nazik əndam.
Şümşad nəfəsliydi, rəngi ərğəvan,
Baldırı civə tək, qəddi xeyzəran.

O bütdə hamının nəzəri vardı,
Dünyaya qiyamət şuru salardı.
Şən idi, şux idi, həm də füsunkar,
Gözəllər gözəli, o nazlı nigar.
Min səfra başını gicəlləndirən,
Min sövda səfrası qırardı hərfdən
Tük kimi incəydi beldən o dilbər,
Ağzı xırdacaydı qarışqa qədər
Şəki alması tək çənəsi vardı
Məkkə qumundan da çox yandırardı.
Öpüşü bal kimi, hüsnü bəxtəvər,
Dadına çatmazdı nə qənd, nə şəkər.
Dodağı nabatla şəkərdən şirin
Nabat-meyvəsiydi öpüşlərinin.
Hər kəs camalında bir su görərdi,
O dirilik suyu, həyat verərdi.
Uca bir sərv idi onun vüqarı,
Gülabla şəkərdi bu sərvin barı.
Camalı günəşlə bir asimanda,
Ətri də ənbərlə bir karivanda.
Hüsnünün şövqiylə əsirdi ruzgar,
Zeynəb adlanırdı o gözəl nigar
O nazənin qızın qəmiylə yanan
Zeyid axtarırdı bu dərdə dərman.
Neyləsin, hayandan bir çarə bilsin
Ki, ləli qart daşdan qopara bilsin.
Zeydin qohumluqda bir aybı vardı
Ki, dünya malından kasıb yaşardı.
Varlı əmisini yoxsul Zeyiddən
Bircə dövlət idi yaxşı göstərən.
Zeyd öz əmisindən dövlət görmədi,
Ondan qız istədi, qız da vermədi.
Hər işdən soyudub xəyala daldı,
Əmisi yad oldu, o yazıq qaldı.
Canan arzusuyla o axşam, səhər
Natəvan gəzirdi qəlbində kədər.
Ağlar nəğmələri bir dəfə gülməz,

Deyirdi: "Mən günə düşməsin heç kəs"
Əmi gizlədərdi qızını ondan,
Pərdələr dalında saxlardı pünhan
Zeydə öz qızını verməmək üçün
Dövlətli bir kişi gəzirdi hər gün.
Nəhayət, məqsədə yetişdim, deyə,
Verdi öz qızını bir dövlətliyə.
Yazıq Zeyd o gündən düşdü həsrətə
Sövdası qərq oldu qəmə, möhnətə.
Yeməkdən, yatmaqdan qaldı sərbəsər,
Tutdu sövdasından yer üzü xəbər.
O da Məcnun kimi çəkdi göz dağı,
Zəncirə bağlandı əli, ayağı.
Hünərsiz, vəfasız yoldaşlara bax.
Ondan ayrıldılar uzaqlaşaraq.
Bir özü, bir könlü qaldı dünyada
O da ki, daima yanırdı oda.
Qığılcım saçırdı ondaki ciyər,
Leyli də tutmuşdu bu dərddən xəbər.
Ara bir yanına çağırıb onu,
Oxşar, əzizlərdi eşqin oğlunu.
Ondan hal tutardı o gözəl nigar
Dərdinə qoşulub ağlardı zar-zar.
Zeydin vəfasını xoşladığından,
Ona öz sirrini açdı o canan.
Zeyd isə mehriban, gözəl Leylidən
Xəbər aparırdı Məcnuna bəzən,
Məcnun ki, canandan xəbər bilərdi.
Onun qarşısında rəqsə gələrdi.
Zeyd idi Məcnunun eşqinə həmdəm,
Xəbər gətirərdi yarından hər dəm.
Ona xoş xəbərlər dedikcə gündə,
Məcnun qul olmuşdu onun önündə.
Zeydi çox görmüşdü vəhşi heyvanlar,
Vəhşilik hissindən qalmışdı onlar.
Məcnun ayrılığa düşəndən bəri
Ayüzlü Leyliyə dediyi şeri

Zeyd öz əlləriylə yazıb kağıza,
Aparıb verərdi o gözəl qıza.
Dostlar arasında o, yol salardı.
Məktub apardıqca, məktub alardı.
Bir axşam Məcnunun, novhə yerindən
Dürrlər axdıqca şerlərindən,
Zeyd ona üz tutub dedi töhmətlə:
"Incilər səpirkən sən bu sənətlə,
Nə üçün dəlilik yolu tutaraq,
Ağlın şöləsindən gəzirsən uzaq.
Sən söz ustasısan, ey böyük insan.
Nə üçün bu yazıq günə qalmısan
Zahirdə çox rüsva görünsən də sən,
Sövdada Zeyiddən artıq deyilsən.
Mən də ağlayaraq, qəmlər içirdim.
Səndən də pərişan günlər keçirdim.
Nəhayət, səbr edib yaşayaq dedim.
Sonra su da içdim, çörək də yedim.
Gəl vurğun könlünü unudub dincəl,
Adına bir Məcnun deməsinlər gəl".
Şəhvəti öldürüb bənliyi atan,
Dünya görmüş Məcnun qızıb bu zaman,
Zeydin töhmətindən alışıb yandı,
Vurğun deməsinə çox acıqlandı.
Zeydə söylədi ki: "Bu üz ilə sən
Uzun danışansan çəkil gözümdən.
Mənə bir sifariş gətirdin əgər,
Söylə artıq-əskik danışma hədər
Uzun danışanın pis olur səsi,
Danışma Zeyd ilə Əmr əfsanəsi.
Mənə dəli dedin, nə haqqın vardır?
Dəli təkəbbürlü dolananlardır.
Mən div bağlayanam, bir div deyiləm,
Huri, mələk kimi azadam bu dəm.
Div xisləti deyil, xoşdur xislətim,
Dünya şahındandır bu təbiətim,
Mənim xasiyyətim xoş olduğundan,

Yanımda ram olur bu qədər heyvan.
Günaha batsa da mənə baxanlar,
Lətif xasiyyətli bir xilqətim var.
Düzlük axtarmaqdır mənim adətim,
Onunçün əyridir bu gün qamətim.
Iki düz alətin nəğməsimi var?
Bərbət əyri olar, mizrab düz olar.
Əyri qayrılmasa tutulan kaman,
Düz nişan gözləmə atılan oxdan.
Üzərlik yerinə yanan naləmdən
Əziyyət paltarı toxuyuram mən.
Mən yaman gözləri yaxşı bilirəm,
Onunçün gözümdən qorxuram bu dəm,
Pisdir öz gözünə gələrsə insan,
Uğrasın nəzərə bir başqasından.
Dəli o şəxsdir ki, dünya varını
Çox sevib, bərkidir ev hasarını.
Mən özüm kamala yetəndən bəri
Açdım boynumdaki ağır bəndləri.
Rişəsi dörd olan bu ağacın mən
Dörd mıxlı kökünü kəsirəm, bilsən.
Qurtuluş qəbzidir məndə yadigar.
Nə paltarlığım var, nə paltarım var.
Sınıq bir gəmidir aparan məni,
Varsın da olmasın onun yelkəni.
Gəmim dəryalarda batmazdan qabaq
Yükümü ataraq qalıram çılpaq.
Mənim o dünyaya məhəbbətim var,
Nə minnət çəkənəm, nə minnətim var.
Çarmıxa çəkilmiş bir bədən yəqin,
Köç vaxtı can versə çox olar çətin.
Səndən can istəyən o yar gözəldir,
Sənin can verməyin hökmi-əzəldir.
Sevgi meydanında yalnız dayanmaq
Canana can vermək şərtdəndir ancaq.
Demə ki, bu torda dolaşdıqca mən,
Bir dən arzusudur keçən qəlbimdən.

Torun gözlərində inan ki, hər gün
Əl-ayaq çalıram batmamaq üçün.
Tikanlı dünyadan istərəm müdam,
Murdar kimi deyil, mərd kimi çıxam.
Dünya ikilaylı qapıya oxşar,
Odur ki, tutmaram bir yerdə qərar.
Bu layın birini açanda insan,
O biri başına dəymiş hər zaman.
Quyuda yerləşmiş aciz bədənin,
Zəncirə möhtacdır həyatın sənin.
Yol ayrıcındakı bu bədbəxt bəşər,
Quyudan zəncirsiz çıxamı bilər!
Gözəllər zülfüdür dediyim zəncir,
O da ki, rəqibin əllərindədir.
Quyudan qurtarmaq mümkün olsa da,
Özgənin əliylə olacaq o da.
Özünün qəmindən at sürən adam
Özgənin qəmindən azaddır müdam.
Insan öz bütünü sındırsa əgər,
Başqa bütə necə pərəstiş edər?
Dəvəmi bir bütə tərəf sürərsəm,
Canım öz bütümdən qurtarar o dəm.
Qırmızı şərabı içsə bir nəfər,
Öz zəhmətlərindən çox yüngülləşər.
Məqbuldur belə iş, mənfəətlidir,
Qafillər gözündə çox dəhşətlidir.
Şikayət etmirəm mən bu halımdan.
Yoxdur bundan rahat başqa bir cahan,
Bu fındıq şəklində səmayə bir bax.
Başıma daş yağır göylərdən ancaq.
Canın məğzi olan öz başını sən,
Bir sümük zirehlə hifz edəməzsən,
Iydətək qırmızı olsam belə mən,
Çılpaq olduğum vaxt ağarar bədən.
Badam ki, deyiləm mən çılpaq olam,
Zənci tək qap-qara balalar doğam.
Allahdan gəlmişdir mənə bu qismət,

Xoşdur bu çəkdiyim bəlalı möhnət.
Qoltuqda turş qora gəzdirib satan
Meyvəçi bir misal çəkmiş bir zaman:
Qardaş, əncir satan bir adam üçün
Ənciri satmaqdır hər şeydən üstün.
Hər kəs sənətindən yapışsa əgər,
Dünyada nə əksə onu da biçər.
Oxumu hədəfə düz tutmuşam mən,
Kaman boşluğudur ziyan gətirən.
Xəzinə bəndini açardım, ancaq
Açar şüşədəndir bəlkə sınacaq.
Hər qorxu içində bir umud da var,
Umud zamanında qorxu da olar.
Yox bu xərabatda mənə bir həmdəm,
Bütün qohumlardan uzaq düşmüşəm.
Qeybət eyləmərəm, hiylə bilmərəm,
Qafil yaşamaram, dərdə gülmərəm.
Əcəl pəncəsinə düşməmiş bədən,
Köç səsi, "Köçməyə yığış" demədən
Bu möhnət evindən qalxaraq bu dəm,
Bu gordan o gora mən getmədəyəm.
Başqa bir dəlilik görmürəm məndə,
Dəlilik budursa, dəliyəm mən də".
Kamal dəryasını bir az da açdı,
O, polad diliylə gövhərlər saçdı.
Bu cana yayılan xoş cavablardan
Zeyd artıq utanıb, dinmədi bir an.
Bildi o budağın qönçəsi təkdir,
Ikinci bir qönçə verməyəcəkdir.
Ədəb dərsi aldı haman vəfadan,
Ağzını min mıxla mıxladı birdən.
Sadiq yoldaş olub yenə Məcnuna,
Xəbər gətirirdi Leylidən ona,
Məcnun da nə desə, savabdır, deyə,
Tamam çatdırardı gözəl Leyliyə.
Ay ilə günəşin arasında tək,
Qasidlik edərdi o da Zöhrə tək.

**IBN-SƏLAMIN ÖLÜMÜ**

Bütün nöqtələrdə iş nişanı var,
Zərurət üzündən baş verir onlar.
Bütün varlıqların hərəkətində
Məqsud yazısından bir xətt var yenə.
Kağızın, bax, iki üzü var həmən,
Odur hədəf olar o iki üzdən.
Bu üzdə tədbirin sayıdır ancaq,
O üzdə təqdirin hesabına bax.
Bu iki hesabda bir ziddiyyət var.
Bunu yaxşı bilər arif hesabdar.
Sən gül saydığın gül sancdığı zaman
Tikan olduğunu bilərsən haman.
Bir çox qara olan salxımlar da var,
Yoxlarkən bilərsən, üzümdür onlar.
Insanı süst edən aclıq da bəzən,
Həzmə kömək olur, saflaşır bədən.
Sənsə bu dünyanın ziddiyyətinə,
Dava etməkdənsə, təslim ol yenə.
Müxtəsər, dünya ki, yaranmış belə,
Sən də turş sirkəni, bal hesab elə.
Gözəllər çırağı o Leyli nəydi,
Dərdi başqasına bir xəzinəydi.
Ilan halqasından çəkilmiş hasar
Içrə, xəzinəydi o gözəl nigar.
Məşəqqət içində dustaq yaşardı,
Sanki daş bağrında bir ləl vardı.
Əъdaha ağzında ay kimi yalnız,
Bir ağır qiymətli gövhərdi o qız.
Ərisə daima qəmlər yeyirdi,
Ona keşik çəkib, şükür deyirdi.
O pəri qızının söhbəti üçün
Polad qeydindəydi hər gecə, hər gün.
Hünərlə səbr edib, qəmlə gəzərdi,
Özünü aldadıb, dərdə dözərdi.

Təklikdə ağlardı o gözəl pəri,
Silərdi gözünü gələndə əri.
Təklikdə inlərdi o ahugözlü,
Əri olan yerdə ağlardı gizli.
Ah çəkib, of deyən o dərdli sənəm
Ağlaya bilməzdi aşkara bir dəm.
Gizlində çəkilsə bir ağrı, bir dərd
Insanın ömrünü çürüdər möhnət.
Ərin, qohumların xəcalətindən,
Zülfü tək pərişan gəzirdi bilsən,
Yoldan bir yad adam keçdiyi zaman
Dalınca həsrətlə baxıb çadırdan,
Ağlardı, ağlardı yanıb qəmlərə
Sonra üzü üstə düşərdi yerə.
Daldan ayaq səsi gəlsəydi bir an,
Zorla əl çəkərdi ağlamağından.
Şam kimi yandıqca könlünün bağı,
Gülüşlə sınardı hər ağlamağı.
Lakin, əl çəkməzdi pislikdən fələk,
Leyli ah çəkərdi qəmlər yeyərək.
Gəldi bir zaman ki, qansız ruzigar
Dolanıb, hökmünü verdi aşikar:
O qədər visalsız keçdi günləri,
Qəmdən xəstə düşdü Leylinin əri.
Pozuldu bədəni qəmlə möhnətdən,
Artıq Ibn-Səlam düşdü qüvvətdən.
Qızdırma qoymadı canından əsər,
Qalxdı hərarəti beyninə qədər.
Onun bədənindən köçdü rahatlıq,
Sağlamlıq şüşəsi qırıldı artıq.
Qarurə tanıyan baxdı nəbzinə,
Istədi səhhəti düzəlsin yenə.
Qaydayla, hörmətlə zəhmət çəkərək,
Deyirdi, xəstəlik sağalsın gərək.
Nəhayət, dincəldi o zəif bədən,
Göründü səhhətin yolu yenidən
Bir az yaxşılaşdı o zəif ürək

Arıq vicudunu kökələn görcək,
Zərərli şeylərdən pəhriz etmədi,
Təbibin dediyi yolla getmədi
Yalnız sancı deyil pəhrizlə gedən
Onunla dincəlir zəhmətdən bədən
Rahatlıq vaxtında cana xeyri var,
Əzab zamanında nəcat tapılar.
Gülün zillətindən min dərman törər,
Dürr xəznəsindən dəvə yüklənər.
Xəstə qurtarınca tünd qızdırmadan,
Yenə pəhrizini pozduğu zaman
Qızdırma bir daha gəldi bədənə,
Əvvəlki xəstəlik qayıtdı yenə,
Birinci yarayla zəif düşən can
Ikinci yarayla köçdü dünyadan.
Birinci su ilə islanan torpaq
Ikinci su ilə oldu bir sıvaq.
Əvvəl bir zəlzələ qopardı ruzgar
Sağa da, sola da çatladı divar.
Ikinci zəlzələ qopduğu zaman
O çatlamış divar uçdu binadan.
Xəstə iki-üç gün darda qalaraq,
Nəfəs vurmadaydı səhhətdən uzaq.
Elə ki, təngidi köksündə ürək,
Çırpdı şüşəsini daşlara külək.
Yel kimi dünyaya əl edib həmən,
Qurtardı dünyanın işkəncəsindən.
O getdi, bu haldan bizimçün də var,
Dünya öz borcunu geriyə alar.
Dünyanın borcundan qorxmalısan sən,
Bir çöp olsa belə alacaq səndən.
Bu borcu verməyə çalış, ey insan,
Çalış ki, qurtarsın minnətdən yaxan.
Bu borcun üstündə sən tutsan qərar,
Əndama mıx olar, bədənə mismar.
Öz cövhərin üçün bu sandığı qır,
Göyərçinlər kimi göylərə hayqır.

Dördköklü yeddi qat bir ağac, inan,
Min yerdən mıxlanmış bu doqquz qalxan,
Ölümlə üz-üzə durduğu yerdə
Elə düşərlər ki, qalxmazlar bir də.
Bu gözəl günbəzdən doğanda səhər,
Dünya xırmanına düşən atəşlər,
Hər axşam çağında fələyə qədər
Bu palçıqlı küpdən qalxan tüstülər,
Deyir ki: - Dünyaya nəzər yetir bir,
Dünya bir tüstülü atəşgədədir;
Gecə də, gündüz də ciyərlərinə,
Od vurduğu halda sən şadsan yenə.
Çoxdan həyasızdır bu iki quş, bax,
Sənin xurcununu deşirlər ancaq.
Bir darı xırmanı olsa da ömrün,
Bu quşlar onu da yeyəcək bir gün.
Sanma ki, dünyada can qalacaqdır,
Nə varsa, bir zaman məhv olacaqdır;
Ömrün çətinliklə yüz yaşa yetər,
Yüz deyil, min il də yaşasan əgər,
Ölümün dəhşəti pusquda durur,
Özünü getmiş bil, doğru söz budur.
Nakam Ibn-Səlam öldüyü zaman
Leyli ceyran kimi sıçradı tordan.
Bu ölüm Leyliyə xeyir olsa da,
Ölən öz əriydi, incidi o da.
Zahirdə ərinə matəm saxlardı,
Batində Məcnunu anıb, ağlardı.
Saçını yolardı, anıb Məcnunu,
Guyaki əriçün eyləyir bunu.
Ərinin üstündə etdiyi şivən
Məcnunu oxşardı yalnız ürəkdən.
Zahirdə ərinin xatiri vardı,
Batində dostunu, duyub anardı,
Bir bəhanə tutub ölmüş ərini,
Ağlayıb sökərdi can dəftərini.
Ərinin üstündə dediyi dillər

Dostunun halından verirdi xəbər.
Sözlərin qabığı əriydi yalnız,
Məğzində dostunu oxşardı o qız.
Ərəb qaydasınca, əri ölən şəxs
Matəm saxlayaraq gözə görünməz.
Iki il qapalı evdə əyləşər,
Qadının üzünü görməz bir bəşər.
Bacardığı kimi oxşayıb ağlar,
Şerlər deyərək, qəlbini dağlar.
Bu bəhanə ilə fürsət taparaq,
Çadrını xəlvətə çəkdi Leyli, bax.
Ərinə el dəbi yas tutmaq üçün,
Qəm ilə üz-üzə oturdu hər gün
Artıq, fürsət tapdı o ağlamağa,
Səbrini ellərə verdi sadağa.
Yas bəhanəsiylə yüksəldi səsi,
Yeddinci fələyə qalxdı naləsi.
Qəlbində hicranın tükənməz dərdi,
Üzünü, gözünü sillələyərdi.
Artıq nə qorxusu, nə qeydi vardı,
Istədiyi kimi nəfəs alardı.

## ZEYDİN, İBN-SƏLAMIN ÖLÜM XƏBƏRİNİ GƏTİRMƏSİ

Bu gözəl dastanı bizə nəql edən,
O iliyə qədər çürümüş bədən
Dedi ki: canandan uzaq düşən Zeyd,
Qəlbinin başında min ağrı, min qeyd,
Səbr ilə udardı bu ağır dərdi,
Yazıq su yerinə qanlar içərdi.
Onun bu sirrinə bələd qohumlar
Bir çarə tapmağı vermişdi qərar.
Zorla alınmışdı o sevdiyi yar,
Zeydə yoldaşları kömək durdular.
Səbriylə gəldi Zeyd o dərdə üstün,

İşinin düyümü açıldı bir gün.
Aşkar olmasa da, gizli, bir təhər
Zeyd ilə o Zeynəb görüşürdülər.
O, canan yanına getdikcə az-az,
Qəlbin aynasından silinirdi pas.
O təzə qönçəylə görüşən zaman
Açıb söyləyirdi dərdini pünhan.
Mehribanlıq dolu şirin dodaqlar
Gizli nəvazişlər elərdi izhar.
Elin qaydasına uyğunlaşaraq,
Quruca hal-əhval sorardı ancaq.
Könüllər pak idi, saflıq duyardı,
Ortada həyalı baxışlar vardı.
Çarə tapmışdısa Zeyd öz dərdinə,
Məcnunun qeydinə qalırdı yenə.
Məcnunun dərdinə qalıb ürəklə,
Çarə axtarardı min bir diləklə.
Öz dərdi başından aşıb daşardı,
Lakin Məcnun üçün çox çalışardı.
Elə iş gördü ki, durduqca cahan,
Afərin söyləyər hər xatırlayan.
Səndən də yaxşılıq qalsa yadigar,
O camal sənin də üzündə parlar,
Bir çox sifətlər var insanda hələ,
Almasan yaxşıdır onları dilə.
Pis sözü ağzına alınca insan,
Qarnında öldürsə yaxşıdır, inan.
Bu dünya dolanıb, döndükcə ruzgar,
Qoy səndən yaxşı söz qalsın yadigar.
Səndən də, məndən də nə qalsa ancaq,
Bil ki, kəndxudaya qismət olacaq,
Köçdü Ibn-Səlam, getdi dünyadan.
O quş bu qəfəsdən qurtaran zaman
Zeyd baş götürüb, yola çıxdı tək,
Məcnunun yanına gəldi sevincək,
Ölümün verdiyi acı qədəhdən
Məcnuna tez xəbər yetirdi həmən

"Arzu karvanıyın o yol vuranı
Sənin sağlığına tapşırdı canı.
Artıq ölüb getdi bil Ibn-Səlam,
Ömrə sən layiqsən, sən yaşa müdam"
Məcnun bu löqməni ağzına aldı.
Fələyin dövrünə bir nəzər saldı
Bir fəryad qopardı, nərə çəkərək
Çəkdiyi nərədən titrədi fələk.
Gah rəqsə gətirdi onu həyəcan,
Gah da öz şəklini gördü məzardan.
Sevindi bu işə o bir cəhətdən
Gülün ətəyindən kəsildi tikən.
O biri cəhətdən duyurdu ürək:
Rəqibi öldüsə, o da öləcək
Odur ki, gülməyib, ağladı dərhal,
Ağlamaq əmr etdi bu dəmdə kamal.
Ağlayıb, ağlayıb, ağrılar uddu,
Sonra Zeydə baxıb, acığı tutdu:
"Sən, ey ürəyində bir nalə, min qəm,
Baş ağrımı çəkmiş vəfalı həmdəm!
Könüldə bir mətləb ummuşam səndən,
Qulaq as, bu sirri açıq deyim mən:
Bu günki varağı sən açıq, aydın
Oxuyub, ortada xəta buraxdın.
Dedin ki: filankəs dünyadan getdi,
Sənə öz canını sadağa etdi.
Sevsəydin dostluğun düz peymanını,
Deyərdin "Leyliyə verdi canını".
Ona qismət olan bir tikə, inan,
Mənim boğazımdan keçməz heç zaman",
Zeyd ona dedi ki: "Ay canım, burax;
Leylini sevmisən sən ondan qabaq.
O bərabər olan iki nəqşdən,
Birini əksiltdin öz əlinlə sən.
Aradaki fərqi sildin ortadan,
Varağın birindən qoymadın nişan.
Madam ki, nə mənlik, nə də sənlik var,

İkilik rəqəmi mənasız olar.
Mən də qaydalara aldanıb bu dəm,
Mənə yaraşmayan bir söz demişəm.
Yaxşı düşmədisə söhbətim, sözüm,
Mən gedə bilərəm, incimə, gözüm!"
Məcnun bu cavaba asdıqca qulaq,
Zeydi qucaqlayıb dedi: - Sözə bax!
Dedi: "Ey müsahib, dilinə əhsən!
Ən xoş nəsimlərin ən gözəlisən!
Nə gözəl danışdın, nə xoş söylədin,
Mənə layıq oldu cavabın sənin.
Nə gözəl, nə dürüst cavabların var,
Bax belə danışar həmdərd olanlar!
Cahanda hal əhli olsa bir nəfər,
Onunla danışmaq dünyaya dəgər.
Mən əhd etmişəm ki, nə qədər sağam,
Səninlə daima dost olacağam.
Nə qədər ömrüm var, səninlə varam,
Neyləsən yolundan baş qaçırmaram.
Daima dərs alıb dediklərindən,
Səndən sirr saxlasam, kafir olum mən".
Məcnunun qəlbində ayrılıq dərdi,
Əmr tək Zeyd ilə ömür sürərdi,
Aradan bir həftə gəlib ötüşdü
Bir gün ayrılığa bəhanə düşdü.
Məcnun yuvasına yollandı yenə,
Zeyd də qayıdıb getdi evinə.

## LEYLİNİN ALLAHA YALVARMASI

Vaxtın buxağından, qulaqlarından
Gecə, incisini asdığı zaman
Leyli göy üzündə Sürəyya kimi,
Gözündən dənizə səpirdi inci.
Bir oydu, bir gecə, bir dərd, bir də dağ,
Onun həmdəmiydi yalnız bir çiraq.

Gecələr yatmazdı, pərvanələr tək,
Gecədən çırağa gileylənərək.
Deyirdi: "Nə zaman qurtaracaqdır,
Bu gecə fələyin alnında dağdır.
Mənə qismət olan gecəyə bax bir,
Bütün varlığımı o, həlak edir.
Bu uzun qaranlıq gecəyə, inan,
Bir əlac tapmıram əlacsızlıqdan.
Qəlbində qalmamış onun hərarət,
Qorxuram səhəri olsun qiyamət.
Gülmədim bu gecə gələndən bəri.
Bari, xoş olaydı onun səhəri.
Ev uçmuş, çıraq da sönmüşdür bu dəm,
Bağı talan olmuş bağban kimiyəm.
Tutaq ki, xoruzun boynu vurulmuş
Sübhün nəfəsinə, deyin, nə olmuş?
Tutaq ki, qarının xoruzu öldü,
Məhlə əzançısı yerə gömüldü,
Səhər növbətçisi getmişdir hara?
Yadından çıxdımı onun nağara?
Ilahi! Məni sən canana yetir!
Oduna yandığım o şəmi gətir!
Mənə işıq verər o sevdalı yar,
Bu zülmət gecəni o işıqladar"
Dilindən düşmədi səhərə qədər
Bu duaya oxşar dərdli nəğmələr

**LEYLİ İLƏ MƏCNUNUN GÖRÜŞMƏSİ**

Tezdən duran xosrov səhər vaxtında,
Sevinclə əyləşdi şahlıq taxtında.
Günəş ki, eşq ilə öpdü gündüzü,
O eşqə baş əydi bütün yer üzü.
Gözlərə nur verən bu işıqlı gün
Novruz bayramından xoş idi o gün.
Arzu kəmərini bağlamışdı baxt,

Qüssə dağılmışdı dünyadan o vaxt.
Leylinin ayağı zəncirdən azad,
Aləmi ay kimi gəzirdi dilşad.
Heç kəsdən çəkinib qorxmayan o qız
Aşkara dərd çəkib, ağlardı yalqız.
Canı qurtarmışdı ər qayğısından,
Artıq güdməyirdi onu bir insan.
Qəlbində alovlar, yanıb ağlardı,
Nə ata, nə ana qorxusu vardı.
O, evdə, sarayda, məhəllədə tək
Gəzirdi, üzünü əllə örtərək.
Hər dəmdə bir könül axtardığından,
Hər qəlbə peyam da verirdi pünhan.
O hər bir fələyə işıq açardı,
Hər bir nəfəsə də ənbər saçardı.
O kimi axtarıb yanırdı oda?
Bircə dostu vardı onun dünyada.
Ərinin yasını qurtardı, yenə
Çəkdi qəm evini ata evinə.
Səbrə qatlaşmağı buraxıb artıq,
Eşqin pərdəsini atdı apaçıq.
Şərab şüşəsini sındırıb bütün,
Suya qalxan tutdu gül kimi o gün.
Qıfılla bağlanmış o durr, o canan
Qapını qıfılsız gördüyü zaman
Çarə axtarmaqda tərpənib zirək,
Səhhət axtarırdı, çarə gəzərək.
Hicrədə əyləşib fikir eylədi,
Zeydi çağırtdırıb, belə söylədi:
"Bu gün ki, intizar günü deyildir?
Bu visal günüdür, get yara bildir.
Dünya nə gözəldir, bir oyan, az yat,
Get şəkəri gətir, qızıl gülə qat!
Sərvin qucağında yatır çəməni,
Lalənin sapına düz yasəməni!
O gözəl ahunu tapıb tora sal,
O müşk nafəsini indi ələ al.

Onun tikanından ipək tutaq biz,
Tozundan qayrılsın qoy ənbərimiz.
Qoy alım onunla könüldən nəfəs,
Həmnəfəslərimdən qalmamış heç kəs.
Pusquya gəlməmiş insafsız əcəl,
Bir onu görsəydim əcəldən əvvəl".
Leyli xəznədəki xəzlə ipəkdən
Bir paltar çıxartdı o nazik bədən.
Ona layiq olan bir neçə şey də
Şah kimi götürüb tapşırdı Zeydə.
Zeyd isə şadlanıb bu hədiyyədən,
Ucaldı dağ kimi, qalxaraq həmən,
Bütün paltarları çölə gətirdi,
Qanadsız hümaya müъdə yetirdi.
Bütün paltarları verdi Məcnuna,
Xoş xəbər danışdı Leylidən ona.
Məcnun bu xəbərdən şadlanıb o dəm,
Atlanıb düşürdü o talei kəm.
Dönüb fələk kimi hər bir tərəfə,
Yerində fırlandı o, yeddi dəfə.
Onun yeddi dəfə bu hərlənməyi,
Keçib yeddi çərxi ötdü fələyi.
Sonra da üzüylə yer süpürərək,
Şükür səcdəsinə o baş qoydu tək.
Öpüb o paltarı, yad etdi yarı,
Sonra da əyninə geydi paltarı.
Dostluq bulağında aldı dəstəmaz,
Hicran zillətindən qurtardı bir az.
Ay kimi parlayan üzünə bax sən.
Ənbər qoquyurdu xoş nəfəsindən.
Şer deyə-deyə üz qoyub yola,
Şəkər dağıdırdı o sağa-sola.
Dişili, erkəkli bütün vəhşilər
Onun arxasınca yola düşdülər.
Məcnunla bir yerdə hamsı durardı,
Onun ətrafında halqa vurardı.
Canan qapısına yetişib durdu,

Ordusu da vardı, amma nə ordu?
Elə bir ordu ki, döyüş zamanı
Pəncələr olardı qılınc, qalxanı.
Zeyd xəbər yetirdi o Zübeydəyə,
Bu qoca xəlifə yumşalmış, deyə.
Məcnun ki, çəkdiyin qəmə sirdaşdır,
O bu gün qapında torpaqdır, daşdır.
Səcdənə düşmüşdür, rəhm et Məcnuna,
Içəri gəlməyə izin ver ona.
Leyli bu müъdəni eşidən zaman
Xərabəyə döndü bu abadlıqdan.
Çadır dirəyi tək qalxaraq əvvəl,
Ip kimi sərildi sonra o gözəl.
Huşsuz vəhşilərdən tamam bixəbər,
Çadır dirəyi tək qalxaraq əvvəl,
Şümşad ayağına düşən bir od tək,
Qonaq ayağına düşdü o mələk.
Məcnun seyr elədi dərdli cananı,
Ayaq pərdəsində görüncə canı.
Naləsi titrətmə saldı göylərə,
O da huşdan olub yıxıldı yerə,
Cansız bir dirəkdi o nazik bədən,
Məcnun da canlı bir ölüydü bilsən.
Dünyanın səsindən tamam bixəbər,
Huşsuz uzanmışdı o sevgililər,
Məcnunla yol gəlmiş çöl heyvanları
Bu vaxt ortalığa alıb onları,
Iki sevgiliyə keşik durdular,
Dağ çənbəri kimi halqa vurdular.
O qədər çoxdu ki, orda vəhşilər,
Yol tapa bilmirdi onlara nəzər.
Oraya gəlmişdi iki-üç insan,
Onları vəhşilər dağıtdı haman,
Ortadan çıxaraq yerdə qalanlar,
Hərəsi bir küncdə gizləndi onlar,
Orda huşu getmiş o sevgililər
Qaldılar günorta olana qədər.

Zeyd gəlib gülabla ənbər yetirdi,
O qoşa baharı cana gətirdi.
Elə ki, huşları qayıtdı yenə
Dinməzcə baxdılar biri-birinə,
Leyli utanaraq, qızardı gül tək,
Torpaq qəribinə yaxın gələrək,
Əlindən yapışıb çəkdi iləri,
Çadrına apardı o gözəl pəri.
Onu çadırında oxşadı nazla,
Ovutdu qəlbini min bir avazla.
Zeyd məhrəm kişiydi, həm də mehriban,
Əmr-As olmağı atıb ortadan,
Qapının ağzında o da halqa tək,
Haman vəhşilərlə əyləşmişdi tək.
Hərəmi dörd yerdən tutan heyvanlar
Onun ətrafında çəkmişdi hasar.
Havada milçək də uçsaydı əgər,
Tutub parçalardı onu vəhşilər.
Orda vəhşiləri görən bir insan
Yaxına gəlməzdi can qorxusundan.
O bağlı qapını görüb bu saat,
Heyrətə düşmüşdü bütün camaat.
Həqiqi eşqdir, - deyirdi hər kəs, -
Ona bulaşmamış şəhvətlə qərəz.
Bu həqiqi sövda düşəcək dilə,
Ona ram olmuşdur vəhşilər belə.
Ona vəhşilərdən dəyməyir zərər,
Yoxdur xilqətində vəhşətdən əsər.
Qəlbində vəhşəti boğduğu üçün,
Durmuş xidmətində vəhşilər bütün.
Bu torpaq nəslinin sövdası, aşkar,
Paklıqla yaranıb tutmuşdur qərar.
Bu gün naləsini eşitdiyimiz
Hər iki aşiqə nəzər salaq biz.
Əldə içilməmiş qədəhlərindən
Bu xarab, o biri sərxoşdur, bilsən!
"Artıq qucaqlaşın" deyirkən zaman,

Bu əldən getmişdi, o biri huşdan.
Bu eşq dəlilikdən törənməmişdir,
Dünyaya dərs olan nadir bir işdir.
Kim ki, hal əhliydi, dadmışdı dərdi,
Evində onlardan söhbət edərdi.
O bağlı xəzinə, ətrafı hasar,
Durmuşdu yanında gənc xəzinədar.
O əziz qonağın eşqiylə durdu,
Onu bəzəndirib min ziynət vurdu.
Öz gözəl saçının həlqələrindən,
Ona çalma hördü o nazik bədən.
Diyləmi sakitcə görüncə o yar,
Qıvrım saçlarından geydirdi paltar.
Onu qəlb evinə eylədi sultan,
Həmail qolunu saldı boynundan.
Sonra da bərk basdı bağrına birdən.
Iki gül cücərdi bircə qönçədən.
Onu kökləmədən, mizrabsız çaldı,
Şərabsız, öpüşsüz ağlını aldı...
Zəncirdən açıldı əlif ilə lam,
Üzdən bir-birinə yapışdı tamam,
Iki əyilmiş xətt, artıq öpüşdü,
Bütöv bir dairə şəklinə düşdü.
Ədlin tərəzisi bərabər olcaq
Quş qanad gətirdi, uçmadı ancaq.
Iki şam bir teştdə yıxıldı, bilsən,
Ruhları bir idi, birləşdi bədən.
Iki sap bir tovda eşilmiş oldu,
Iki sürahi də bir sudan doldu.
Iki lay vuruldu bir qapıya tən,
Iki göz yarandı bir baş üstündən.
Birləşdi bu zaman uzaq qütblər,
Bir nurla parladı o iki səhər.
Könülləri yanmış o iki dildar
Bir gecə bir gündüz belə qaldılar,
Nə onun, nə bunun qalmışdı huşu,
Ortadan uçmuşdu ehtiras quşu.

Onlar özlərinə gəldiyi zaman
Şahin uçmuş idi, şah da arxadan.
Çadırdan bayıra çıxmışdı canan,
Onun keşiyində dururdu soltan.
Yığışıb köçmüşdü sarayından şah,
Tacı da, taxtı da boş qalmışdı, ah!
Məhəllə əğyardan boşalmışdı, bax!
Orda sevgililər qalmışdı ancaq.
Məcnun o cananı hazır görərək,
Evi danışıqdan boşaltdı, gerçək.
Özü də halqa tək qapıda durdu,
Məcnunun gözüydü Leylinin yurdu.
Elə ki, qəlbində yer verdi ona,
Qapıçı olmağı aldı boynuna.
O iki qazanın isti dodağı
Kasa tək lal idi bu visal çağı
Əsincə behiştdən sərin bir külək
O iki alovu söndürdü şam tək.
Eşq gəlib, üzərlik yandırdı dərhal,
Ağızlar bağlandı dillər oldu lal.
Iki divardaki iki naxış tək,
Onlar hərəkətsiz dururdu, gerçək.
Ürək sözlə dolu, bağlıydı dillər,
Sanki ağzı bağlı bir kuzəydilər.
Onların eşqiylə dolmuşdu cahan,
Nitqi açılmazdı heç kəsin bir an.
Nə qədər vardısa qəmi-intizar,
Gecələr şam kimi dil açardılar.
Elə ki, visalla açıldı səhər,
Kəsildi şam kimi danışan dillər.
Dilin bəlasıdır uzunçu olmaq,
Ariflər işidir sükuta dalmaq.
Xəzinə qızıldan olduqca kənar,
Qapısı daima qıfılsız olar.
Onu qızıl ilə doldursa insan,
Xəzinə qapısı bağlanar hər an.
Qəmzələr diliylə o nazlı dilbər

Deyirdi qəlb açan xoş bədihələr:
"Ey on dilli süsən, sənə nə olmuş?
Mənim dərdimdənmi dilin tutulmuş?
Sinədən söz deyən bir şeyda bülbül
Dinməz il uzunu, açılmasa gül.
Lakin, gül üzünü gördüyü zaman
Bir deyil, oxuyar min yeni dastan.
Sən dünya bağında şeyda bülbülsən,
Visala can atan gül kimiyəm mən.
Bu visal günündə hanı həvəsin?
Ağzın qıfıllıdır çıxmayır səsin".
Qanlı göz yaşında boğulub gedən
Məcnun alovlu bir dil açdı birdən:
"Ey sənəm, qənd kimi dodağın vardır,
Deylimi bağlayan o dodaqlardır...
Düşün ki, ağzımda dil yoxdur, canan!
Dil deyil, bir tükdür bu dilim, inan.
Camalın şovqunda qəm çəkə-çəkə,
Tüküm dilə döndü, dilim də tükə[112].
Qapında bir tükün dil olmasından,
Dilin tük olmağı yaxşıdır, inan.
Səninlə tük kimi danışmaq üçün,
Qoy dilim tük kimi incəlsin hər gün.
Sənə can satmaqda mahirəm, ey yar,
Sənə dil satmasam, daha xoş olar.
Qoy sinə məlhəmi çox olduğundan
Işdə dil yarası olmasın, canan.
Axtaran bir hərif uzundil olar,
Tapınca nə dili, nə sözü qalar.
Mənim də tapdığım sənsən, ey sənəm,
Sənin də quyuya saldığın mənəm.
Mənimçin sən varsan özümdən əvvəl,
Çünki mənim deyil, sənindir bu əl.
Nəçiyəm, de kiməm mən talei kəm?
Dünya şahiddir ki, sənin kölgənəm,
Özümü hər sayda heç bilirəm mən,
Heçə bənzəyirəm bu heçkəslikdən...

Səndən əsər çatdı mənə, ey dilbər,
İnan ki, ondandır məndəki əsər.
Bir qızıl quş kimi ucaldıqca mən,
Bir nişan görmədim dağ kəkliyindən.
Sındı qızıl quşun qanadı bu gün,
Uçdu dağ kəkliyi, uçdu onunçün.
Bizim milçəyimiz gəlməmiş cana,
Tovusun gəlmədi sənin meydana.
Şahın ov köpəyi edəndə şikar
Ahu balası da şaha ox vurar.
Visal umudunla güldüyüm vaxtla
Mənə dad verərdi o xoş intizar.
Elə ki, sevgilim əlimə keçdi,
Işim bənliyimdən uzağa köçdü...
Sənə könül verən aşiqə, canan,
Əldən düşdüyü vaxt əl uzadırsan.
Can sənə peşkəşdir, nə qədər sağam.
Sənə ömrüm boyu baş qoşacağam,
Baş sənsiz olarsa, ayrılsın təndən,
Can sənsiz olarsa, çıxsın bədəndən.
Hər gün ayağına baş qoyam gərək,
Məndən can verməkdir, səndən istəmək.
Nə qədər ki, sağam, sənsən nigarım,
Sənsən öləndə də pərəstişkarım.
Canın ki canımdan cida deyildir,
Sənsiz yaşamağım rəva deyildir.
Məni odlarına yandırsan da sən,
Balıq tək suyundan ayrılmaram mən.
Səninlə gözlərim dünyaya baxar,
Kim görən gözünü kor istər, ey yar.
Bu yolu mən sənsiz gedərəmmi ah?
Səndən ayrılmaram, nəuzibillah!
Aşiq məzhəbində ayrılıq nədir?
Mən sözü, sən sözü - bir əfsanədir.
Iki parça olan bir zirehik biz,
Bir can parçasıyıq, bil ki, ikimiz.
Mən yoxam, dünyada sənsən var olan,

Bu xəyali surət özünsən, inan!
Madam ki, mən sənəm, ikilik nədir?
Birliyi qırmağa nə bəhanədir?
Heykəl ikidirsə, binövrə birdir,
"Lam əlifla" ki, ayrı deyildir[113].
Orda ki, mən varam, sən nigar da var,
Orda ki, sən varsan, bu qubar da var.
Yox, yox, yanılıram can birdir, canan,
Ikilik qovğası çıxmış ortadan.
Necə birləşirsə bir bəm ilə zil,
Birləşən canımız ayrılan deyil.
Zillə bəm olmasa, çəng çalan bir kəs
O çəngdən sədalar çıxara bilməz.
Bir xəzinədəndir ürəyimiz bax,
Arada ikicə sifət var ancaq.
Xoş olar bir hərəm seçsək ikimiz,
Xoşdur bir addımda qərar tutsaq biz,
Cüt ağız qılıncın qını bir olar,
Badam cüt məğzli, bir qabığı var.
Yumurta sarısı cüt olsa, belə,
Sərmayəsi birdir, bir hesab elə.
Iki həmcins hərf düşsə bir yerə,
Onlar bir yazılar səhifələrə.
Nişanımız birdir, cinsimiz də bir,
Yuvamız ikidir, gəl də birləşdir.
Gəl iki hərf yaz bir adda, ey yar,
Iki damla tutsun bir camda qərar.
Incəsən, ikiyə vurma biri sən,
Gəl təki-təkə vur, əgər hərifsən".
Məcnunun göz yaşı tufanlar açdı,
Min belə dürrlər, incilər saçdı.
Leyli can yandırıb ülfətlə, nazla,
Məcnunu oxşadı minbir niyazla.
Hoqqanı doldurdu o ixtilatla,
Dodaqlarındakı abi-həyatla...
Xətər saçılırdı qara saçından,
Ağzı da zərifdi ətir qabından.

Qızın ay üzündə o incə dodaq
Şəkər paylayırdı ətir saçaraq.
Məcnunun başına xalvarla şəkər,
Batmanla ənbərlər saçdı o dilbər.
Xəyali Misirdən min bac istədi,
Hümməti həbəşdən xərac istədi.
Kim ki, bu dünyada sükuta dalar,
Öz ətri gül kimi ağzında qalar.
Onun söz yaradan bir ağzı vardı,
Bunun da çənəsi sözlə oynardı.
Mənim düşüncəmə, zənnimə görə,
O ağız layıqdı belə sözlərə.
Dünyadan bir qismət alır hər bəşər,
Biri ciyər yeyir, o biri şəkər.
Sövdalı adamlar uyuşmaz ayla,
Şəkər saziş etməz çoxlu səfrayla.
Qızıl gül ətrindən doysa bir nəfər,
Ona haram olur başqa ətirlər.
Məcnun seyr etdikcə gözəl yarını,
Cırmağa başladı öz paltarını.
Hissizlik şərabı çox təsir etdi,
Ayaqdan düşərək, əldən də getdi.
Könlünü üzrlə eləsə də pak,
Taqətsizlik onu etmişdi həlak.
Gördü ki, sümüyə dayanmış bıçaq.
Aldığı zərbədən həlak olacaq.
Qılıncı başından, başını teştdən
Götürüb çöllərə yollandı birdən.
Onun kəsilmişdi səbri, qərarı,
Sızlardı yanında çöl heyvanları.
O öz aynasını verərək yara,
Başqa bir ayinlə, çıxmış yollara.
Yarının zülfünü qucaqlayaraq,
O öz varlığından düşmüşdü uzaq.
Özünü öz yarı sayaraq, bəzən,
Özünə müştəri olurdu səhvən,
O öz varlığını unutmuşdu, bax,

Varlığı, mənliyi Leyliydi ancaq.
O, gülər baharı görəndən bəri
Birə min olmuşdu eşqin qəmləri.
Xəyal aləmində xoşbaxtlığından
Bir visal dastanı deyildi hər an.
Gah dost vəfasından söhbəti vardı,
Gah da bir qabıqdan məğz çıxarardı.
Zeyd o beytləri dinləyib hər an,
Asıb sırğa kimi qulaqlarından,
Ona pak ruh ilə deyirdi əhsən,
Deyirdi: "Insanlıq elmində təksən!
Müqəddəs bir eşqi vermədin bada,
Sənə səcdə qılmaq borcdur dünyada.
Əgər məhəbbətdə olmasa ismət,
O şəhvət hissidir, deyil məhəbbət!
Saf eşqin nurlu bir güzgüsü vardır.
Eşqin hesabından şəhvət kənardır.
Qərəzli bir sövda yaşamaz, inan!
Eşq ilə qərəzi bir tutmaz insan.
Düz gəlməz eşq ilə qərəz, müxtəsər,
Qərəz olan yerdən eşq qalxıb gedər.
Düzü, səndən başqa aşiqlər tamam
Qərəzə sitayiş edirlər müdam.
Saf eşq səninkidir, başqası nədir?
Onlar eşq adına bir bəhanədir",
Bir eşq doğruluqda tutarsa qərar,
Dostun yaxşılığı birə on olar.
Sevgi bu kəmala çatarsa bir an,
Yaxşı ad qazanar özünə insan.
Nizami, nə gözəl bir dövlətin var,
Hər zaman, hər yerdə o rəvac tapar.

## PAYIZIN YETİŞMƏSİ VƏ LEYLİNİN ÖLMƏSİ

Qaydadır yarpaqlar tökülən zaman
Qanlı sular axar o yarpaqlardan.
Hər bir budağın ki, içində qan var,
Axır, deşiklərdən süzüb damcılar.
Suyun şüşəsi də soyuyub donar,
Bağların üzünə sarılıq qonar.
Ölüm zərbəsilə qabarar budaq,
Torpağa pay olar hər qızıl yarpaq.
Nərgiz öz köçünü dəvəyə çatar,
Şümşad taxtdan düşüb, tacını atar.
Yasəmən siması saralar yenə.
Gül də qan məktubu alar əlinə.
Zöhhak ilanı tək hey qıvrılaraq,
Çəmənin başına sarılar torpaq.
Qaydadır acı bir külək əsəndə,
Tökülər yarpaq da, solar çəmən də.
Dəniz tufanına düşən adamlar
Qorxudan saxlamaz əynində paltar.
Solar yaşıl otlar, bənzəyər yenə
Sarılıq tozundan xeyri gülünə.
Tülkü əldən düşüb yolda dolaşar,
Tülkü tükü kimi qana bulaşar,
Ciyəri naziklər bağda naxoşlar,
Meyvə gözəlləri nazlanmaq xoşlar.
Bağa bağban olan hindli bir nəfər
Zənci balasının başını kəsər.
O kəsik başları götürüb bağban
Budaqlar üstündə asar eyvandan.
O gözəl çənəli almaya bax bir,
Nardan soruşar ki: "Kefin necədir?"
Parça-parça olan ciyərindən nar
Yaralı qəlbinə qan damızdırar.
Püstənin ağzı da yırtılan zaman
İnnab dodaq büzər ona uzaqdan.

Narınc üzünün də girdəliyi var,
Turuncdakı ətri çəkib aparar.
Muğan şərabının küpündən dehqan
İçib, sərxoş olar, düşər ayaqdan.
Payız bu tufanı qurduğu anda
Qəlbən yaralandı bir gülüstanda...
Ucalıq taxtından Leyli düşərək,
Bir dərd quyusuna endi o mələk.
Sızladı bağının baharı tel-tel,
Onun çırağına sillə vurdu yel.
Başına bağlarkən qızıl çalmalar,
Başqa bir çalmaya düşdü o nigar...
Zərli ipək geyən o nazik bədən
Qamış teli kimi incəldi birdən.
Bədirlənmiş ayı döndü hilala,
Sərv qaməti də döndü xəyala.
Könlünün sövdası başına keçdi,
Başının ağrısı könlünə köçdü.
Təmuzun istisi şehi apardı,
Lalə yarpağını yellər qopardı.
Yardan ayrılalı yanıb sönmüşdü,
Sərvi də incəlib çöpə dönmüşdü.
Qabaqlar da vardı bu dərd, bu möhnət,
Birə yüz olmuşdu indi məhəbbət.
Leyli aşiqini görüncə darda,
Gördü öz könlünü min intizarda.
Elə ki, ayrılıq zamanı çatdı,
O köhnə sövdası birə on artdı.
Iş gəlib o yerə çatdı ki, birdən
Düşüb xəstələndi o nazik bədən.
Qara qızdırmaya düşdü o canan,
Dodaqlar qaysıdı bu qızdırmadan.
O sərvin balınca həvəsi düşdü,
Onun qırqovulu sərvdən düşdü.
Sünbüldən torpağa danə düşən tək,
İpək örpəyini üzə çəkərək,
Anaya sirrini açdı balası,

Dedi ki: "Başımın çoxdur bəlası.
Ana! Mən ahuya əlacın varmı?
Südlə zəhər içdim, dərman olarmı?
Köçüm yığışmışdır... neyləyim bu dəm?
Məni bərk tutma ki, köç üstündəyəm.
Mən ki, qan yeyirəm, nə mehribanlıq!
Mən ki, can üstəyəm, nə zindəganlıq!
Gizlində nə qanlar uddum, anacan!
Indi ürək dərdim aşır ağzımdan.
Canım dodağımdan çıxırsa bu dəm
Nə olar sirrimi açıb söyləsəm?
Sirrin pərdəsini götürdüyümdən,
Mən gedəsi oldum, salamat qal sən!
Qucaqla boynumu, ey mehribanım!
Amandır, boynuna düşməsin qanım!
Bədəndən ayrılıb çıxanda bu can,
Yarın hicranından öldüyüm zaman
Xoşdur niyazından nilimi çəksən!
Sürməmi dostumun-tozundan çək sən!
Başım göz yaşıyla islansın gərək!
Ciyər şamamamdan gəl ətrimi çək.
Bağla hunutumu o sarı güldən,
Ahından səpgilən kafurumu sən!
Şəhidəm, qan rəngli olsun kəfənim,
Qoy, belə bəzənsin bayramım mənim.
Məni gəlin kimi bəzəyib, yarat,
Pərdəmi saxlayan bu torpağa at!
Eşqindən didərgin düşən o bədbəxt
Ölüb getməyimi eşitdiyi vaxt
Sənə başsağlığı yetirmək üçün
Bizim bu çadıra gələcək bir gün.
Qəbrimin üstündə əyləşərək tək
O, ay axtaracaq, torpaq görəcək.
Qəbrimin üstündə əl bağlayaraq,
Göz yaşı tökəcək o yanan çıraq.
Ən əziz, ən gözəl bir dostdur mənə,
Bir yadigar qalır o məndən sənə.

Sən allah, çıxmasın sözüm yadından,
Ona alçaq gözlə baxmayın bir an.
İtirdiyin könlü onda tap, ana!
Bildiyim nağılı söylərsən ona,
Mən onu tutmuşam canımdan əziz,
Onu məndən sonra əzizləyin siz.
De ki: - Bu can çıxan köhnə saraydan
Leyli zəncirini qırdığı zaman
Eşqinlə torpağa gömdü canını,
Uçurdu ömrünün xanımanını.
O, eşqin yolunda mərdana getdi,
Aşiqlik yolunda can qurban etdi.
Sorsa: - Nə cür etdi həyata vida?.
De: - Sənin eşqinlə o getdi bada.
Nə qədər dünyada nəfəsi vardı,
Sənin qəmlərini canda saxlardı.
Sənin dərdinlə də o məhv olaraq,
O dərdi azuqə apardı ancaq.
De, - Torpaq olsa da bu gün niqabı,
Yalnız səni çalır onun rübabı.
O intizar çəkən adamlar kimi,
Sənin yolundadır gözüylə qəlbi.
Istəyir arxadan çatasan ona,
Odur ki, göz tikib sənin yoluna.
Tez gəl, intizardan Leylini qurtar!
Gəl, onun qoynunda tutgilən qərar!
Ana, bu sözləri ona yetir sən:
"Ey mənə can verən, məni öldürən!
Dünyada heç kəsdən gözləmə kömək
Bir allahdan başqa hamıdan əl çək.
Özün kimisinə göz tikdiyindən,
Yolunu azaraq uzaq düşdün sən.
Ağlın nə qədər ki, kamala doldu,
Adın zamanənin Məcnunu oldu".
Bu sözlə Leylinin doldu gözləri,
Başqa bir aləmə köçdü o pəri.
Öz gizli sirrini danışdığından,

Sövdaya can verdi dilində canan.
Qızını o halda görüncə ana
Elə bil qiyamət göründü ona.
Ağarmış başından götürüb örpək,
Saçını küləyə verdi səmən tək.
Anıb övladının qara gözünü,
Yolub saçlarını, cırdı üzünü.
Nə oxşama varsa dedi əzbərdən,
Nə saçı vardısa yoldu o birdən.
Ağladı, baxdıqca qızın boyuna,
Gözündən qan tökdü həyat suyuna.
Gah qızın üstündə sıxdı gözünü,
Gah onun alnına qoyub üzünü,
Gözünün yaşını tökdü fəğanla,
Yudu o çeşməni bu axan qanla.
Ananın naləsi göyə yüksəldi,
Fələk bu nalədən naləyə gəldi.
Andıqca gül rəngli əqiqi, bilsən,
Daşlar qana döndü novhələrindən.
Aya ulduzlardan zəncir bağladı,
Ciyər sandığında onu saxladı.
Onu novhələrlə bəzədi dili,
Gülabla ənbərə buladı gülü.
Torpağa tapşırdı Leylini bir bax,
Torpaqdan törəyən torpaq olacaq.
Qız yeni hasara düşdüyü zaman
Qəm də xilas oldu xəzinədardan[115].
Onun da həyatı qurtarıb bitdi,
Alıb baratını dünyadan getdi.
Aldığın atmayan bir insan varmı,
Dolub boşalmayan bir şey olarmı,
Dünyanın bazarı iti olsa da.
Kasadlıq çəkəcək onda piyada.
Dünya mələk donlu şeytana bənzər,
Əlində təsbeh var, belində xəncər.
İnan, bu dünyada yoxdur bir mələk
Ki, dünya açmasın başına kələk.

Çalış aldatmasın səni bu qarı,
Belini əyməsin onun rüzgarı.
Bir quyu olmamış altındakı taxt,
Burdan köçünü sür, gecikməmiş vaxt,
Bu yaşıl kamanlı çərxə qıl nəzər,
Sən üz döndərməsən, o üz döndərər.
Hələ bitirməmiş, inan ki, torpaq
Doludan bir zərər görməmiş yarpaq.
Bu ada mühiti-dərin bir quyu
Torpağı qaradır, tutğundur suyu.
Gəmini ortadan sahilə çək sən,
Bəlkə öz şəhrinə çata biləsən.
Bu torpaq can alan bir nəhəngdir, bil!
Sümüklərindən də əl çəkən deyil.
Bu sandıqça kimi fırlanan torpaq
Insanın qanına qərq olmuş ancaq.
Ağzı olmasa da qan içir hər an.
Özünə can tapır aldığı candan.
Hamını qumlayır onun ac gözü.
Ölülərdən qalmış bir qumdur özü.
Bax, bu dairədə olan naxışlar
Insan cəsədindən şəkil almışlar.
Qəlbi açıq adam fani dünyada
Yaxşılıq uğrunda can etsə fəda
Talein gözüylə o baxdığı vaxt
Tikəni gül görür, quyunu da taxt.
Yorğunluq üzündən, kədər üzündən
Ona adi gözlə baxarsa, bəzən
Varlığı qərəzlə kinə bürünər,
Ona gözəlliklər çirkin görünər.
Xüdpəsənd olmayan təmiz bir insan
Qorxmaz nə yaxşıdan, nə də yamandan.
Yalnız bu quyudan çıxmaq fikri var,
Behiştin qəsrinə yollar axtarar.
İstər ki, zəncirdən çıxsın ayağı,

Yetişsin onun da azadlıq çağı.
Qısalt hekayəni, gecə keçmişdir,
Bir iki olmasın, olsun iki bir.
O Xosrov, Keyqubad, o Cəmşid hanı?
Onlar gedən yolu gedəcək hamı.
Hiyləylə qurtarmaz quyudan heç kəs,
Bu qapı davayla bağlana bilməz.
Qocalar düşündü, çalışdı gənclər,
Olmadı düyünü açan bir nəfər.
Dünyaya yel kimi gəlib gedənlər
Fələyin işinə neyləyə bilər?
Sən açıq bir gözlə baxsan aləmə.
Özünə şəbə de, Şəbdiz söyləmə[116].
Bundan da irəli uzansa əlin,
Bil ki, unudarsan aləmi yəqin.
Nə qədər acizik bu dünyada biz,
Fələyin sirrini açmaz fikrimiz.
Rəngi gömgöy olan bu axar suyu
Qoy su aparsın ki, çay suyudur bu.
Bir damcı verməyib o öz suyundan,
Ölürdü gəlini susuzluğundan.
Leyli ki, torpağı eylədi məskən,
Xəzinə divarı oldu dəmirdən.
Ərəblər bu dərddən bağrı qan oldu,
Onun zülfü kimi pərişan oldu.
Qızın həsrətini çəkən adamlar
Ah çəkib, of deyib, ağladı zar-zar.
Dostların behişti - Leylinin qəbri,
Cənnət qoquyurdu ilk bahar kimi.
O müqəddəs qəbri öpərdi yellər,
Onu ziyarətə gələrdi ellər.

## LEYLİNİN ÖLÜMÜNDƏN MƏCNUNUN XƏBƏR TUTMASI

Bu məşhur dastanı yaradıb yazan
Yazmış səhifəyə belə bir fərman:
Ay batdı, dolanıb keçdikcə günlər,
Qəlbi qırıq Zeydə çatdı bu xəbər.
Ağlayıb könlünü açdı fəryada,
Deyin, ağlamayan varmı dünyada?
O, qara geyindi yası var kimi,
Ədalət axtaran adamlar kimi.
O qəbrin yanına yetişdi bir, bax,
Bahar buludu tək yaş axıdaraq,
Onun qan dalğalı qəbrinin üstə
Sorma nə haldaydı o qəlbi xəstə,
Sellər axıtdıqca o didəsindən,
Insanlar baş alıb qaçdı səsindən.
Ah çəkib, aləmə vəlvələ saldı,
Qəmindən fələyin üzü qaraldı.
O parlaq çıraqlı, gözəl məzarı,
Tərk edib üz qoydu çöllərə sarı.
O çırağı sönmüş qaranlıq gecə
O yoldan azmışı taparaq təkcə,
Onun qarşısında zar-zar ağladı,
O dağlanmış qəlbi yenə dağladı.
Cırıb üz-gözünü o birdən-birə,
Ah çəkib, başını vururdu yerə.
Məcnun öz dostunun baxıb rənginə,
Gördü bulud kimi tutulmuş yenə.
Dedi ki: "Qardaşım, nə olmuş, nə var?
Nədir nəfəsindən çıxan alovlar?
Nədən üz-gözünü dağıtmısan sən?
Nədən paltarını qara geymisən?"
Zeyd dedi: "Bəxtimiz gəlmişdir qara,
Işimiz çox yaman düşmüşdür dara.
Torpağın bağrından qara su çıxdı,

Ölüm qapımızın əlini sıxdı.
Dolu bağımızı döydüyü zaman
Töküldü yarpaqlar əsən ruzgardan.
O gözəllik ayı düşdü fələkdən,
Sərvimiz yıxıldı, boş qaldı çəmən.
Leyli, gözəl Leyli yerə gömüldü,
O sənin dərdinlə yaşayıb öldü".
Bu sözdən Məcnunun büküldü beli,
Sanki zəlzələdən tutuldu dili.
Ildırım vurmuş tək qaraldı haman,
Həm düşdü, həm yandı bu ildırımdan.
ëTaqətsiz yerində dayandı bir an,
Fələyə üz tutub dedi: "Ey dövran!
Nədir bu verdiyin insafsız qərar?
Bir zəifə qarşı bu qanunmu var?
Ota da ildırım yağdırarlarmı,
Bir qarışqa üçün bu zülm olarmı?!
Nə lazım ardınca min bir cəhənnəm.
Onu bir qığılcım yandırar bu dəm.
Sən cama görə də göz yaşı göndər,
Hər arzuya görə verilər sağər.
Mən bağrı yanmışın tutduğu çıraq
Bir yel silləsiylə qaralar ancaq,
Bu qılınc çəkməyin nə mənası var?
Məgər ağcaqanad əъdaha olar?"
Bütün fələklərə nifrət deyərək,
Qaçdı səhralara o vəhşilər tək.
Cırdı paltarını o min dəhşətlə,
Vəhşilər baxırdı ona heyrətlə.
Onun sellər kimi göz yaşı vardı,
Ona baxanlar da belə ağlardı.
Dalınca sürünüb Zeyd kölgə tək,
Onun kölgəsindən dilərdi kömək.
Qəlbində sızıltı, gözləri giryan.
Dağları daşları saldı ayaqdan.
Tab edə bilməyib bu intizara,
İstədi baş çəksin o dost məzara.

Zeydə: "O məzarı nişan ver" dedi.
Sonra yar qəbrində bitdi ot kimi.
O, sərxoşlar kimi başı havalı,
Özündə deyildi fikri, xəyalı.
Özü qəm yolçusu, yoldaşı ah-vay,
Rüsvaylar içində hamıdan rüsvay,
Saçları pərişan, başı dumanlı.
Yoldu saçlarını o qəm nişanlı.
O beli qırılmış şikəstə-qamət
Gecəsi bir məhşər günü qiyamət.
Uzaqdan o qərib məzarı görcək,
Düşdü torpaqlara nurdan kölgə tək.
O yerdə qıvrılıb bir ilan kimi,
Tikana sancılmış soğulcan kimi.
Xəzinə üstündə yatmış ilan tək,
O qərib türbəyə sarıldı bərk-bərk.
Gözündən lalə tək göz yaşı getdi,
Ondan ot üstündə lalələr bitdi.
Şam kimi əridib ciyər qanını,
Açdı alovlanmış qəm lisanını:
"Neyləyim, bir çarə tapmayıram mən,
Yanıb əriyirəm şam kimi dərddən.
Mənim Deyləm taclı sevgilim vardı,
Dünyada var-yoxum yalnız o yardı.
Bu Deyləm ayinli qoca şahənşah
Mizraqla yarımı apardı, eyvah!
Əlimdə tər-təzə bir gülüm vardı,
Onu da əcəlin yeli apardı.
Azadca bir sərvim vardı çəməndə,
Yıxıldı əcəlin yeli əsəndə.
Ağacda çiçəyim açıldığı vaxt
Saxlaya bilmədi o neməti baxt.
Ah, onun eşqiylə bir kiçik dəstə
Bənəfşə bitmişdi qəlbimin üstə.
Onu da bir zalım qaparaq keçdi,
Mən əkib becərdim, özgəsi biçdi.
O reyhan üzlümün xəyaliylə mən

Qaçardım dünyanın hər nemətindən.
Bir oğru pusqudan ona əl atdı,
Qırıb reyhanımı, yol üstə atdı.
O qələ gözəlim belə bir yardı,
Mənim də qulluğum belə qurtardı".
Sonra yar qəbrinə qoyub başını,
Ah deyib, axıtdı o, göz yaşını.
"Sən, ey xəzan görmüş körpəcə gülüm!
Dünyanı görməmiş ölən sevgilim!
Ey xərabə qalan baği-gülüstan,
Bar verib, barını yeməyən canan!
Torpağın zülmünə dözürsənmi sən?
Bu dərə dibində söylə necəsən?
O qara xallardan varmı bir əsər?
Söylə, nə haldadır o ahu gözlər?
Necədir yaquta bənzər dodaqlar?
Ətirli saçların necədir, ey yar?
Nəqşini çəkirlər, de, hansı rəngdən.
Şamın hansı dərdlə əriyir, de sən!
Kimin gözlərinə gülürsən, canan?
De, kimin başına ətir saçırsan?
Sərvin hansı bağda tutmuşdur qərar?
Məclisin olmuşdur hansı laləzar?
Tikanlar içində necədir halın?
Necə mağarada keçir əhvalın?
Ilan məskənidir bu mağaralar,
Sən aysan! De burda nə məqsədin var?
Qəbriyin üstündə yanıram, canan[117]!
Sənsə mağaraya həmdəm olmusan.
Sən bir xəzinəydin, uddu torpaqlar,
Xəzinə olmasan, udmazdı, ey yar,
Hansı mağarada xəzinə ki, var,
Üstündə bir ilan qıvrılıb yatar.
Mən də ilan kimi küsüb yuvamdan,
Məzarın üstündə oldum pasiban.
Qum kimi tapdandım bir zaman gerçək.
İndi sakit oldum quyuda su tək.

Qismətin ay kimi qəribliksə, bil,
Ayın qəribliyi qəribə deyil.
Sən gizli olsan da zahirdə məndən,
Canın canımdadır, ayrılmaz səndən.
Uzaq düşdünsə də gözümdən, inan,
Könlümdən uzaqda deyilsən bir an.
Ortadan qalxdısa nəqşin, surətin,
Öz yerində qalmış qəmin, möhnətin.
Səninçin könlümü yelə verdim mən,
Xatirən çıxarmı heç xatirimdən!
Qəmin yolumdadır, toz-torpaq atmış,
İstəsən oyaq ol, istəsən yatmış.
Gedir sənin rəxşin məndən iləri[118],
Çünki mən çolağam, ey gözəl pəri.
Behişt məclisinə qonaq düşübsən,
Canını qurtardın bu xərabədən.
Mən də çarə tapsam haman düyünə,
Yanına gələrəm bir neçə günə.
Qəbriyin başına dolandığımdan,
Əhdə vəfadaram hələ də, canan!
Nə zaman yanına düşsə bədənim,
Kəfənin batmasın qapıma mənim.
Yerin behişt olsun daima sənin.
Qoy allah hərəmi olsun məskənin.
Ruhiyin qəndili axıcılıqdan,
Ətrafa şölələr salsın hər zaman".
Deyib yığışdırdı əl-ayağını,
Hərlənib sındırdı öz qolbağını.
Başında bir dəstə heyvanlar yenə,
Üz qoydu öz doğma vilayətinə,
Sürüb dəvəsini yollar boyunca.
Hicran şerləri dedi doyunca...
Ayrılıq vəsfini alaraq dilə.
Vəfadan qoymadı bir kəlmə belə.
Boyadı qumları o göz yaşına,

Çırpdı öz başını çölün daşına.
Qığılcım saçmamış öz naləsindən,
Qoymadı yol üstə qalsın bir tikən.
Yollarda gördüyü bütün daşları
Boyadı al qana o göz yaşları.
Başından aşdıqca sövdalı dərdi,
Cananın qəbrini arzu edərdi.
Dağlardan sel kimi axıb gələrək,
Leylinin qəbrinə döşənərdi tək.
Başını məzara qoyub qalardı,
Torpaqdan minlərcə öpüş alardı.
Anıb o vəfalı can həmdəmini,
Məzara söylərdi könül qəmini.
O möhnət bağında tutduqca qərar,
Yanından getməzdi vəhşi heyvanlar.
Axan göz yaşları olduqca Zəmzəm,
Vəhşilər çəkmişdi ona bir hərəm.
Gözündən getməzdi onun heyvanlar,
Adam buraxmazdı yanına onlar.
Qorxaraq o vəhşi yırtıcılardan,
O yoldan keçməzdi bir nəfər insan.
Məcnun dost qəbrindən getməmiş hələ,
Məzara gəlməzdi qarınca belə.
Gündüzü bu sayaq olurdu gecə,
Ömrünü həvəslə verirdi heçə.
Neçə gün yaşadı vəhşilərlə tək,
Bu həyat ölümdən pis idi gerçək.
Gah canan qəbrinə səcdə edərdi,
Gah ceyran ardınca çölə gedərdi.
Qarışqa gözündə məskəni vardı
Qəbirdən-qəbirə addımlayardı.
Bu hicran qüvvədən saldı Məcnunu.
Nəhayət oxudu köç məktubunu...

## BATDADLI SƏLAMIN İKİNCİ DƏFƏ MƏCNUNUN GÖRÜŞÜNƏ GƏLMƏSİ

Verir bu tarixi yazan bir nəfər
Ərəb məxəzindən belə bir xəbər;
Səlam o aşiqin ziyarətinə
Gəlmək xəyalinə düşmüşdü yenə.
Qalxıb yol getməyə üz qoydu Səlam,
Bir ay dağı, daşı dolaşdı tamam
Atını hər yana sürdü bir zaman,
Axtarıb tapmadı ondan bir nişan.
Axır bir dərədə rast gəldi ona
Daşdan ayaqları qabar Məcnuna.
Halı dəyişmişdi onun büsbütün,
Tamam qol-qanadı sınmışdı o gün,
Bir neştər olduqca hər ötən tikən,
Könül yarasıyla dolmuşdu bədən.
Zavallı, Səlamı gördüyü zaman
Sordu: "Ey cavanmərd, söylə, hardansan?"
Səlam: "Mənəm - dadi, gəlmişəm xəstə,
Səninçin qalmışdır gözüm yol üstə"
Məcnun bu sözlərə qulaq verərək,
Səlamı tanıyıb qucaqladı bərk
Qovdu vəhşiləri onun yolundan,
Suyu oddan çəkdi, kölgəni nurdan...
Dedi ki: "Yenəmi zəhmət çəkmisən?
Səni ki, əvvəldə incitmişdim mən.
Mən qəm xəstəsiyəm, sənsə nazənin,
Nə məqsəd daşıyır belə gəlməyin?
Əvvəl ki, baxmadım mən sən deyənə,
Mənə söz deməkmi fikrin var yenə?
Indi ki, gəlmisən sən, ey mərd ürək!
Ayıbdır gələnə "dur qayıt" demək.
Arzunu aç, de ki, mən əməl edim,
Məqsədin nədirsə, o yolla gedim".

Səlam salamını yetirib ona,
Təşəkkür bildirib, dedi Məcnuna:
"Sənin nemətinlə dolanıram mən,
Inan ki, səcdəyə, şükrə layiqsən.
Qabaq göstərdiyin gözəl lütflər,
Mənə dövlət idi xəzinə qədər.
Çünki sinəndəki gözəl təbindən
Mənə bir xəzinə bağışladın sən.
Inci qəsidələr dediyin zaman
Əlim də, ağzım da dolardı, inan.
Yenə də gəlmişəm sən olan bağa,
Gəlmişəm bağından meyvə yığmağa.
Əgər zəhmət çəksən, qəbul edərəm,
Olmasa, yenə də razı gedərəm.
Bu dəfə nə üçün düşdün həvəsdən?
Təəccüb edirəm bu halına mən.
Söylə dərdinmi var, bunun sirri nə?
Bu il bənzəmirsən keçən ilkinə.
Görürəm, sınmışdır şadlıq qanadın,
Azalmış əvvəlki şurun, fəryadın.
Danış, öz işlərin necə haldadır?
Sevgilin necədir, nə xəyaldadır?"
Dost suallarını dinləyib həmən,
Yenə işdən düşdü incəldi bədən.
Yenə xatirinə düşdü o sənəm
Məcnun çox ağladı gözlərində nəm,
Soyuq bir ah çəkib bəlalər yedi.
"Ah, dərddən ciyərim alışdı" dedi.
Dostum! Nə deyirsən? Başqadır zaman,
Məndən sevgilimi xəbər alırsan?
Torpaq altındadır indi sevgilim,
Yox, yox, bu yalandır, qurusun dilim.
Vəfadan yoğrulmuş o gözəl mələk
Behişt qapısıdır qapısı, demək
Sevgilim öldüsə, yanır çırağı,

Mənisə öldürmüş onun bu dağı..."
Bu varaq üstünə nə sözlər saçdı
Hər söz üstündə də varaqlar açdı.
Səlamın əlindən tutub apardı,
Yenə də Leylinin qəbrinə vardı.
Dedi ki: "Bax, budur dediyim pəri,
Canımdan əl çəkdim ondan ötəri".
Səlam çox dinlədin bu nalələri.
Məcnun sevgilisiz qalandan bəri.
Novhəsi, fəryadı sinə dağladı,
Səlam da bir yanda durub ağladı.
Qanlı sular tökdü gözündən, bilsən!
Axdı qan bulağı hər kirpiyindən.
Sonra üz tutaraq xəstə Məcnuna,
Qəm yeyib, təsəlli verirdi ona:
"O behişt gülüdür mənim də qəmim.
Könül dəryasında qərq oldu gəmim.
Canım dərdə düşdü səndən ötəri,
Çünki bu ildırım çaxandan bəri
Bir üzün yandısa sənin bu oddan,
Vallah, tamam yandı məndəki bu can!"
Bu cür fəsahətlə o təmiz ürək
Aşiq yarasına duzlar səpərək,
Tamam iki-üç ay yanında qaldı,
Qəlbini oxşayıb, dərdini aldı.
Tanış olduqları on ildən bəri
Onun söylədiyi bütün beytləri:
Qitədir, qissədir, şerdir deyə,
Köçürdü hamsını bir dəftərçəyə.
Yazdı o sözləri çox sevə-sevə,
Sonra izin alıb qayıtdı evə.
Ondan aldığını nəqş edib yada,
Bir töhfə gətirib, gəldi Bağdada.

## LEYLİNİN QƏBRİ ÜZƏRİNDƏ MƏCNUNUN ÖLMƏSİ

Məşhur söz ustası, o söz Loqmanı
Böylə tamamlayır bizim dastanı:
O xırmanı yanmış alışıb söndü,
Göz yaşından olan xırmana döndü.
Insafsız fələyin əl dəyirmanı
Üyüdüb apardı haman xırmanı.
Çünki, zəif düşdü get-gedə bədən,
Daha gücsüz oldu o əvvəlkindən.
Canı ayağından dodağa çatdı,
Günü axşam olub zülmətə batdı.
Sızlayıb ahları göyə yüksəldi,
Torpaq gəlininin yanına gəldi.
O hasarlı qəbrə üz qoyub yatdı,
Gəmisi bulanıq bir suya batdı.
Xəstə qarınca tək başı fırlandı,
Yaralı ilan tək qıvrılıb yandı.
Iki-üç beyt dedi qəmlə, möhnətlə,
Iki-üç göz yaşı, tökdü həsrətlə.
Sonra da göylərə tutub üzünü,
Əl açıb o zaman yumdu gözünü:
"Ey bütün aləmi qurub xəlq edən!
Səni əzizinə and verirəm mən,
Al dərdli canımı ya pərvərdigar!
Məni sevgilimin yanına apar!
Bu canı bərklikdən özün azad et,
Apar o dünyaya könlümü şad et".
Deyib bu sözləri, baş qoydu yerə,
Qəbri qucaqladı o birdən-birə.
Cananın qəbrini öpdükdən sonra,
Dost! - deyib, canını tapşırdı ona.
Keçdi bu körpüdən axır ki, o da,
Bu yoldan keçməyən varmı dünyada?
Elə bir yoldur ki son başı ədəm,

Onun bəlasına düşəcək aləm...
Belə uçurumu olan ruzgarda,
De, kimin həyatı qalmayır darda?
Deyin, tüstülənib yandıqca ruzgar,
Onda qovrulmayan bir yaramı var?
Hər yara üstündə qəm damğası var,
Zülmün dırnağıyla didilir onlar.
Ey çolaq eşşəyi bu dəyirmənin,
Üzün kəhrəbadan sarıdır sənin.
Uzaqlaş fırlanan bu dəyirmandan,
Çıxmaz azadlığa onunla insan.
Bir evdə olduqca sel təhlükəsi,
Qalx ki, yaxınlaşır o selin səsi.
Hələ sındırmamış körpünü fələk,
Dəvəni körpüdən kənara tez çək!
Dünyanın göbəyi yellə doludur,
Yel də ki, bir heçdir, heçlik yoludur.
Yelə bağlı olan bu diriliyə
Çox da bel bağlama dirilik deyə.
Tələs ki, rahatlıq getdi dünyadan,
Çox yavaş sürmə ki, getmişdir karvan.
Qan içən bu yeddi başlı əъdaha
Dövrəndə ilandır, açılmaz daha.
Özünə bir diqqət yetirsən əgər,
Bürümüş dövrəni bu əъdahalər.
Bu qoca dünyanı zənn etmə fağır,
Qarı görünsə də, bir əъdahadır.
Bu dünya oğrudur, köçünü tez çək,
Bu cığal oyunçu daş gizlədəcək.
Gəl əyri vurma ki, sən mümkün qədər,
Əyri zərbələrin özünə dəyər.
Qorxma öz könlünü elə abadan,
Yaqut ye, zərrəcə qorxma vəbadan.
Ağalıq atından aşağıya en,
Bir zəiflik göstər acizliyindən.
Taki əcəl şiri can alsa yenə,
Baxıb rəhmi gəlsin acizliyinə.

Təkəbbürlü gəzmə, bu işdən əl çək,
Bil ki, sənin yemin deyil bu çörək.
Torpaqdan məhəbbət kəsmək gəzirsən,
Deyəcəyəm deyib, heç dinməyirsən,
Sinə düyünləyən bu qıfıl ki, var,
Qızılı xəznənin qarnında saxlar.
Qıtlıqdan istərsən ölsün bu qarı
Taki sənə qalsın ev qızılları.
Gözə görünməmiş o bir hümadır,
Gözə göründümü, bir əъdahadır.
Düşəndə məhbəsə aqil bir adam
Baxıb yol axtarar qaçmağa müdam.
Dünya məhbəsində tutmusan qərar,
Sən ki, yol bilənsən, durma, yol axtar!
Bu işin dərmanı tapılar, şəksiz,
Bu yükün cövrünü çəkməliyik biz.
Gözündə işıq var, qəlbində qüvvət,
Boş ki, yaratmamış səni təbiət.
Özünü zənn etmə zəif bir çıraq,
Bil ki, zinət alır səndən yeddi bağ,
Fələyin üstündə vilayətin var,
Himayən altında durur varlıqlar.
Səcdə edənlərin Səlcuqisən sən[119],
Bir də son vücudun mirası sənsən.
Fələk kimi olan boyuna bir bax,
Saxla qiymətini, vüqar qalacaq.
Sarılma torpağa, o, tozdur, inan!
Uyma təbiətə, od çıxır ondan,
Sən öz mərtəbəndə otursan əgər,
Bil, ucalar başın göylərə qədər.
Dağ kimi, qaçırma başını seldən,
Sillə yesən belə, üz döndərmə sən.
O nalını salan daşı al ələ,
Qaldır, öp: "Nə gözəl ləlsən" söylə.
Səninlə qaynayan sirkəni su tək,
Gözünü yumaraq içəsən gərək!
Bu yol, bir vəfayla başa vurular,

Ondan vəfa ilə qurtarmaq olar.
Çox içən adamlar bədxumar olar,
Yaxşı içənlər də xoşgüvar olar.
Axar sular kimi sən də sakit ax,
Axdığın yerlərdə xoşlansın torpaq.
Bil ki, su nohurdan içilsə əgər,
Sərin ola bilməz axar su qədər.
Varlıq dünyasıdır torpağın, gerçək,
Dünyaya pərəstiş etmə torpaq tək.
Dünya gedərgidir, dalınca getmə!
Qalmayacaq şeyə sitayiş etmə!

* * *

Məcnun ki, dünyadan heçliyə vardı,
Dünya töhmətindən canı qurtardı.
Gəlin beşiyinə qoydu özünü,
O yuxuya gedib yumdu gözünü.
Bu fani dünyada öldü möhnətdən,
Köçüb o dünyaya, qurtardı dərddən.
Torpaqlar onu da qoynuna aldı,
Bir ay, bəlkə bir il o halda qaldı.
Qəbrin dövrəsində bir böyük dəstə
Vəhşi dayanmışdı gözü yol üstə.
Şah kimi yatmışdı sarayında tək,
Vəhşilər baxırdı keşik çəkərək
O hasarlı səhni bürüyüb onlar,
Yuva düzəltmişdi orda heyvanlar.
Baxıb vəhşilərə, can qorxusundan
O qəbrin yanına gəlməzdi insan.
Uzaqdan baxanlar görərdilər ki,
Vəhşilər qaynaşır arılar təki.
Zənn edirdilər ki, o qərib xəstə
Yenə də əyləşmiş o qəbrin üstə.
Qılınc vuranlar da hər axşam, səhər
Şahın sarayına keşik çəkirlər,
Bilməyirdilər ki, şah qəbrə varmış,
Tacla kəmərini külək aparmış.
Məcnun - o canını eşqə xərc edən,
Dürrünü torpağa basdırıb gedən

Məhv oldu fələyin zəlzələsindən,
Çürüyüb torpağa qarışdı bədən,
Onun canındakı nişanələrdən
Quruca bir sümük qalmışdı, bilsən!
Vəhşi heyvanlar da gəlib bir kərə.
Yaxın durmazdılar o sümüklərə.
Nə qədər hərəmi güddü vəhşilər,
Ayaq da basmadı ora bir nəfər,
Ölünü insanlar anıb, yad edər,
Yoxdur vəhşilərdə belə bir hünər.
Bir il bu qaydayla keçdi, əlqərəz,
Dağıldı vəhşilər istər-istəməz.
Bəzisi iy alıb, üz qoydu dağa,
Bəzisi də ölüb getdi torpağa.
Xəznə tilsimini qapanda dövran,
Xəznə qıfılı da çürüdü pasdan.
Bu halı görüncə yol adamları,
Qeyidsiz gəldilər hərəmə sarı,
Gördülər ki, yatır orda bir insan,
Sümüklər qalmışdır onun canından.
Bir vəfa gözüylə seyr edib onu,
Tezcə tanıdılar kim olduğunu.
O zaman yayıldı bu səs hər yana,
Yayıldı bu xəbər Ərəbistana.
Toplaşdı qohumlar, qəlbi yananlar,
Başına dərd gəlmiş qəmgin insanlar.
Baxdıqca meyidə, nalə çəkdilər,
Şivən qopardaraq, qan yaş tökdülər.
Gövhərini saçmış o qalıb-bədən
Bir ağ sədəf kimi düşmüşdü, bilsən!
Qızılla sildilər sədəf tozunu,
Yenə də sürtdülər ənbərlə onu.
Onun mişk kimi saçları vardı,
O öz nəfəsindən ətir saçardı.
Bu məzar ağlatdı hər yaslı qəlbi,
Axdı göz yaşları yağışlar kimi.
Bu göz yaşlarıyla yuyub Məcnunu,

Torpaqdan torpağa qoydular onu.
Daxmanın yanını açıb, müxtəsər,
Leylinin yanında dəfn eylədilər.
Şahı apardılar bir meyxanəyə,
Saqiyə verdilər, sərxoşdur, deyə.
Qiyamətə qədər yatdılar rahət,
Qalxdı yollarından dərdlə məlamət.
Sağkən vermişdilər bir əhdə qərar;
Ölüb bir beşikdə qoşa yatdılar...
Zaman dolaşdıqca hər iki qəbrə
Tikdilər ordaca bir daş məqbərə.
Hüsnünə bağ-bostan həsəd aparan
O türbə səcdəgah oldu çox zaman.
Bütün xəstələrə şəfa verərdi,
Cəfadan qurtarıb səfa verərdi.
Istəyi yerinə çatmasa əgər,
Geri qayıtmazdı ordan bir nəfər
Ey allah! Aləmdən o iki insan
Ismətlə, paklıqla uçduqlarından,
Kəsmə sən onlardan öz ülfətini,
Bağışla onlara öz rəhmətini!
Bizim də növbəmiz yetişən zaman
Sən özün bilərsən, böyük yaradan!

## ZEYDİN LEYLİ VƏ MƏCNUNU YUXUDA GÖRMƏSİ

Bütün ömrü boyu dərd əhli olan
Zeydə rəhmət olsun, görüm hər zaman.
O, nur çeşmələrin məqbərəsindən
Bir an da uzağa getməzdi, bilsən!
Leyliylə Məcnunun nə vaxtdan bəri
Eşq üçün dediyi xoş qəzəlləri
Bəsirət gözüylə hafizəsindən

Arayıb, axtarıb, toplayıb bəzən,
Gəlib gedənlərə verərdi xəbər,
Afərin deyirdi qulaq verənlər.
O iki aşiqdən qalan yadigar,
Aləmə Zeyd ilə oldu aşikar.
Bir gün dostlarını anaraq yenə
Ağlayıb onların bu taleinə,
Dedi: "Nakam ölən, yazıq aşiqlər
Indi bir-birindən tuturmu xəbər?
Bəlkə yer altında kərpiç olmuşlar,
Ya behişt taxtında tutmuşlar qərar.
Nafənin başını qaşıyan gecə
Gündüzün üstünə ənbər səpincə
Zeydin yuxusuna girdi bir mələk,
Bir behişt göründü şəfəqlənərək.
Onun həyətində böylu sərvlər
Şad idi bəxtiyar könüllər qədər,
Hər gülün, çiçəyin ətəyində bağ,
Hər gül yarpağında yanar bir çıraq.
Hər çəmən qoynunda bir behişt vardı,
Yanar gözlər kimi işıqlanardı.
Zümrüdə bənzərdi o yer, dedikcə,
Parlaq görünürdü göz işlədikcə.
Əlində cam tutmuş hər növrəstə gül.
Baxıb dil açmışdı sövdalı bülbül.
Irmaqlar sim üstdə tutmuşdu qərar,
Quşlar orda min bir nəğmə oxuyar.
Güllər kölgəsində güldükcə səhər,
Bir taxt qurulmuşdu günəşə bənzər.
O taxt bəzənmişdi bir behişt qədər,
Onu bəzəmişdi ipək xəlçələr.
Orda iki mələk qoşa durmuşdu,
Nəcat dərgahında cüt oturmuşdu.
Onlar nur içində hurilər qədər
Başdan ayağadək bəzənmişdilər.

Əldə şərab vardı, könüldə bahar,
Sövdadan danışıb, deyirdi onlar.
Gah şərab edirdi onlara əsər,
Gah dodaq-dodağa öpüşürdülər.
Gah keçən sövdanı anırdı onlar,
Gah da qoşa yatıb kam alırdılar
O taxta bir qoca baş söykəyərək,
Durmuşdu onların qulluğunda tək.
Qoca, aşiqlərin başına hər an
Şabaş dağıdırdı asimanlardan.
Zeyd bu yuxunu gördüyü zaman
Soruşdu gizlicə göy qocasından:
Əlləri qədəhli bu iki nəfər,
Bu behişt bağında, de, nəçidilər?
O can mənzilində havalanmışlar.
Hardan bu məqamda tutmuşlar qərar?"
O, dilsiz qoca da ona bir təhər
Eyhamla fikrini dedi, müxtəsər:
Dedi ki: "Dost olmuş bu iki vicdan
Yoldaş yaranmışdır başdan, binadan.
Biri doğruluqda dünya şahıdır,
O biri qəlb alan qızlar mahıdır.
O dediyim ayın adı Leylidir,
Yanındakı şaha Məcnun deyilir.
Səfa sandığında bu iki nəfər
Eşq ilə yaşamış saf ləldirlər.
Rahatlıq görməyib fani dünyada,
Indi yetişmişlər yalnız murada.
Burda görməyirlər dərd-qəmdən əsər,
Daima şadlıqla ömür sürürlər.
Kim ki, o dünyada bəhrəsiz qalar.
Onun bu dunyada başı ucalar.
Kim ki, o dünyada acı qəm içər,
Ömrü bu dünyada şadlıqla keçər".
Sübhün işığıyla yanan asiman

Gecə xırmanında od vuran zaman
Zeyd öz yuxusundan ayıldı birdən,
Hamıya söz açdı bu sirrlərdən,
Kim ki, o dünyadan istəyir bir bar,
Bu dünya keyfinə o ayaq basar.
Bu aləm fanidir, quru torpaqdır,
O aləm daimi, özü də pakdır.
Doğrudur, əbədi, təmiz bir aləm
Fani bir torpaqdan yaxşıdır, desəm!
Amandır, ağlını unutma ki, sən
Gülünü tikana dəyişməyəsən!
Özün çıxarmasan mədəndən gövhər,
Gövhər axtarma ki, müftə verməzlər.
Eşqin hərəminə can ver, ey insan!
Bəlkə özlüyündən can qurtarasan.
Eşqin aləmində ox kimi süz sən,
Uzaq düşməyəsən o nişanədən.
Ox düz getdiyindən öz nişanına,
Bil ki, layiq olmuş şah kamanına.
Varlığın açarı eşq ilə insan
Qürur girdabından qurtarar, inan!
Əgər qəm şərbəti olsa da zəhər,
Eşqin əlləriylə şirin içilər.
Baxma bu şərbətin acısı çoxdur,
Saqisi eşq isə, qorxusu yoxdur.
Dözülməz olsa da bu qəm, bu zillət,
Xoşdur! Yaratmışsa onu məhəbbət.
Artıq söz dəryası axıra yetdi,
Ayıq ol ki, gəmi ədəmə getdi,
Nizami! Allaha şükür edək biz,
Mükəmməl qurtardı bu hekayəmiz.
Bağlılar açarı olsun bu dastan,
Oxuyub ağ günə çatsın hər insan.
Əsər səadətlə yetişdi sona
Uğurlu aqibət diləyək ona.

**KITABIN SONU**

Ey şah, bu dünyaya özün pənahsan,
Sən bir şah deyilsən, bəlkə min şahsan.
İkinci Cəmşidsən taxt almaqda sən,
Birinci günəşsən misilsizlikdən.
Keyqubad görkəmli Şahi-Şirvansan,
Əbülmüzəffərsən, böyük xaqansan.
Yalnız Şirvan deyil, dünya şahısan,
Ikinci Keyxosrov, ey şah Axsitan.
Sən, ey padişahlıq bürcünün sonu,
Dünya çox görməsin şah olduğunu.
Insanlıq fəxr edir adınla hər dəm,
Səndən abad olmuş bu iki aləm.
Dəniz çeşməsisən, calalın vardır,
Sənin böyüklüyün - apaşikardır.
Mübarək başını, ey fəxri-cahan,
Fələkdən yuxarı tutduğun zaman.
Şadlıqla, nəşəylə xəyalata get,
Bu gözəl dastanı mütaliə et!
Bu fikir qızının gözəlliyindən
Xəzinə aparıb, murada yet sən.
Kaş ki, bəyənəydin bu gözəl yarı,
Əhsənin olaydı ipək paltarı.
Belə bir səxavət səndən istərəm,
Məndən təvəkküldür, səndən də kərəm.
Səndəki pak könül bir də qalib baxt,
Sənə nəsihətçi olsa da hər vaxt,
Bu allah vergisi nəsihətçidən
Iki-üç söz eşit səhər çağı sən,
Gör, dünya nə qədər baş yola saldı,
Gör hansı şahlardan bu vaxta qaldı.
Dünyanı abad et sən, ey hökmüdar,
Adın bu dünyada qalsın yadigar.
Sən ki, iş bilməkdə ayıq bir şahsan,
Daha da ayıq ol, nə qədər sağsan.
Sonsuz ədalətin, səxavətin var,

Daha da çox olsa, zərərmi olar?
Bir iş dövlətinə gətirsə cəlal,
Sən həyata keçir o işi dərhal.
Şahlıq zinətinə diqqətlə baş çək,
Tük qədər bir ləkə qonmasın gərək.
Sənin bayrağına layiq bir torpaq
Idarən altında yaşayır ancaq.
Səndən uzaq olan yerləri də sən
Öz torpağın bilib, şad ol ürəkdən.
Kim ki, sevir səni, boynunu burma,
Hər bir günah üçün qılınc da vurma.
Səndən üzr istəsə hiyləgər düşmən,
Onu qov qapından, heç aldanma sən.
Qüdrətli, təmkinli, həm də sayıq ol,
Şərab içsən belə yenə ayıq ol!
Qolların iş görən olsa da hər an,
Yenə kömək istə böyük allahdan.
Öz fikrin nə qədər ayıq olsa da,
Xor baxma sən başqa fikrə dünyada.
Heç iki ürəklə girişmə hərbə,
Taki qəlp çıxmasın vurduğun zərbə.
Gah yumşaq, gah da tünd olsa bir adam,
Onun söhbətindən pəhriz tut müdam.
Kimin ki, içində iki qapı var,
O heç yaşamasa daha xoş olar.
Irəliyə addım atdığın zaman
Geri dönməyi də unutma bir an.
Iş, doqquz addımla atılsa sən bil.
On addım atmağın məsləhət deyil.
Ədalət axtaran insanlara sən
Doğru cavab göndər doğru dillərdən.
Işində sadiq ol, sözündə möhkəm,
Kim aman istəsə, olsun xatircəm.
Hər kəsi sınaqdan keçirib düz bax,
Sınaqsız olmasın o sənə küstax[121].
Heç kəsin əhdinə bel bağlama gəl,
Onun iç üzünə atmayınca əl.

Kiçik görünməsin gözünə düşman,
Böylə təmizlənir yollardan tikan.
Incisən bir sirrin açılmağından,
Danışma bilməsin onu bir insan.
Vurduğun bir şeyi çıxart kökündən,
Hörmət etdiyini gözdən salma sən.
Gecəni, gündüzü çox vermə bada
Yaxşı ad uğrunda çalış dünyada.
Şərab halalsa da mindirmə başa,
O haramzadədən uzaqda yaşa,
Meyi qaydasınca nuş edə bilsən,
Sən şərab içərsən, keflənər düşmən.
Həddini aşırıb, çox içsən əgər,
Sənə bütpərəstlik ləkəsi dəyər.
O gün ki, xoşhalsan, xeyli dayan, dur,
Pis gözlərə qarşı üzərlik yandır
Təbin şad olduğu gecələr belə
Özünə bir dua nəfəsi üflə.
Kef vaxtı özünü nəşəli saxla,
Qoy məclis qızışsın daha maraqla.
Dünyada şir kimi sən göstər vüqar,
Taki igidlikdən dəm vurmasınlar.
Bir xərabə görsən, qurmağa tələs,
Məsləhət belədir, əməyin itməz.
Gətir bu dünyanı ağlın önünə,
Tələsmə heç kəsin ölüm gününə.
Diləyin baxma ki, uzaqda qalar,
Öz bəxtin qapıdan içəri salar.
Bu sözlər, bəlkə də, bir əfsanədir,
Sənlə danışmağa bir bəhanədir.
Yoxsa, ey dünyaya sahib hökmüdar,
Səndə nəsihətə ehtiyacmı var?
Nə qədər ki, sənsən, özünsən rəhbər,
Əlindən daima yaxşılıq törər.
Yaxşı kişilərin duasına bax,
Sənə çərx altında o sədd olacaq.
Nə qədər şadlıqdır, kefdir, həvəsdir,

Sənə Nizaminin hümməti bəsdir.
Ey allah, bu şahın gül camalından
Zilləti, zəhməti gizli tut hər an!
Qapını çalarsa, fəryadına yet,
Hər yerə gedərsə, ona kömək et!
Bütün sərkərdəsi zəfərə çatsın,
Düşməni basılıb yaslara batsın!
Onun əlindəki o şahanə cam
Həyat şərbətiylə qoy dolsun müdam.
Mənə də bir qətrə versin o camdan,
Yazmışam adına bir belə dastan.
Adıyla adlansın bu dastan hər dəm,
Şahın dövlətinə olsun xoşqədəm.

## İZAHLAR

[1] Sənin tərifindir "təbarəkallah"...

**Təbarəkallah** - Nə gözəl! Nə yaxşı! Nə əcəb! Allah mübarək etsin! –deməkdir.

[2] Yeddi qız, doqquz taxt qapında sənin
Olmuşdıır daima pərdə çəkənin.

**Yeddi qız** - yeddi planetə, doqquz taxt isə doqquz fələye (göyə) işarədir. Yəni; yeddi planet və doqquz göy həmişə sənin qapında qul kimi pərdə tutur. Qədim astrologiyada göylərin yeddi qat olması iddia olunurdu. Ərş və kürsi deyilən iki məqamı da buna əlavə edib, doqquz göy, doqquz fələk yazmışdır.

[3] Axşamın qapqara, səhərin ala
Atma göyləri yaratdın tovla.

Yəni sən axşamın qara atına və səhərin ala atına fələkləri tövlə yaratdın ki, bir-birini əvəz edən gecə və gundüz dincəlmək uçün atlarını göylərdə bağlasınlar.

[4] Yeddi düyün vurdun göylərə, birdən
Yetmişi açıldı bu qüdrətindən.

Qədim Şərqdə insanlar talelərinin ulduzlara bağlı olduğuna inanır və öz səadətləri üçün planetlərin bürclər arasında hərəkətini izləyirdilər. Buna görə də Nizami: göylərdə yaratdığın yeddi düyün - yeddi planet ilə yetmiş düyün açdın, - deyir.

[5] Bir dağ çapmadısa bu "kaf' ilə "nun",
Göy adlı bir böyük Bisütun qurdun.

"**Kaf**" və "nun"un birləşməsmdən ərəbcə "kon" (ol!) gəlməsi əmələ gelir. Beytin mənası belədir: Sən (Allah) bir dəfə "ol!" deməklə dağ çapmadan fələk kimi bir Bisütun qurdun. Bisütun burada iki məna verir: 1. Göylərin sütunsuz dayanması. 2. Bisütun dağı.

[6] **Hənut** - ətirli bir göyərtidir, meyitlərin üzərinə səpirlər ki, qoxumasın.

[7] Mənəm dsrgahında bir dilsiz ehranı,
Sənin sorağında lobbeyk vuraram.

Hacılar Kəbə ziyarətinə gedərkən qurban kəsməzdən əvvəl soyunaraq, **ehram** adlanan ağ bürüncəyə bürünür vo qum üzərində qaçıb **"Ləbbeyk**" (hazıram!) deyə qışqırırlar.

[8] Libasım ətrinlə süslənər müdam,
Buyam ya dirəmnə, ya da ud olsam.

**Dirəmnə** pis qoxulu, **ud** isə yandırılarkən gözəl ətir verən bir bilkidir. Şair Allaha xatırladır ki, insanın yaxşı və pisliyinə məsul Allah özüdür. Dirəmnə və ya uda qoxu verən də odur.

9 **Qabü qövseyn** - 1. Yayın ortası ilə uclarından birinin arasındakı məsafə.2. Dini rəvayətə görə, Məhəmməd peyğəmbərin merac zamanı Allaha guya yayın ortası ilə uclarından biri arasındakı masəfə qədər yaxın olması.

10 Altı-yeddi min il keçir o andan
Ki, bu dəbdəboni eşitmiş çahan.

Dini əfsanələrə görə, Məhəmməd bəşərin ilk xilqət günündə, hətta Adəmdən belə qabaq yaranmışdır. Adəm onun nurundan ruhlanmışdır. Beytdə də bu əfsanəyə işarə edilir.

11 Bu beş vaxt namazdır əsli tovbənin,
Beş növbə təblidir qapında sənin.

Adət üzrə padşahların sarayında gündə beş dəfə təbil vurulardı; islam dinində isə hər bir müsəlmanın gündə beş dəfə üzünü Kəbəyə tutub namaz qılması vacibdir. Şair Məhəmmədi padşaha və beş vaxt namazı oyun sarayında vurulan beş növbə təbilə oxşadır.

12 Bu evə yeddi səqf yaratdın yenə,
Tapşırdın onu da dörd xəlifənə.

**Dörd xəlifə** - Əbu Bəkr, Ömər, Osman və Əliyə işarədir.

13 Siddiq sədaqətə olmuşdur rəhbər,
Faruqi fərqdən uzaq bildilər.

**Siddiq** - birinci islam xəlifesi Əbu Bəkrin ləqəbidir.

**Faruq** - ikinci islam xəlifəsi Ömərə işarədir ki, o Haqqı batildon fərqləndirməmişdir.

14 O, Allahdan qorxan həyalı qoca...

Məhəmmədin canişinlərindən olan III xəlifə Osman ibn Əffan nəzərdə tutulur.

15 Yeddi xəzinəni açaraq bir dəm,
Dörd gövhər üstünə basmısan qədəm.

**Yeddi xəzinə** - yeddi göyə işarədir. **Dörd gövhər** - dörd ünsür: su, torpaq, od və hava deməkdir.

16 **Ümmi-Hani** - Faxtə Əbutalib qızı dördüncü xəlifə Əlinin bacısıdır.
Merac əfsanəsini uyduranlar Məhəmmədin Ümmi Haninin evindən göylər səyahətinə aparıldığını rəvayət edirlər.

17 **Ütarid** - Merkuri planeti.

18 **Zöhrə** - Venera planeti, qədim pocziyada fəza çalğıçısı timsalıdır.

19 **Mərrix** - Mars plancti.

20 **Müştəri** - Yupiter planeti.

21 **Keyvan** - Zühəl planeti.

[22] Qədr gecəsidir bu gecə, tələs...

**Qədr gecəsi** - orucluq ayı olan Ramazanın 21, 23 və 27-ci gecələri dualarını Allah dorgahında müstəcəb (qəbul) olacağı gecələrdir. Bunlar, eyni zamanda əhya (dirilmo) gecələri adlanır.

[23] **Buraq** - Məhəmməd peyğəmbərin merac gecəsi mindiyi, başı insana oxşayıb qanadları olan atdır.

[24] Qalxanda göylərin yeddi qatına,
Nə pərçəm, nə də bir tac qurdun ona.

Yəni göylərin yeddi qatına qalxarkən həm fələyin pərçəmini (bayrağını - Günəşi), həm də onun tacını (Ayı) qurdun.

[25] **Cəbrayıl** - dini rəvayətə görə, mələklərdən biri. Allahın qasidi kimi təsvir olunur."

[26] **Mikayıl** - Allaha yaxın olan mələklərdən biri. Ona ruzu mələyi də deyirlər.

[27] **İsrafil** - dini əfsanələrdə adları çəkilən dörd mələkdən biridir. Guya onun vəzifəsi həyatın yaranması və məhv olması barədə şeypur çalmaqla dünyanı xəbərdar etməkdir.

[28] **Rəfrəf** - Məhəmmədin göylərə merac etməsi əfsanəsində onun mindiyi ikinci xəyali atdır. Bəziləri onu bulud, nur saçağı və sair təsəvvür edir.

[29] **Sidrə** (**Sidrətül-müntəha**) - göylərin yeddinci qatında olan əfsanəvi ağac adıdır.

[30] **Sübbuh** - yüksək tərif və sitayişə layiq olan.

[31] **Nübüvvət** - peyğəmbərlik.

[32] İki vəfasızın əhdini bir et,
Bu dörd ayaqlını özün əlbir et.

İki vəfasız - gecə-gündüz, dörd ayaqlı isə - dord ünsürə işarədir.

[33] **Nafə** - xüsusi cinsdən olan ahunun göbəyindəki müşk vəzisi.

[34] Biz kimik, nəçiyik, aç göstor artıq,
Büt qayıranmıyıq, büt qıranmıyıq?

İslam dininin dünya və insan haqqındakı ehkamıyla kifayətlənməyən şair, Məhəmmədə müraciətlə, insanları varlığın gizli sırləri ilə tanış etməsini tələb edir ki, bəlkə hər insan nə üçün yarandığnı, niyə yaşadığını başa düşsün. Öz işlərinin əsl mahiyyətini, büt qayırdığını, yoxsa büt qırdığını bilsin.

[35] Mən bütün bədənə yem verən zaman,
Öz ciyərparam da pay alar ondan.

Yəni mən öz sözlərimi bütün xalqa deyirəm, qoy oğlum da ondan özünə bir pay götürsün.

[36] Musa gövhər tapdı xəzinələrdə,
Qarun da boğuldu ləli-gövhərdə.

**Musa** - Yəhudilərin peyğəmbəri. Guya Allah tərəfindən ilk müqəddəs kitab - Tövrat ona nazil olmuşdur. **Qarun** - dini əfsanələrə gürə, Musa peyğəmbərin zamanında yaşayan çox varlı və xəsis bir adam olmuşdur. Musanın qarğışı nəticəsində öz xəzinələrilə birlikdə yerə batmışdır.

[37] **Barbad** - Sasani hökmdarlarından Xosrov-Pərvizin sarayında məşhur müğənni və çalğıçı olmuşdur. Nizami "Xosrov və Şirin" poemasında Barbəddən və onun sənətindən geniş bəhs etmişdir.

[38] Hər sadə damcının əsil cövhəri
Dəryaya meyl edir əzəldən bəri.

Yəni gördüyünüz hər zərrə küllün, hər sadə mürəkkəbin uzvüdür. Qətrə ilə dəniz arasında maddi bir vəhdət vardır ki, onu pozmaq mümkün deyildir. Çünki hər qətrə böyük dənizlərin cüzidir. Ona görə də hər qətrə dənizə, hər cüz küllə qovuşmağa meyl edir.

[39] Bir qara pul olsun, bir arpa əgər,
Onda dörd gövhərdən tapılar əsər.

Yəni hər bir kiçik maddənin tərkibi dörd ünsürün (torpaq, od, su, hava) birləşməsindən əmələ gəlmişdir.

[40] **Keyqubad** - İran tarixində Kəyan sülaləsinin qüdrətli padşahı hesab edilir.

[41] Sənətin ziddinə söz danışanlar
Əyri pərdə kimi yanlış çalarlar.

Yəni həqiqəti, insanların əsl arzularını tərənnüm etməyi bacarmayan hər şair pərdəsi düz olmayan sazlar kimi havanı pozar və ahənglərdə baş-ayaq vurar.

[42] Bu fala mən qürə atdığım anda,
Ulduzlar keçirmiş eyni zamanda.

**Qürə** - bəxt yoxlamaq, bir şeyi ürəkdə tutmaq; ulduzların keçməsi isə taleyin arzuya uyğun gəlməsinə işarədir. Yəni mən bu arzuda olarkən (bu falı tutarkən) tale ulduzu da ona müvafiq gəldi. Qədim Şərq astrologiyasına görə, guya hər insanın taleyi ulduzlardan birinə bağlı imiş və bu planetlərin bürclər arasında hərəkətilə insanların həyatında yeni-yeni hadisələr baş verirmiş.

[43] Qüdrətin böyükdür, ona-on yarat,
Onda beş verməyi birdəfəlik at!

**Ona on**-saf qızıl, **onda beş** isə qatışıq qızıl mənasındadır. Yəni yazdıqların saf qızıl kimi bakir və qiymətli olsun, zəif misralar yazma!

[44] Dedi: "Ey kəlamı əkizim ala..."

Şairin oğlu Məhəmməd atasının yaratdığı əsəri özünə qardaş bilir, öz əkizi adlandırır.

[45] Bəhrin suyu yüngül, özü axardır,
Canlı, nəfəs alaıı balığı vardır.

Şair birinci misrada **bəhr** kəlməsini iki mənada işlətmişdir. Birinci mənada poemasının vəzni, ikinci mənada dəniz nəzərdə tutulur.

Yəni poemanın vəzni **bəhri-xəfif** həm yüngül, həm də axıcıdır. **Bəhrin** (dənizin, əsərin) balığı olan sözlər isə diridir, canlıdır.

46 S. F. D. ili idi, rəcəbin sonu.

Ərəblərdəki say sistemində (əbcəd hesabı) uç nöqtəli S hərfi - 500, F hərfi - 80, D hərfi isə 4-ə bərabərdir. Nizami "SDF" hərfləri ilə "Leyli və Məcnun" poemasının yazıldığı tarixi göstərmişdir ki, bu da hicri 584-cü ilə, miladi 1188-ci ilə təsadüf edir.

47 Bu Bəhram nəsəbli, ülkər üzlü sən...

Burada **Bəhram** sözü həm Marsın farsca adıdır, həm də Sasani şahları sülaləsinin on dörduncü padşahı Bəhram Gura işarədir.

48 Bu yeddi örtüklü, altı barmaqlı,
Bir gözlü, dörd əlli, doqquz ayaqlı.

Bu beytdə kainatın təsviri verilir: **yeddi örtük** - yeddi fələk, **altı barmaq** - altı tərəf: şərq, qərb, şimal, cənub, aşağı və yuxarı, **bir goz** – Günəş, dörd əl - dörd ünsür: od, su, torpaq və hava, **doqquz ayaq** - doqquz goy mənasında verilmişdir.

49 Onun qapısında mehtərdir Qeysər,
Fəğfur o qapıda gəlib dilənor.

**Qeysər** - qədim Rum padşalılarının, **Fəğfur** isə qədim Çin padşahlarının ləqəbidir.

50 Uçarmış Arəşin oxu, deyirlər,
Ad qəbiləsinin nizəsi qədər.

**Arəş** - İranın məşhur mifik pəhləvanlarından biridir. Əfsanələrə görə, Arəşin atdığı ox qırx mənzil yol gedərmiş.

**Adilər** - **Ad qovmu** - ərəb qəbilələrindəı olub, öz başçılan ibn Hövs adı ilə adlanmışlar.

51 **Zubin** - nizəyə oxşar bir silahdır.

52 Altı hərfı olan adıyla, bilsən,
Dünyanı bağlamış altı tərəfdən.

Yəni Axsitanın altı hərfdən ibarət olan adı dünyanın altı tərəfini nərdtaxtanın altı xanəsi kimi bağlamışdır.

53 Mahmudun fılindən qüvvətli olar.

**Mahmudun (Sultan Mahmud) fili** öz böyüklüyü və gücü ilə Şərq əfsanələrində məşhurdur. Yəni: sənin ehsanın milçəyi böyük qüvvət sahibi edər.

54 Yarəb, mən ki Üveys adını aldım,
Məhəmməd adına mən sadiq qaldım.

**Üveys** sözünün bir mənası bəxşiş verən, ikinci mənası canavar (qurd) deməkdir. Beytin mənası: mən nə cür adlansam da Məhəmmədə sadiqəm.

55 Onun atasını görə bilməsən,
Barı qardaşına hörmət saxla sən.

Yəni: əsərin atası, müsllifi olan Nizamini görməsən, onun (əsərin) qardaşına - Nizaminin oğlu Məhəmmədə hörmət et!

56 Mən ki ayna kimi dəmir deyiləm.

Qədim zamanlarda dəmirə seyqəl verməklə ayna düzəldərdilər.

57 Çərşənbə cinlisi ağıllı olmaz.

Çərşənbə cinlisi ağıllanmaz məsəli Şərqdə məşhurdıır. Dini əfsanələrdə çərşənbə cinlər günü adlandığından, o gün dəli olanların sağalması qeyri-mümkün hcsab olunur.

58 Gözəl üzərliklə bəslənib gülər.

Üzərlik çöl bitkilərindən biridir. Əfsanəyə görə, üzərlik insanı bədnəzərdən saxlayır. Ona görə də qadınlar öz uşaqlarını həmişə üzərlik tüstüsunə verirlər ki, bədnəzər onlara təsir etməsin və həmişə gözəl qalsınlar.

59 İlyasmi "olf'ini "lam"mdan kəssən,
Yenə doxsan doqquz tamı görərsən.

Yəni: İlyas adının "əlif' hərflərini alsan və onun "1" (1) hərfindən də bir "əlif' yəni, bir rəqəmi çıxsan, iyirmi doqquz rəqəmi almar. Xiİsusi say sistemi olan əbcəd hesabına görə "1" hərfi 30-dur, birini çıxanda 29 qalar, "y" hərfi 10 və "s" horfı 60-dır. Cəmi 29+10+60=99.

60 Əbməd ki rəhbəri oldu ərəbi,
Gördü cəfasmı Əbüləhəbin.

**Əhməd** - Məhəmməd peyğəmbər, **Əbüləhəb** - onın peyğəmbərliyini qəbul etməyən, onun ziddinə gedən ərəbdir.

61 Dürrümü çəkmədim özgə suyuna...

Yəni incimi başqasının suyunda yumadım, heç kesin pisliyini istəmədim.

62 Söz mənim oduma nal atmışdır, nal!

**Oda nal salmaq** bir adamın gəlməsini arzulamağın falıdır. Hər kəs öz müsafirinin tez qayıtmasını istəsəydi oda nal atardı. Söz mənim oduma nal atmış, yəni: şeir məni öz tərəfinə çağırr.

63 Xurma yoldaşlıqla şirə yaradar.

Yəni: tək xurma ağacı bar verməz, yalnız bir neçə ağac bir yerdə olarsa onlardan məhsul almaq olar. Nizaminin bu fikrini müasir elra təsdiq edir. Bir ağacın bar vermesi üçün ondakı dişi çiçəklərin başqa ağacdakı erkek çiçəklərin tozu ilə mayalanması mütləq lazımdır. Hom də burada məcazi məna vardır.

64 Hörümçək torudur o, açıq-aşkar,
Gah yara bağlayar, gah da qanadar.

**Hörümçək torunun** qan axıtması məlumdur; milçəklər və başqa kiçik heyvanlar ona ilişib qalar və hörümçək onların qanını sorar, yenə hörümçək torunu qanı axan yaranın üstünə basmaqla yaranın qanını kəsər. Beləliklə, hörümçək

toru həm qan axıdan, həm də qanı saxlayandır.

65 Gül kimi xəzina payladı o da.

Qızılgül solanda **pərəkləri** pul kimi səpələnər. Şair Məcnunun atasının xəzinə paylamasını qızılgülün xəzan olmasına oxşadır.

60 Düzüldü bənövşə, lalə başına...

Yəni onun bənövşə rəngli teli lalə yanaqlarının ətrafına düzüldü.

61 Sanki qara qarğa tutmuşdu çıraq.

Leylinin qara saçları ilə əhatə olumnuş üzünə işarədir.

62 Zülfü də "leyl" idi, adı da Leyli.

"Leyl" ərəbcə gecə (qara) mənası verir. Yəni: zülfü gecə kimi qara, adı da Leyli idi.

69 Doğardı Şərqin də Yusif üzlüsü.

Yəni Şərqin Yusifı (gözəli) - Günəş doğardı.

70 Tuluqlar yırtıldı, yıxıldı eşşək.

**Eşşək yıxıldı, tuluq yırtıld**ı məsəli məşhurdur. Yəni sirr açıldı, aləm bildi.

71 Bağdad ellərinin qanunu - Məcnun.

Yəni Məcnun Bağdad çalğıçılarının qanunu (çalğı alətidir) kimi daima səslənməkdə, sızıldamaqdadır.

72 Yadlardan yetməsin deyə bədnəzər,
Üzüm dövrəsinə nil da çəkərlər.

Keçmişdə kiçik yaşlı uşaqları bədnəzərdan qorumaq üçün boyaqxana küpünün dövrəsinə dolandırar, üzlərinə nil (qara rəng) çəkərdilər.

73 Küsufun gözündən günəş qorxaraq,
Üzünə salmışdır qara bir duvaq.
Xəzinə üstünü örtməsə əgər,
Onu bu insanlar tez qarət edər.

**Küsuf**- Güneşin tutulmasıdır.

Yəni onun saçı və saqqalı uzanaraq, üzünün ətrafını tutmuş və Gün kimi camalını qara bir dairə içərisinə almışdı.

74 Leyli çəng tutmuşdu bağrı başında,
Məcnun rübab kimi əli qaşında.

Yəni Leyli saçlarını çəng (çalğı alətidir) kimi bağrına basmışdı, Məcnun isə rübab (yenə çalğı alətidir) kimi ikiqat olub əlini alnına qoymuşdu. Burada hər iki çalğı alətinin quruluşu nəzərdə tutulur.

75 Leyli giil saçırdı ağaclara, bax,
Məcnun diirr səpirdi şabaş olaraq.

Yəni Leyli ağacların arasından boylanır və onun üzü gül kimi ağacların budağını bazəyirdi, Məcnun isə inciyə oxşar goz yaşını şabaş edirdi.

76 Divamə bir mənəm, gizli deyildir,
Bos sənin boynunda nədir o zəncir?

Yəni divanə mənəm, zəncirlənməli mənəm, zəncir kimi höruklərin nə üçün sənin boynundan asılmışdır? Sən o zənciri-zülfünü mənim boynuma şal!

[77] **İrhəm-türhəm (ərhəm-türhəm**) - ərəbcə "rəhm et, sənə də rəhm etsinlər" deməkdir. Yəni, sən aciz insanların əlindən yapış ki, çətin gündə başqaları da sənə əl tutsunlar.

Qatlandı dizlorim qoşa, "lam" kimi,
"Yey" kimi bukmüşəm öz əllərimi.

Ərəb əlifbasında "ü " (1) çəngəl şəklində yazılır və "lam" adlanır, "^" (y) hərfı isə qarmaq şəklində yazılır, "yey" adlanır.

Məcnun deyir ki, mən dərd əlindən dizlərimi iki "lanv' kimi qatlamışam, qollarımı isə iki "yey" kimi bükmüşəm və bunların birləşməsindən sevgilimin adı, yəni "Leyli" əmələ gəlmişdir.

Qum kimi səpdi o qum rənglilərə.

**Qum rənglilər** sozündə ərəblər nəzərdə tutulur.

[80] **Zəmzəm** – Məkkədə bir su quyusuna verilən addır. Əfsanələrə görə,

İbrahimxəlil peyğəmbər zamanında, yəni eramızdan təqribən 2800 il qabaqqazılmışdır.

[81] Əqrəb çalmışlara verilsə gərfəs...

**Gərfəz, gərəvüz** - səbziyat qismindəndir. El arasında kərəvüzün əqrəb çalmış adama verilməsi zərərli sayılır.

[82] Hindli fil başına döyər hər yerdə
Ki, fil Hindistanı anmasın bir də.

Adət üzrə fılbanlar fili sürərkən toppuzla onun başına vurarlar. Nizami bunu belə izah edir ki, filbanlar filin başına onun yeriməsi üçün deyil, onu gicəllətmək üçün döyurlər ki, meşələrə qaçmasın.

[83] Kölgə özbaşına düşməz quyuya,
Göydə dayanmamış Ay duya-duya.

Yəni həyal və kainatın xüsusi bir qanunu vardır, heç şey öz başına hərəkət etmir.

[84] Su səpdi gülunün yaqut rənginə.

Yəni o ağlayaraq, alışıb-yanan yaqut rongli yanaqlarının oduna göz yaşları ilə su çilədi.

[85] Sədəfə dürr kimi girdi o nigar.

Yəni inci sədəfdə gizlənən kimi Leyli də çadırda gizləndi.

[86] **Qarurə** - şüşə, sənək.

[87] **Xəyzəran** - bambuq ağacı.

[88] Bax, Çinin aynası parladı Çindən,
Həbəşin qaşları çatıldı birdən.

Yəni **Çinin aynası (Günəş**) Çindən (Şərqdən) baş qadırarkən **Həbəşin** (qaranlığın) qaşları çatıldı. Günəş parladı, qaranlıq çəkildi.

[89] Gecənin yolçusu yetişdi haman
Bir Yusif camalı aldı quyudan.

Yəni gecənin yolçusu olan ulduzlar quyunun başına çataraq, oradan bir Yusif camallı gözəli (Ayı) çıxarıb öz sıralarına qatdı. Əfsanəyə görə, Yusifi qardaşları quyuya saldıqdan sonra bir karvan oraya yetişib quyudan su çıxarmaq istədikdə Yusifi tapmış və özlərilə bərabər Misrə aparıb orada qul adına satmışlar. Beytdə ulduzlar yolçuya, Ay Yusifə, qaranlıq üfüq isə quyuya təşbih olunur.

[90] Ulduzlar içində o parladı tək,
Göy Misri Nil kimi coşmuşdu, gerçək.

Yəni Ay ulduzların içində parlayarkən göy Misrinin bazan Nil çayı kimi coşdu. Yəni misirlilər Yusifın camalından vəcdə gəlib onu almağa cəhd etdiyi kimi, ulduzlar da Ayı araya almaq uçün Nil çayı kimi coşub həyəcana gəldi.

[91] Saleh bir quş idi o yazıq qarğa,
Salehilər kimi geymişdi qara.

**Saleh** - peyğəmbərlərdən birinin adı və ərəbcə xeyirxah mənasındadır. Əfsanələrə görə, Salehin bir dəvəsi var imiş ki, peyğəmbərin bütun gücü də ondaymış. Düşmənləri bu dəvəni öldürdükdon sonra Salehin tərəfdarları qara geyinib matəm saxlamışdı. Şair qarğanı xeyirxahlıqda Salehə, sakitlikdə onun dəvəsinə və qaralıqda matem libası geymiş salehçilərə oxşadır.

[92] Mən İsmayıl kimi saxlaram ədəb,
İncisəm, qoy olum İsmayılməzhəb.

**İsmayil** İbrahim peyğəmbərin oğlu idi, dini əfsanələrə görə, atası onu qurban kəsmək istədikdə, o, bu təklifı razılıqla qəbul etmişdi. Məcnun dəxi sevgilisinə deyir ki, sən mənim başımı kəssən də (İsmayıl kimi), ədəb gözləyib etiraz etmərəm. Əgər belə etməyib səndən incisəm İsmayılməzhəb olum.

**İsmayılməzhəb** - VIII əsrdən başlayaraq, müsəlman şərqində geniş surətdə yayılmış İsmaililər təriqətinə mənsub olanlara deyilirdi. Sonralar ismaililərin həşşatilər, əsasiyyun, Fatimiyyun adlanan qolları əmələ gəlmiş, bir sıra gizli sui-qəsd qruplar təşkil edib İran-Səlcuq hökmdarlarına qarşı mübarizə aparmışlar. Başçıları iflas etmiş zadəganlardan ibarət olan bu təriqət, yoxsul kəndli və sənətkar kütlələrindən öz məqsədləri üçüıı geniş istifadə etmiş və bərabərlik şüarını öz siyasi görüşlərində irəli sürmüşlər.

[93] Nərgizlə suvardı qız ərğəvanı.

Yəni **Qızın nərgiz** (çiçək adıdır) gözündən axan yaşı onun ərğəvan (qırmızı) yanaqlarını islatdı.

[94] Atlardan "ərəbi", "bəxti", "təkavər"...

**"Bəxti", "ərəbi", "təkavər"** - hər üçü at cinsləridir.

[95] Ləli od verirdi, bulağı da su.

Yəni dodaqlarından od qalxırdı. gözlərindən isə yaş axırdi; Yenicə Ay görmüş başı zədəli.

Yəni yeni Ay görmüş dəli. Dəlinin Ay gördükdə coşması məşhur bir misaldır.

[97] **Müğilan** - dəvətikanı.

[98] Zənci yuyunmaqla çinli olmadı.

Yəni qara yuyunmaqla ağarmadı.

[99] Bir küncə qısılıb qaldı o baxtsız,
Bircə dörd künclünu gözlədi yalnız.

Yəni bir küncə qısılıb **dörd künclü** qəbrin (ölümün) yolunu gözlədi.

[100]**Tuşə**- azuqə.

[101] Xəzinəni atıb, kim yesə torpaq,
O, ağıllı deyil, ilandır ancaq.

Yeni: xəzinənİ saxlayıb torpaq yeyənlər ağıllı adam olmayıb, ilandırlar. Əfsanəyə gorə, ilan xəzinə üzərində yatır, gündə bir toz qədər torpaq yeyir.

[102] Axır libasıma göz qaram hər dəm.

Yeni gozümün qarası hər an göz yaşımla birlikdə libasıma axır.

[113] **Lahövlə vəla (qüvvətə illa billah**) - Allahdan başqa heç kəsdə qüdrət yoxdur.

[104] **Fərqəd** - Şimal qütbünə yaxın olan iki kiçik və parlaq ulduzdan biridir.

[105] **Pərvin (yaxud Sürəyya**) - səmada boyunbağıya oxşar ulduz toplusu. Sonrakı beytlərdə də bürclərin və ulduzların vəziyyəti göstərilir.

[106] "Yetim süfrəsinə" xeyirxahlartək
Qüfr tullamışdı altı pay çörək.

Yəni **Qüfr** (Ay mənzillərindəndir) səxavəti adamlar kimi "yetimlər süfrəsi"nə altı çörək salmışdı. "**Yetimlər süfrəsi**" ulduzlar qrupudur ki, onda altı ulduz vardır. Şair bu ulduzları kökəyə (qoğala) oxşadır.

[107] Səhər çağının da Qurd nəfəsi var.

Yəni səhərin soyuq nəfəsi, nəsimi vardır. Qurd nəfəsi eyni zamanda səhər görünən ulduz adıdır.

[108] Boyu "əlif' kimi: ağzı "mim" kimi,
Qıvrılmışdı saçı onun "cim" kimi.
Deyirdi: - Adımdır mənim də bu "cam",
Dünyanı göstərir özündə bu cam.

"Əlif (I) hərfı ərəb əlifbasında düz, şaquli, "raim" ağzı düyməli, "cim" isə qıvrım yazılır. Şair gözəlin saçım "cim"ə, qəddini "əliP'ə, ağzım "mim"ə oxşadır və onların birləşməsindən "cam" (? ) əraələ gəldiyini söyləyir.

[109] Dörd atdan piyada qalsan sən əgər,
Bu düyün o zaman açıla bilər.

Dörd at sözünə iki məna vermək olar, birinci dörd ünsür, (su, torpaq, od, hava), ikinci isə dörd həyati zovq (yemək, içmək, ehtirası təmin, yuxu).

Beytin məzmunu ikinci mənaya daha yaxındır. Yəni əgər sən dünyanın əsas ləzzətlərindən əl çəksən, bütün düyünləri aça bilərsən.

[110] Möhrəsiz və gözsüz oyun çıxardar,
Ayaqsız, miniksiz çapmağımız var.

Yəni aşıqsız vo taxtasız nərd və şahmat oynayır, ayağı və atı olmadan minib çapırıq.

[111] Əmr-As (Əmr İbn As) - Böyük xəlifələr zamanı dördüncü xəlifə Əlinin əleyhinə olub, Müaviyəni xəlifəliyə layiq bilən hiyləgər diplomat.

[112] Tüküm dilə dondü, dilim də tükə.
Yəni tüklərim dilə gəldi, dilləndi, dilim isə tük kimi incaldi.

[113] "Lam əlifla" ki, bax, ayrı deyildir.

"Lam əlifla" ərəbco iki hərfin "1" ve "a" hərflərinin birləşməsindən əmələ gəlir və lüğəvi mənası "yox" deməkdir. Misranın mənası odur ki, mən "Ia" kimi "yox" olsam da, bu yoxluq "lam" ilə "əlİf'in, yeni səninlə mənini birləşməyimin nəticəsidir.

[114] **Təmuz**- iyul ayı.

[115] Qəm də xilas oldu xəzinədardan.

Yəni qəm onu öz ürəyində həbs edən, onun xəzinədarı olandan xilas oldu. Yəni Leyli vəfat etdi və qəm də onun sinəsindən uçub getdi.

[116] Özünə şəbə de, Şəbdiz söyləmə.

Yeni qara olsan da **Şəbdiz** (qara at, Şirinin məşhur atının adı) deyilsən, kiçik bir şəbəsən (qara muncuqsan.)

[117] Qismətin Ay kimi qəribliksə, bil.

Qədim astrologiyada Ayın hər ayda bir bürcdən və hər gün burcün bir dişciyindən çıxması rəvayət olunurdu. Beləliklə də, iki gün bir yerdə dayanmayan Ay qəriblik timsalı kimi tərənnüm edilmişdir.

[118] Gedir sənin Rəxşin mendən irəli.

Yəni sənin atın məndsn qabaqda gedir, sən tez öldun, vüsal mənzilinə məndən tez çatdın. Rəxş – məşhur Rüstəm Zalın atının adıdır.

[119] Səcdə edənlərin Səlcuqisən sən.

**Səlcuq** - səlcuqilər sülaləsinin banisidir. Burada səcdə edənlərin pənahı, pərəstişgahı mənasında işlənmişdir.

[120] O nalını salan daşı al ələ,
Qaldır öp, "Nə gözəl ləlsən" söylə.

Yəni ayağına toxunan daşı öp, gözünün üstünə qoy və gözəl ləl adlandır. Pisliyə qarşı yaxşılıq et.

[121] **Küstax** - kobud, dikbaş, qorxmaz, ədəbsiz.

## KİTABIN İÇİNDƏKİLƏR

| | |
|---|---|
| Buraxılışa məsul: | *Əziz Gübliyev* |
| Texniki redaktorlar: | *Rauf Cəprov* |
| | *Rövşən Ağayev* |
| Tərtibatçı-rəssamı: | *Nərğiz Əliyeva* |
| Kompyuter səhifələyicisi: | *Alianna Duxanina* |
| Kompyuter yığıcıları : | *Bəsti Cəfərova* |
| | *Aygün Məmmədova* |
| Korrektorlar: | *Elmira Teymurova* |
| | *Aysel Qarayeva* |

Yığılmağa verilmişdir 28.04.2004. Çapa imzalanmışdır 10.11.2004. Formatı 60x90 l/16,
Fiziki çap vərəqi 8. Ofset çap üsulu. Tirajı 25000. Sifariş 158.
Kitab "Şərq-Qərb" mətbəəsində çap olunmuşdur. Bakı, Aşıq Ələsgər küç., 17.

000001